12.05.2012-ci il
Orta məktəbi bitir-
məyimizin - 1957-2012-
-ci il - 55 illik yubiley-
İlyasov E.A.

# MƏZUNLAR

«Elm və təhsil»
Bakı - 2012

# Məzunlar

**Şəki şəhəri 10 saylı orta məktəbin 1957-ci il məzunlarına həsr olunur**



Tərtib edəni: **Akif Əli**

Məsləhətçilər: **Raqub Bəşirov**
**Nemət Hacıyev**

**Məzunlar. Bakı, "Elm və təhsil", 2012, 356 səh.**

**ISBN 978-9952-8176-4-5**



**Əziz oxucu!**

Bu kitab doğma vətənimizin füsunkar guşələrindən biri, gözəl təbiəti, istedadlı sənətkarları, ipək xasiyyətli insanları və duzlu-məzəli yumoru ilə bütün dünyada məşhur olan gözəl Şəkinin yetirdiyi dəyərli insanlar haqqındadır. O insanlar ki, burada doğulub boya-başa çatıblar, burada 1-ci sinifə gedib orta məktəbi bitiriblər, kamal attestatı alıb ürəklərində xoş niyyətlə, şirin xəyallarla pərvazlanıb arzularının arxasınca uçublar. Kimisi Azərbaycanda, kimisi bütün Qafqazda, kimisi də daha geniş bölgələrdə öz bacarıq, istedad və zəhmətsevərliyi ilə ad-san qazanıb şöhrətə çatıb...

Və sonra... Sonra zaman-zaman onların hər biri yenidən buraya, doğma Şəkiyə qayıdıb. Qayıdıb ki, onu yetirən ana təbiətə, bərəkətli torpağa, elə, obaya, məktəbə, müəllimlərə keçdikləri həyat yolu barədə danışsın, hesabat versin, xeyir-duasını alsın. Bu təbiətə, bu torpağa, bu şəhərə, nəhayət, dərs aldıqları məktəbə və əziz müəllimlərə onların öyrətdiyi kimi yaşadıqlarını, onların adına layiq şərəfli ömür sürdüklərini, doğma Şəkinin adını hər yerdə uca tutduqlarını bildirsin. Özlərindən sonra gələn gənc nəsilə də bütün bunları örnək timsalı nümunə göstərsin...

Odur ki, Siz bu kitabı vərəqlədikcə neçə-neçə maraqlı insanla, onların ömür yolu, bioqrafiyası, işgüzar fəaliyyəti ilə yaxından tanış olacaqsınız. Görəcəksiniz ki, Şəkidəki bir təhsil ocağından nur alan ən müxtəlif insanlar sonradan həmin işıq payını neçə-neçə ocağa paylamış, ürəklərində özləri ilə apardıqları nuru hər yanda insanların həyatını işıqlandırmağa, yurdumuzu gözəlləşdirməyə, ölkəmizi daha güclü, qüdrətli etməyə çalışmışlar.

Haqqında bəhs edəcəyimiz o dəyərli insanların hamısı el arasında "Şəki maarifinin akademiyası" sayılan 10 №-li Şəki şəhər orta məktəbinin məzunlarıdır. 1957-ci ildə - 55 il bundan əvvəl həmin məktəbi bitirərək həyata vəsiqə alan məzunlar...



## XEYİRXAH ƏNƏNƏ

Şəkidəki 10 №-li orta məktəbi 1957-ci ildə bitirmiş uşaqlar ilk dəfə 20 il sonra, 1977-ci ildə bir yerdə toplaşaraq doğma məktəbi bitirmələrinin yubileyini qeyd ediblər. Elə həmin ildən başlayaraq, onlar hər 5 ildən bir toplaşıb görüşməyi qərara alıblar. Beləliklə, o vaxtdan bəlkə də bənzəri olmayan çox maraqlı və ibrətamiz bir ənənənin təməli qoyulub. Çünki sonradan həqiqətən mütəmadi olaraq hər beş ildən bir keçirilən o görüşlərdə sabiq məzunlar bir araya gələrək, təkcə ziyafət stolu arxasında yeyib-içmək, şənlənmək, xatirələr danışıb deyib-gülmək məqsədi güdməyiblər. Yubiley toplantılarında məzunlar ilk növbədə doğma təhsil ocağının qayğıları ilə maraqlanıblar. Öz daxili imkanları hesabına məktəbdə zəruri təmir işlərinin aparılmasına kömək ediblər, müxtəlif dərs vəsaitləri, tədris avadanlıqları alıb məktəbə bağışlayıblar. Qocaman müəllimlərə, ehtiyacı olan keçmiş sinif yoldaşlarına, hətta dünyadan köçmüş məzunların ailələrinə belə yardım göstəriblər.

Xüsusən, 2002-ci ildə məktəbi bitirmələrinin 45-ci ildönümündə Şəkiyə toplaşan məzunlar doğma məktəbin simasını büsbütün dəyişdilər. Onlar məktəbin uçuq-sökük yerlərini düzəltdirib qapı-pəncərələri yeniləşdirdilər, sinif otaqlarını müasir üslubda təmir etdirdilər, binanın dam örtüyünü təzələdilər, fasadını əvvəlki görkəmində bərpa etdilər. Məktəbə xeyli miqdarda dərs vəsaiti, müxtəlif avadanlıqlar bağışladılar... Bütün bunlar həqiqətən dünyada bənzəri olmayan işlər idi.



Əlbəttə, belə tədbirlərin əsil mahiyyəti təkcə təmir-tikinti, yaxud xeyriyyə işlərinin icrasında deyil. Bu ənənənin daha dərin mənəvi-əxlaqi mənası, daha təsirli pedaqoji əhəmiyyəti vardır. Belə ki, ilk növbədə böyü-məkdə olan gənc nəslin tərbiyəsi üçün onun təsiri daha böyükdür. Vaxtaşırı doğma məktəbə baş çəkib onun qayğıları ilə maraqlanan, müəllimlərinə böyük sevgi və ehtiramlarını sərgiləyən bu məzunların pak amalı, xoş niyyəti, nümunəvi həyat tərzi yeni nəsil nümayəndələri-nin, müasir məktəb şagirdlərinin yaddaşında heç şübhəsiz dərin izlər buraxır. Onlara sədaqətli dostluq duyğuları, vətənə, doğma el-obaya məhəbbət, təhsil ocağına ülvi sevgi hissləri aşılayır. Yaşlı nəslin bir-birindən maraqlı məktəb xatirələrini dinləmək, zəngin həyat təcrübəsinə malik insanların dəyərli məsləhətlərini, xeyirxah tövsiyyələrini eşitmək, onların xoş əməllərinin şahidi olmaq, təmənnasız dostluq duyğuları ilə yaşayan insanların münasibətini yaxından müşahidə etmək – bütün bunlar böyük həyat dərsidir!

Məhz bu amillər şagirdlərin yaddaşında dərin iz qoyaraq, onlar üçün gözəl pedaqoji üsul, mükəmməl tədris metodikası rolunu oynayır. Məzunların oxuyub-yazmaq öyrəndikləri doğma məktəbə səmimi bağlılığı, bilik-savad aldıqları müəllimlərinə bu cür həssas münasibəti, keçmiş sinif yoldaşlarına, uşaqlıq dostlarına, hətta onların övladlarına belə qayğıkeşliyi böyüməkdə olan nəsil üçün nümunədir. Məktəbə, müəllimə böyük diqqət, elmə, biliyə, təhsilə belə yüksək məhəbbət müasir gəncliyə ata-babalardan örnək olacaq ən ləyaqətli həyat dərsidir...

Tam qətiyyətlə demək olar ki, 1957-ci il məzunlarının nümayiş etdirdikləri bu nümunə nəinki Şəkinin, eləcə də bütün ölkənin məktəb məzunları üçün örnək ola biləcək, davam etdirilməyə layiq gözəl bir ənənədir.



Burada bir maraqlı məqamı da oxucuların diqqətinə yetirmək istərdik. 1977-ci ildə 10 saylı məktəbi bitirmələrinin 20 illik yubileyini qeyd edən məzunlar öz tədbirlərinə qonaq qismində yaxın dostlarını da dəvət etmişdilər. İbrahim Mustafayev, İlham Hacıyev, Tərlan Məmmədov, Rəhman Hacıyev, Gerasim Rüstəmov, Ənvər Həmidov, Nüsrət Əliyev kimi bir çox dostların

məktəbdə keçirilən görüşlər zamanı şagirdlər qarşısında çıxış edib dəyərli tövsiyyələr söyləməsi səmimi, mehriban dostluq nümunəsi kimi ürəklərdə dərin təəssürat oyatdı...

Nəhayət, 2007-ci ilin mayında 50 illik yubileylərinə toplaşan 1957-ci il məzunları arzu etdilər ki, 5 il sonra, 2012-ci ilin mayında 55 illik yubileyi yenidən hamılıqla bir yerdə qeyd etsinlər.

Budur, artıq 2012-ci ilin may ayıdır.

Və məzunlar yenə də burada - Şəkidə, vaxtilə oxuduqları 10№-li məktəbdə bir yerdədirlər...







## ULU ÖNDƏRİN XEYİR-DUASI

Azərbaycan xalqının ümummilli lideri, ulu öndər Heydər Əliyevin Şəkiyə və şəkililərə xüsusi məhəbbəti var idi. İstər Sovet hakimiyyəti illərində, istərsə də müstəqil Azərbaycana rəhbərliyi dövründə o daim Şəkinin inkişafı ilə maraqlanır, rayona diqqət və qayğısını əsirgəməyərək, problemlərinin həlli üçün bütün lazımi tapşırıq və göstərişlərini verirdi. Heydər Əliyev ölkə rəhbəri kimi dəfələrlə Şəkidə olmuş, əhali ilə görüşmüş, xalqın qarşısında çıxışlar edərək öz müdrik tövsiyyələrini vermişdir.

Belə səfərlərdən biri də ulu öndərin ömrünün son illərinə təsadüf edir. 2002-ci ilin noyabr ayında o, Azərbaycan Prezidenti kimi Şəkiyə səfər edərkən Şəki Şəhəri İcra Hakimiyyətinin binasında keçirilən müşavirədə geniş nitq söylədi, bir daha Şəki haqqında isti ürək sözlərini bildirdi.





Ulu öndər çıxışında dedi:

"...Şəki özü, - mən bu barədə demişəm, - gözəl şəhərdir, tarixi şəhərdir, mədəniyyət abidələri şəhəridir, muzeyidir. Bəli, bunların hamısı var. Amma bunları əsrlər boyu yaradanlar insanlardır. Bu gün də bütün bu əhval-ruhiyyənin, bütün bu sağlam mühitin yaradıcısı insanların özləridir, onların daxili mədəniyyətidir. Mən bunu belə hiss etdim və belə qiymətləndirirəm. Bu da sizin nailiyyətinizdir. Bu nailiyyətinizə görə də mən sizin işinizi bəyənirəm və təbrik edirəm.





İnsanlar bəzən deyirlər ki, çox iş adamı yorur. Bəli, əlbəttə, iş adamı yorur. İnsan insandır. Hər bir insanın müəyyən fiziki imkanları var. Amma mən sizə açıq deyim... burada olan sağlam-psixoloji ab-hava, ictimai-siyasi vəziyyət, xalqın xoş əhval-ruhiyyəsi və bizim görüşlərimizin çox uğurla keçməsi, təbiidir, Şəkidə böyük Olimpiya İdman Kompleksinin açılması o qədər böyük razılıq hissi doğurur ki, məsələn, şəxsən mən heç yorulmamışam.

Mən çox şadam ki, Şəkiyə gəldim. Uzun müddətdir gəlməmişdim. Amma həsrətində idim, gəlmək istəyirdim, sizinlə görüşmək istəyərdim. Nəhayət, buna nail oldum və günümüz də çox səmərəli keçdi. Mən bu gün sizi





dinləyərək onu deyə bilərəm ki, təkcə bu gün yox, mən bütün gün şəhərdə olan əhval-ruhiyyəni, ab-havanı müşahidə edirəm. Bunların hamısının nəticəsində onu deyə bilərəm ki, Şəki rayonunda yaxşı mühit var, insanlar müstəqil dövlətdə yaşamaq imkanını çox yüksək qiymətləndirirlər. Bu gün Azərbaycanda yaratdığımız ictimai-siyasi sabitliyi qiymətləndirə bilirlər.

Məhz bu ictimai-siyasi sabitliyin nəticəsidir ki, Şəki əhalisi bu gün gördüyüm kimi yüksək əhval-ruhiyyədədir və Azərbaycanın dövlətçiliyinə, müstəqilliyinə sədaqətlidir. Mən bunların hamısını gördüm və bugünkü müşavirədə də bunu hiss edirəm. Bu, sizin əldə etdiyiniz nailiyyətdir. Arzu edərdim ki, siz bu nailiyyətinizlə kifayətlənməyəsiniz, işinizi bundan sonra daha da yaxşı qurasınız və Şəkinin sosial-iqtisadi inkişafını daha yüksək sürətlə təmin edə biləsiniz.

Mənə göstərdikləri etimada görə və burada gördüyüm xoş münasibətə görə bütün Şəki əhalisinə təşəkkür edirəm. Ümidvar olmaq istəyirəm ki, Şəki camaatı gələcəkdə də mənə münasibətdə bu cür sağlam mövqedə duracaq, dövlətçilik mövqeyində duracaq, Azərbaycan dövlətçiliyini müdafiə edəcək və Azərbaycanın müstəqilliyinin möhkəmlənməsində öz xidmətlərini göstərəcəkdir. ”

**Heydər Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti.**
(10 noyabr 2002-ci il)

## LAYİQLİ DAVAMÇININ BÖYÜK QAYĞISI





Şəkini, onun bənzərsiz təbiətini eyni səmimiyyətlə sevən ulu öndərin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev 2006-cı ildə Şəkiyə səfəri zamanı demişdir:



«...Şəki şəhərinin çox qədim tarixi var. Azərbaycanın çox gözəl, çox böyük tarixə malik olan şəhəridir.

Ona görə Şəki şəhərinin inkişafına xüsusi xidmət göstərilir.

Mən şübhə etmirəm ki, Şəki şəhərinin gələcək abadlaşdırılması da uğurla gedəcək, Şəki öz qədimliyini, tarixi simasını saxlamaq şərti ilə müasirləşəcək və həmişə olduğu kimi, şəkililər Azərbaycanın inkişafında öz böyük rolunu oynayacaqlar...

...Şəkinin çox böyük potensialı, çox böyük imkanları var. Burada turizmin inkişafı üçün çox gözəl şərait var. Turizmi inkişaf etdirmək üçün gərək infrastruktur yaradılsın. "

(14. X. 2006)

***



2011-ci il noyabrın 17-də Prezident İlham Əliyev yenidən Şəki şəhərinə səfərə gəlmişdir. Rayonda olarkən o, bir sıra sosial təyinatlı obyektlərin açılışında iştirak etmiş, öz tapşırıq və tövsiyələrini vermişdir. Şəkiyə səfəri çərçivəsində 100 çarpayılıq mərkəzi xəstəxananın açılışında iştirak edən dövlət başçısı Şəki ictimaiyyətinin nümayəndələri ilə görüşündə demişdir:

"Bu yaxınlarda Şəkinin inkişafı ilə bağlı xüsusi sərəncam verilmişdir. Bu sərəncamın çox böyük mənası vardır. Təkcə ona görə yox ki, bu sərəncam əsasında Şəkinin abadlaşmasına və tarixi binaların bərpasına 5 milyon manat vəsait ayrılmışdır. Əvvəlki dövrdə də vəsait ayrılmışdır, bundan sonra da ayrılacaqdır. Bu sərəncamın əsas mahiyyəti ondan ibarətdir ki, biz öz



tarixi keçmişimizə, tarixi şəhərlərimizə daha da böyük diqqətlə yanaşmalıyıq...

...Şəki indi yeni inkişaf mərhələsindədir. Bütün dövrlərdə bu şəhər Azərbaycan tarixində xüsusi yerə malik olub. Şəkinin inkişafı ilə bağlı əsas istiqamətlər müəyyən edilmişdir. Qısa müddət ərzində böyük layihələrin master planı hazırlanmışdır və mənə təqdim edilmişdir. İndi o planın icrası başlanmışdır."







# BURA ŞƏKİDİR...



Doğma yurdumuz Azərbaycanın ən füsunkar guşələrindən biri də - gözəl Şəkidir.

Bu şəhərin evləri, həyət-bacası daim gül-çiçəyə, bağ-bağata, yaşıllıqlara qərq olmuşdur. Mahir el sənətkarlarının kirəmit, qırmızı kərpic və çay daşlarından hördükləri Şəki evləri zərif şəbəkələr və memarlıq ünsürləri ilə daha da yaraşıqlı görünür.

Qədim dövrlərdən Şəki Yaxın Şərqin məşhur ticarət və sənət mərkəzlərindən biri kimi tanınmış, keyfiyyətli

ipəyi ilə şöhrət qazanmışdır. Şəki ipəyi Avropa və Asiyanın bir çox ölkələrində beynəlxalq sərgi-yarmarkalarda uğurla nümayiş etdirilmiş, öz davamlılığı, zərifliyi və möhkəmliyi ilə yüksək qiymətləndirilmişdir.

Şəki sənətkarlarının toxuculuq, zərgərlik, təkəlduz, dulusçuluq, misgərlik, sərraclıq, xalçaçılıq məmulatları dünya bazarlarında əl-əl gəzmişdir.

«Şəki» adı ilə bağlı ilk fikirlərə antik dövrün salnaməçiləri Herodot və Strabonun yazılarında rast gəlinir. Herodota görə e.ə. VII əsrdə burada «Skif çarlığı» yaranmışdır. Strabon isə skifləri «saklar» adlandırır və qeyd edir ki, saklar Zaqafqaziyada ən yaxşı torpaqları tutaraq bu yerlərə öz adlarına uyğun «Sakaşena» adını vermişlər.



Tarixçi-alimlər saklardan danışarkən onların əsasən Şəki ərazisində məskunlaşdıqlarını qeyd edir, coğrafi koordinatlar verirlər ki, bu da indiki Şəki rayonunun ərazisinə uyğundur. Ərəb salnaməçisi Balazuri də IX əsrdə həmin yaşayış məskənini «Sakaşen», şəhəri isə «Saki» adlandırır.

Deyilənlərdən, həmçinin arxeoloji qazıntılar zamanı əldə olunan sübutlardan belə nəticəyə gəlmək olar ki, Şəkinin əsası hələ e.ə. VII əsrdə, yəni 2700 il bundan əvvəl saklar tərəfindən qoyulmuşdur.

Şəkini Azərbaycanın qədim şəhərlərindən biri hesab edən akademik A.Krımski Strabonun qeyd etdiyi İberiya yaxınlığındakı qədim Alban məbədinin e.ə. I əsrdə məhz burada yerləşdiyini və Şəkinin Alban çarlığının ən iri şəhərlərindən olduğunu təsdiq edir.

Təbii ki, vaxtilə «Sakaşena», ya «Şakaşen» adlanan indiki Şəki adı müasir şəklə düşənə qədər uzun təkamül yolu keçmişdir.

Onu da qeyd edək ki, çox vaxt Nuxa ilə Şəkini eyniləşdirsələr də, əslində Şəki və Nuxa qonşu ərazilərdə yerləşən ayrı-ayrı yaşayış məntəqələri olmuşdur. Hələ Ptolomey Alban şəhərləri içərisində Niqa adlı yaşayış yerinin adını qeyd edirdi.



*Kiş kəndində alban məbədi*

Məşhur Azərbaycan tarixçisi A.Bakıxanov «Gülüstani-İrəm» əsərində bu mövzuya toxunaraq yazır: «Nuxa şəhəri həmin Naxiyə və ya Nağiya şəhəridir...».

Hacı Seyid Əbdülhəmidin «Şəki xanlıqları və onların nəsilləri» adlı əsərində bir daha göstərilir ki, Nuxa və Şəki ayrı-ayrı yaşayış məskənləridir. Həmin əsərdə oxuyuruq: «Noxunun və Şəkinin camaatları ittifaq edib İran qarətgərlərinin şərrlərindən əmin olmaqdan ötrü Əlicanı Noxuda hakimi zübdə edib, xan təyin edibdirlər ki, Şəki vilayətini mühafizə edib, umuratlarını dolandırsın».

Faktlar sübut edir ki, Şəki vilayətinə daxil olan Nuxa demək olar ki, öz ilk yerini dəyişməyib. Şəkinin isə Kiş çayının Əyriçaya töküldüyü yerdə, Alazan-Həftəran dağarası düzənliyində, indiki Qaradağlı kəndi ərazisində, Nuxanın cənub-qərbində yerləşdiyi güman edilir.

1772-ci ildə şiddətli yağıntı nəticəsində Kiş çayında baş verən güclü daşqın Şəkini tamamilə yuyub aparır. «Qafqaz» qəzeti 1846-cı il 15 iyul tarixli nömrəsində həmin fəlakət haqqında belə yazmışdır: «...Dəhşətli daşqın əmələ gətirən Kiş çayı Şəkini xarabazara döndərdi, onun bütün evlərini bünövrəsindən qopardı. O vaxt minlərlə adam bu dəhşətli selin qurbanı oldu. O vaxtdan şəkililər vadinin şərq sahilinə – dağların ətəklərinə çəkildilər. İndiki Nuxa şəhəri də elə burada əmələ gəlmişdir».



1846-cı ilin inzibati islahatına əsasən bütün əyalətə Nuxa qəzası, qəzanın mərkəzinə isə Nuxa adı verilmişdir. «Şəki» adı yalnız Azərbaycan SSR Ali Sovetinin 15 mart 1968-ci il tarixli fərmanı ilə bərpa edilmişdir.

Yeri gəlmişkən, onu da qeyd edək ki, köhnə şəhərin memarlıq quruluşuna aid əlimizdə heç bir məlumat olmadığından, yalnız Övliya Çələbiyə istinad etsək, onun verdiyi məlumata görə daşdan tikilmiş gözəl Şəki qalası təpəlikdə yerləşirdi. Qalanın Şirvan və Gəncə adlanan iki darvazası var idi. Şəhərdə üç min ev, yeddi məscid var idi ki, məscidlərdən bazar meydanında yerləşən Mirzə Əli məscidi, qala və iki məscid nəzəri daha çox cəlb edirdi. Şəhərin karvansaraları və kiçik bazarı var idi. Bu məlumata əsasən Şəki qaladan kənarda yerləşən çox geniş tikililərdən ibarət olmuşdur ki, burada da «bərabəri olmayan ipək» istehsal edən çoxlu bağlar yerləşirdi. Ö.Çələbiyə görə qədim Şəkidə yaşayış binalarının sayı 3000, əhalisi 20.000 nəfərdən ibarət idi.

Dəhşətli sel sularının caynağından özünü zorla xilas edə bilmiş cəmi 6000 yaralı, xəstə, zədələnmiş, doğmalarını, yaxınlarını itirmiş şəkililər indiki Şəkinin ərazisində məskunlaşdılar.

Yenidən həyata qayıdan insanlar bu ərazidə də milli memarlıq ənənələrimizə uyğun binalar, yaşayış evləri, körpülər, hamamlar, məscidlər, minarələr, karvansaralar, dükanlar tikməyə başladılar. Şəkililərin böyük məhəbbət və zövqlə qurub yaratdıqları Azərbaycan memarlığının bütün ornamentlərini, üslublarını, incəliklərini özündə cəmləşdirən bu tikililərin əksəriyyəti bizim dövrə qədər qalmaqdadır və hələ də öz gözəlliyi, əzəməti ilə hər kəsin diqqət və marağına səbəb olur.



Şəkinin qədimliyini, burada tarix-memarlıq abidələrinin çoxluğunu və bütün dünya mədəni irsində xüsusi yeri olduğunu nəzərə alaraq əski sovetlər birliyi dövründə Respublika Nazirlər Kabinetinin 24 noyabr 1967-ci il tarixli qərarı ilə şəhərin «Yuxarıbaş» hissəsi Tarix-Memarlıq Qoruğu elan edilmişdir.

Ulu babalarımızın bizə yadigar qoyduqları Xan sarayı, Şəki xanlarının evi, Dairəvi məbəd, Qala divarları qoruğun memarlıq incilərindəndir. Möminlərin ibadət yeri olan Cümə məscidi, Ömər Əfəndi məscidi, Xan məscidindən başqa qoruq ərazisində məhəllə məscidləri də olmuşdur.



*Şəki şəhərinin görüntüsü*



Ta qədimdən sənətkarlıq və ipəkçiliklə məşğul olan Şəkiyə müsafirlər gələr və burada ticarətlə məşğul olardılar. O dövrdə tikilmiş beş karvansaradan ikisi indiyə qədər qorunub saxlanılır. Mehmanxana kimi istifadə edilən Yuxarı karvansara indi də turistlərin ən çox zövqünü oxşayıb, onları valeh edən yerlərdəndir.

Yuxarı başı iki hissəyə bölən Qurcana çayı üzərində xüsusi memar zövqü ilə tikilmiş tağlı körpülər bu ərazini birləşdirir.

Orta əsrlər memarlığının yadigarı olan Ağvanlar, Dərə və Yeraltı hamamlar da muzey-qoruğa məxsusdur.

Xalqımızın milli sərvəti və iftixarı olan Diyarşünaslıq, Tətbiqi Sənət, M.F.Axundzadə, R.B.Əfəndiyev, S.Rəhmanın ev muzeyləri və Dövlət Rəsm Qalareyasının yaraşıqlı binaları da qoruğun ərazisində yerləşir.

Memarlıq abidələrinin zənginiyinə görə haqlı olaraq Şəkini muzey-şəhər adlandırırlar.

## QƏDİM ŞƏKİNİN BU GÜNÜ



2011-ci ildə Şəki Şəhər İcra Hakimiyyətində yaradılan xüsusi şurada rayonda həyata keçiriləcək bütün tikinti, təmir və yenidənqurma işlərinin layihələri müzakirə edilir. Kollegial şəkildə təsdiq olunan layihələr əsasında Şəkidə geniş abadlıq-quruculuq işləri aparılır.

2011-ci ildə tikinti, abadlıq-quruculuq sahəsində bir çox işlər görülüb. Məsələn, dahi filosof, yazıçı-dramaturq Mirzə Fətəli Axundzadənin şəhərin mərkəzində yerləşən büstünün ətrafında və ev-muzeyində abadlıq və yenidənqurma işləri aparılıb. H.Əliyev, M.Ə.Rəsulzadə, M.F.Axundzadə prospektində, Salman Mümtaz küçəsində bir sıra abadlıq işləri aparılıb, binaların dam örtükləri, fasadları bərpa edilib, yağış sularının axıdılması üçün arxlar çəkilib, yolkənarı məhəllə divarları daş və kərpiclə üzlənib, həyətlərə giriş darvazaları qədim memarlıq



üslubunda, əsaslı surətdə bərpa edilib, Oğuz yolunda körpü quraşdırılıb, yola asfalt döşənib, küçələrdə müasir işıqlandırma sistemi qurulub, yeni yaşıllıq zolaqları, kiçik parklar salınıb.

Şəki şəhərinin Baş Planına əsasən bir sıra infrastruktur layihələrin həyata keçirilməsi, Heydər Əliyev Mərkəzinin, Bayraq Meydanının, Şəki Şəhər İcra Hakimiyyəti üçün yeni inzibati binanın inşası nəzərdə tutulur.

2012-ci ildə Qarabağ müharibəsi əlilləri və şəhid ailələri üçün 36 mənzilli yaşayış binasının, Şəki Dövlət Dram Teatrının və M.F.Axundzadə adına kinoteatrın, bir sıra yaşayış binalarının əsaslı təmir edilməsi, sadə idman qurğularının quraşdırılması və idman meydançalarının yaradılması da plandadır.

Aşağı Küngüt, Oxud və Fazıl kəndlərinə təbii qazın verilməsi təmin edilib, yaşayış məntəqələrinin qazlaşdırılması istiqamətində işlər davam etdirilir.

Təməli 2010-cu ilin dekabr ayında qoyulmuş Şəki şəhərinin su təchizatı və kanalizasiya sisteminin yenidən qurulması layihəsinin birinci mərhələsi artıq yekunlaşmışdır. Bu il layihənin ikinci mərhələsi üzrə tikinti-quraşdırma işləri həyata keçiriləcəkdir. Şəhərdaxili su təchizatı və kanalizasiya sisteminin tamamilə yenidən qurulması nəzərdə tutulur.

Təhsil sisteminin, təlim-tərbiyə prosesinin yüksək səviyyədə təşkili daim diqqət mərkəzindədir. 2011-ci il

sentyabrın 15-də Baş Kəldək kəndində inşa olunan 180 şagird yerlik yeni məktəb binası istifadəyə verilmişdir;

Hazırda Şəki şəhər 5 saylı orta məktəb üçün 320 yerlik yeni tədris korpusunun, Şorsu və Aşağı Layısqı kəndlərinin hər birində 360 şagird yerlik, Çələbi Xan qəsəbəsində 180 şagird yerlik yeni məktəb binalarının tikintisi aparılır;

2011-ci ildə əhaliyə göstərilən tibbi xidmətin səviyyəsini daha da yüksəltmək məqsədilə səhiyyə müəssisələrinin maddi-texniki bazasının yaxşılaşdırılması istiqamətində işlər davam etdirilib. 2011-ci il noyabrın 17-də möhtərəm Prezident İlham Əliyevin iştirakı ilə Şəki şəhərində yeni, müasir, 100 çarpayılıq şəhər xəstəxanasının açılışı olmuşdur.

Şəki Doğum Evi Kompleksinin dövlət vəsaiti hesabına əsaslı təmirinə, Aşağı və Baş Göynük kənd xəstəxanaları üçün isə yeni binaların tikintisinə başlanmışdır.



# ŞƏKİNİN TARİX-MEMARLIQ ABİDƏLƏRİ

## XAN SARAYI

Qoruğa daxil olan tikililərdən biri də dünya əhəmiyyətli abidələr sırasına daxil edilmiş Şəki xanının sarayıdır. Saray Qalanın mərkəzinə yaxın şimal yarımhissəsində dəniz səviyyəsindən 740 metr hündürlükdə yerləşir. O, XVIII əsr Azərbaycan memarlığının klassik nümunələrindən biri kimi respublikamızdan kənarda belə məşhurdur. Bu unikal binada memarlığın və boyakarlığın harmonik sintezi yaradılmışdır. Şəki xanlarının yay sarayı olan bu bina Azərbaycanda ilk müstəqil xanlığın əsasını qoyan Hacı Çələbi xanın nəvəsi Məmməd Hüseyn xanın hakimiyyəti dövründə 1761-1762-ci illərdə istifadəyə verilmişdir. Məmməd Hüseyn xan eyni zamanda Müştaq təxəllüsü ilə şeirlər yazdığından bəzi mənbələrdə bu saray Müştaq imarəti kimi qeyd olunmuşdur.

Xan sarayı ikimərtəbəli olmaqla altı otaqdan, dörd dəhlizdən, iki güzgülü eyvandan ibarətdir. Hər mərtəbədə yerləşən üç otaq bir-birindən dəhlizlə ayrılır ki, bu da sarayın aydınlığına və sadəliyinə dəlalət edir.

















Beləliklə, şəxsi və rəsmi qonaqlar üçün olan ikinci mərtəbə, dövlət işlərindən ötrü istifadə edilən birinci mərtəbədən təcrid edilirdi. Hər iki mərtəbənin ortasında geniş salon, yanlarında isə otaqlar yerləşmişdir.

Binanın baş fasadı dünyada analoqu olmayan ən xırda, həndəsi fiqurlara bölünmüş mismar və yapışqandan istifadə edilmədən ağac parçalarının aralarına müxtəlif rəngli şüşələr geyindirilmiş şəbəkə pəncərələrindən ibarətdir. Şəbəkənin hər bir kvadratmetri orta hesabla beş min, mürəkkəb yerləri on dörd min ağac və şüşə şəbəkədən yığılmışdır. Bu pəncərələrdən süzülən günəş şüası otaqların döşəmə və divarlarına rəngbərəng ziya salaraq yağışdan sonrakı göy qurşağını xatırladır.



*Şəkinin Xan sarayı*

Sarayın əsas fasadı cənuba, şəhər tərəfədir. Burada divarın ornamentliyi, piştağların genişliyi, naxışlı şəbəkələr, dağlamalar, müxtəlif naxışlar, gəc üzərində oymalar adamı heyran edir. Fasad hissə günəşə davamlı rənglərlə boyanmışdır.

Binanın daxili divarları gəclə malalanmış, yumurtanın ağı ilə örtüldükdən sonra üzərində müxtəlif naxışlar, rəngbərəng rəsmlər çəkilmişdir. Naxışlar çox simmetrik qaydada yerləşdirilsə də, onların müxtəlifliyi bir-birinin təkrarı olmayan kompozisiyalardan ibarətdir.

Saraydakı naxışların zənginliyinə, rəng çalarlarına, qızılı boyalardan daha çox istifadə edilməsinə xüsusi diqqət yetirilmişdir. Buradakı sənətkarlıq nümunələrinə baxdıqca ata-babalarımızın qabiliyyət və bacarığına heyran olursan. Seyr edən tamaşaçılar Xan sarayını hər zaman yüksək qiymətləndirmişlər.



## XAN SARAYI HAQQINDA ÜRƏK SÖZLƏRI

«Xan sarayı elə gözəl füsunkar gözəlliyə malik abidədir ki, yalnız memar fırçası onun necə birləşdirildiyi məlum olmayan saysız-hesabsız şəbəkə və naxışlarını yenidən canlandıra bilər... Nuxanın çox da böyük olmayan Xan sarayından ayrılanda ürəyimdən istər-istəməz bir fikir keçdi:

-Xudaya, sən özün bu gözəl və tarixi abidəni yadellilərdən qoru!» **( Aleksandr Düma)**

«Azərbaycanda yüzlərlə tarixi abidələr vardır. Bunların içərisində Şəki Xan sarayı öz tarixi əhəmiyyəti və gözəlliyi ilə xüsusi yer tutur».

**(Akademik Mirəli Qaşqay)**

«Şəki Xan Sarayının mühüm bir əhəmiyyəti də ondan ibarətdir ki, orada təbiət abidəsi (bir neçə yüzillik çinar ağacları) mühafizə olunur. Mən hər dəfə Şəkiyə gələrkən bu sarayı ziyarət etməyi özümə borc bilirəm».

**(Akademik Həsən Əliyev)**



## NARINQALA



Şəki ərazisində digər maddi-mədəniyyət abidələri ilə bərabər müdafiə tikililərinin də varlığı bu diyarın böyük strateji əhəmiyyətə, qədim və keçmiş tarixə, zəngin tikinti təcrübəsinə malik olduğunu göstərir. Belə tikililərdən biri də Şəki Narınqalasıdır.

O, şəhərin şimal-şərq hissəsində, cənubdan 710 metr, şimaldan 750 metr dəniz səviyyəsindən yüksəklikdə, səfalı bir ərazidə yerləşir. Qala Azərbaycanda ilk müstəqil xanlığın əsasını qoyan Şəki xanı Hacı Çələbinin dövründə (1743-1755-ci illər) tikilmişdir.

Narınqala xanın mühafizə qalası idi. Onun ərazisinə ümumi şəhər tikililəri daxil deyildi. Qala divarlarının xaricdən ümumi uzunluğu 1300 metrdir. Ərazinin relyefi və müdafiə əhəmiyyəti nəzərə alınaraq onun cənubdan



hündürlüyü 8 metr olduğu halda, şimala doğru 4 metrə enir. Divarın qalınlığının 2,2 metr olması onun möhtəşəmliyini və davamlılığını bir daha artırır. Qalanın cənubdan və şimaldan iki tağlı darvazası, bürcləri və mindən artıq mazqalları vardır.

Qalanın yeri yalnız mühafizə baxımından deyil, eyni zamanda gözəl mənzərəsi, səliqəsi, havasının mülayimliyi, canlılığı, səs-küydən uzaq olması ilə də əlverişlidir. Məhz bunun nəticəsidir ki, Şəki xanlarının iqamətgahı olan Xan sarayı da qalanın şimal-şərqində yerləşir. Onu da qeyd edək ki, ərazidəki tikinti komponentlərindən ən əsası və baxımlısı bu saraydır.

Saray və Xan bağı içqala ilə hasara alınmışdır. İçqala saray kompleksini düşməndən qorumaq üçün tikilmişdir.

Narınqalanın Rusiya hərbi mütəxəssisləri tərəfindən 26 fevral 1853-cü il tarixdə tərtib edilmiş planında burada 40-a yaxın müxtəlif təyinatlı tikililərin olduğu göstərilir. Bunlar saray, xəzinə, cəbbəxana, müxtəlif inzibati və təsərrüfat, eyni zamanda xanın ailəsinə məxsus binalar olmuşdur. Bu planda qalaya saxsı borularla çəkilmiş su kəməri də göstərilir. Qurcanaçaydan gələn suyun düşmən tərəfindən istiqamətinin dəyişə biləcəyi ehtimalını nəzərə alaraq burada su quyuları da tikilmişdir.

Təəssüflər olsun ki, biganəliyin, qayğısızlığın nəticəsində tikililər getdikcə dağılaraq yox olmuşdur. Yalnız Xan sarayı bu günümüzə gəlib çatmışdır.

# MƏSCİDLƏR

Şəkidə bir sıra qədim məscidlər mövcuddur. Giləhli məscidi, Xan məscidi, Cümə məscidi və s.

Qədim tarix-memarlıq abidələrindən biri **Giləhli məscididir**. XVIII əsrə məxsus olan bu məscid Şəkinin şimal-şərq hissəsində yerləşir. Məscidin tikintisində yerli inşaat materiallarından – çay daşından və ağacdan istifadə edilmişdir.

Sənətşünas alimlər Giləhli məscidinin yerli sənətkar Davud Nuxəvi tərəfindən tikildiyini qeyd edirlər.

Sovet hakimiyyəti illərində bu memarlıq abidəsi də ideoloji basqıların təsirinə məruz qalaraq sökülmüşdür. Yalnız Giləhli məscidinin minarəsi günümüzə kimi gəlib çatmışdır.

1745-50-ci illərdə Hacı Çələbi xan tərəfindən tikdirilən məscid xalq arasında onun şərəfinə «**Xan məscidi**» adlandırılır. Məscidin tikintisində yerli inşaat yerli inşaat materiallarından istifadə olunmuşdur. Məscid, minarə və qəbiristanlıqda olan kümbəz tarixi abidə kimi mühafizə edilir.













XVIII-XIX əsrlərdə tikilmiş **Ömər əfəndi** məscidinin fasadı bişmiş kərpicli naxışları ilə diqqəti cəlb edir. Fasaddakı kərpic karniz, divar səthindən qabağa çıxan nazik tağlarla işlənmiş pəncərəüstü, bir-birini əvəz edən kərpic və daş hörgü sıralarından ibarət pəncərəarası divarlar onun memarlıq simasını tamamlayır. Binanın tikintisi özünəməxsusluğuna, bədii ifadəliliyinə görə Şəki memarlığı ruhunda yerinə yetirilmişdir. İnteryerin dekor elementi olan mehrab xüsusi məharətlə işlənmişdir.



XVIII-XIX əsrə aid olan **Cümə məscidi** quruluşuna görə tağlı, sütunlu salondan ibarət olub, daş və ağaclarla bölmələrə ayrılaraq binadakı böyük aşırımı örtməyə imkan verir. Məscidin iç məkanı sadə həll olunmuşdur. Buradan ibadət yeri, hücrələrindən isə mədrəsə kimi istifadə olunub. Məscid kompleksi ikimərtəbəlidir. Baş fasad kərpic naxışlarla işlənmişdir.

# YAŞAYIŞ BİNALARI

## ŞƏKİXANOVLARIN EVİ

Əsasən ciy kərpicdən tikilmiş Şəkixanovların evi iki mərtəbəli olub, 6 otaq, 4 dəhliz və 2 eyvandan ibarətdir. İlk növbədə Xan sarayını xatırladan binanın fasad hissəsi rəngli şüşələrdən və ağac parcalarından yığılmış şəbəkələrdən ibarətdir. Binanın qarşısında bişmiş kərpicdən döşənmiş səki vardır.



*Şəkixanovların evi*

Birinci mərtəbədən qış yaşayış yeri kimi istifadə olunduğundan mərkəzi zal buxarı ilə təchiz edilmişdir. İkinci mərtəbə süjetli və zəngin divar rəsmləri, dekorativ buxarısı ilə diqqəti cəlb edir. Divarlarda əsasən miniatür stilində işlənmiş Nizami Gəncəvinin «Xəmsə»sinin qəhrəmanları, heyvan və quş təsvirləri, gül-cicək rəsmləri, ornamental kompozisiyalar sənətkarın yüksək istedad sahibi olmasından xəbər verir. Otaqların bəzək işində kiçik güzgü parçalarından məharətlə istifadə edilmişdir. İkinci mərtəbənin dəhlizində bütöv bir taxtadan ustalıqla düzəldilmiş şəbəkə bu gözəlliyi daha da artırır.

## YUXARI KARVANSARA

Ərazisindən böyük İpək yolunun keçdiyi Azərbaycanın qədim sənətkarlıq, ipəkcilik və ticarət şəhəri olan Şəki karvan yolları vasitəsilə digər xanlıqların və bir cox xarici ölkələrin ticarət mərkəzlərini özündə birləşdirirdi.

Özünün böyüklüyü və ticarət üçün əlverişliliyi ilə Zaqafqaziyada məşhur olan Yuxarı karvansara dövrümüzə qədər gəlib catmış iki karvansaradan biridir. Ümumi sahəsi 6000 kv.metr olan Yuxarı karvansaraya Şəki memarlığının əsasını təşkil edən kərpic və cay daşının birlikdə işlədilməsi xüsusi kolorit verir.

300-dən artıq otaq və zirzəmidən ibarət olan karvansaranın iki giriş darvazası vardır. Bina üc mərtəbəlidir. Tacirlər öz mallarını zirzəmiyə yığar, birinci mərtəbədə al-ver edər, ikinci mərtəbədə yaşayardılar.

Darvazaların icəri hissəsinin tavanı kərpicdən xüsusi məharətlə hörülmüş tağlı kümbəzlərdir. Yaxın Şərqdə ən böyük tağlı

kümbəzlərdən sayılan əsas girişin zəngin bəzənmiş tağı relyefin cox mailliyi üzündən binanın küncündə ücüncü mərtəbə səviyyəsində inşa edilmişdir.

Bu günə kimi öz gözəlliyi, memarlıq üslubunu qoruyub saxlayan və hazırda mehmanxana kimi istifadə edilən Yuxarı karvansara Şəkinin zəngin maddi və mənəvi irsə malik bir şəhər olmasının bariz nümunəsidir.



*Yuxarı Karvansaradan görüntülər*







## AŞAĞI KARVANSARA

XVIII-XIX əsrlərdə tikilmiş Aşağı karvansara da özünün funksional xüsusiyyətlərinə görə secilir. Burada yolüstü karvansaralardan fərqli olaraq istirahət otaqları ilə yanaşı, müxtəlif ticarət əməliyyatları aparmaq, mübadilə müqavilələri bağlamaq üçün xüsusi otaqlar da inşa edilmişdir.

8000 kv.metrlik ərazini əhatə edən Aşağı karvansaranın 242 otağı və 4 giriş darvazası vardır.

Karvansaranın tikintisi zamanı uzaq ölkələrdən gələn qonaqların rahatlığı, özünün və əşyalarının təhlükəsizliyi üçün hər şey nəzərə alınmışdır.

Karvansaranın dörd iri darvazası qonaqpərvərliklə müsafirlərin üzünə acılsa da, bağlandıqda alınmaz bir qalaya cevrilir. Bu isə bir daha Şəki sənətkarlarının yüksək dünyagörüşünə, böyük istedada, müqayisəsiz memarlıq bacarığına malik olduqlarını təsdiqləyir.







*Aşağı Karvansara*

Əziz oxucu!

Əlbəttə, rayonun bütün tarixi yerləri, abidələri, muzeyləri haqqında danışmaqla bitməz. Odur ki, rayon ərazisində yerləşən görməli yerlərdən bəziləri haqqında yuxarıdakı qısa məlumatlarla kifayətlənək.

Onu da əlavə edək ki, Miladi tarixi ilə həmyaşıd olan **Kiş Alban məbədi, «Gələrsən-görərsən», «Gavur» qalası, Ağcaqala mühafizə bürcü, Babaratma türbəsi, Orta Zəyzid məbədi, Oxud kəndində Güney dağın ətəyi, Fazıl Təpəbaşı açıq muzeyi, Marxal, Xan yaylağı, Ağ Qaya, Soyuq bulaq, Mustafa bəyin malikanəsi** kimi abidələr, istirahət zonaları, parklar, digər füsünkar yerlər xarici turizmin inkişafı üçün böyük imkanlar yaradır. Şəkinin təbii gözəlliyi, adamlarının qonaqpərvərliyi, yerli ustaların qədim sənətkarlıq ənənələrinə uyğun hazırladıqları el sənəti nümunələri, Şəkinin zəngin və bol çeşidli ləziz mətbəxi, dadlı şirniyyatı, xüsusən məşhur Şəki halvası - daim bu diyara gələn qonaqların diqqətini cəlb edir...





*Şəkinin müxtəlif görüntüləri*

## ŞƏKI HAQQINDA DEYİLƏNLƏR

**General Rayevski (Rusiya):**

«Mən Şəki xanlığının paytaxtı Şəki şəhərindən iki keçidlik məsafədəki düşərgədəyəm. Mən bu diyarı böyük heyranlıqla gəzirəm, bizim düşərgə nar, ulğun, çinar meşəsində yerləşir... Şəki çox gözəldir, bura böyük masştabda Bağçasaraydır». (25 oktyabr 1826-cı il.)



***

**Aleksandr Düma (Fransa):**

«İki-üc saata hər tərəfini gəzmək mümkün olan bu şəhər çox səfalıdır. Şəkinin mərkəzində ticarət nöqtələri olan kücələrlə yanaşı, hər bir evin füsünkar həyətyanı bağ-bağcası, ağacları, özünün bulağı vardır. Bir az aralıda başı buludlara dəyən şairanə səfalı dağlar elə gözəl mənzərə yaradır ki, bu mənzərələri sözlə ifadə etməkdə cətinlik cəkirəm. Belə ecazkar mənzərəli yeri mən hec vaxt görməmişəm». (1858-ci il.)

***

**Aleksandr Fadeyev (Rusiya):**

«Məndə belə bir yenilik hasil oldu: M.F.Axundov kimi böyük dahiyə ilham verən dünyada misli-bərabəri olmayan Xan sarayı kimi bir abidə ucaldılan torpağın üstündə Şəki kimi cənnətgah varmış». (7 oktyabr 1947-ci il.)

***

**Lüis Karlos Prestes (Braziliya):**

«Bu yerlərin adamları sanki onun saf və zərif ipəyinə oxşamağa calışırlar. Hamı mehriban, nəcib və açıqqəlblilik göstərir.» (sentyabr - 1977-ci il )

***

**Elizabet Stayner (Avropa Birliyi):**

«Şəkiyə gəlişim və tanışlığım mənə cox mətləbləri acıqladı. Ən əsası ulu Azərbaycanın ən qədim tarixinin Şəkidə qorunub saxlandığını gördüm».

***

**Rino Harniş (ABŞ):**

«Mən Şəkini çox sevirəm. Şəki mənim qəlbimdə həmişə isti duyğular oyadır.» (Mart, 2006-cı il)

## ŞƏKİNİN GÖRKƏMLİ ADAMLARI

Şəki təkcə öz təbii gözəlliyi, tarixi abidələri ilə deyil, yetirdiyi görkəmli şəxsiyyətləri ilə də dünyada tanınan mədəniyyət mərkəzlərindəndir. Həqiqətən bu füsunkar diyar xalqın tarixində və taleyində dərin izlər qoyan neçə-neçə alim, yazıçı, memar, bəstəkar, sərkərdə, pedaqoq yetirmişdir.

Müasir Azərbaycan dramaturgiyasının banisi M.F. Axundzadə, dövlət xadimi F.X.Xoyski, maarifçi-pedaqoq R.B. Əfəndiyev, tədqiqatçı-alim S.Mümtaz, akademiklər Ə. Dəmirçizadə, Z. Zülfüqarov, H. Əfəndiyev, M. İsmayılov, xalq şairi B. Vahabzadə, ədəbiyyatşünas alim Y. Qarayev, hərbçi generallar Z.Yusifzadə, T. Ağahüseynov, M. Həmidov, dramaturq S. Rəhman, xalq artistləri İ. Osmanlı, L. Abdullayev, bəstəkarlar C. Hacıyev, E.Sabitoğlu, Ş. Axundova, kinorejissor R. Ocaqov, heykəltəraş F. Əbdürrəhmanov və b. məhz bu bərəkətli torpağın yetirmələridir.



## SƏBUHİ – SÜBH ŞƏFƏQİ



Dahi yazıçı, filosof Mirzə Fətəli Axundzadə 1812-ci ildə Şəkidə anadan olmuş, ilk təhsilini də burada almışdır.

O, 1814- cü ildə atası Mirzə Məmmədtağı və anası Nanə xanımla Təbriz yaxınlığındakı Xamnə qəsəbəsinə köşmüş, 13 yaşınadək Cənubi Azərbaycanının müxtəlif yerlərində yaşamış, 1825–ci ildə anası ilə yenidən Şəkiyə qayıtmışdır. Anasının əmisi Axund Hacı Ələsgər Fətəlinin təlim-tərbiyəsi ilə məşğul olmuş , ona ərəb və fars dillərini öyrətmişdir. Axund Hacı Ələcgər 1832-.ci ildə onu Gəncəyə aparmışdır. Fətəli burada məntiq və fiqh elmlərini, habelə görkəmli şair Mirzə Şəfi Vazehdən nəstəliq xəttini öyrənmişdir. Mirzə Şəfi Fətəlinin zəkasını və istedadını duyaraq, onu ruhani olmaq fikrindən daşındırmış, fəaliyyətini düzgün istiqamətləndirmişdir.

Müasir elmlərlə maraqlanan M.Fətəli 1833-cü ildə Nuxada açılmış rus-tatar məktəbinə daxil olub bir il burada oxumuşdur. 1834- cü ildə Tiflisə gedərək, Qafqaz canişininin baş dəftərxansında mülki işlər sahəsində



Şərq dilləri üzrə mütərcim işinə daxil omuş, ömrünün sonunadək həmin vəzifədə çalışmışdır. 1873-cü ildə ona polkovnik rütbəsi verilmişdi.

M.F.Axundzadə 1850-1855-ci illərdə yazdığı 6 məşhur komediya ilə azərbaycan və bütün Yaxın Şərq ədəbiyyatında müasir tipli realist dramaturgiyanın təməlini qoymuşdur.

Dahi Mirzə Fətəli Axundzadə nəinki Azərbaycanın, eləcə də bütün dünyanın nəhəng zəka sahiblərindən, istedadlı yaradıcı şəxslərindən biridir. Onun yaratdığı əsərlər, kəşf etdiyi ideyalar Azərbaycanın fikir tarixində azad düşüncə tərzinin ən böyük örnəklərindəndir. Azərbaycanda realist nəsrin, dramaturgiyanın, yeni – materialist fəlsəfənin əsasını qoyan, xalqın inkişafı naminə ilk dəfə əlifba islahatı ideyasını ortaya qoyan və latın qrafikalı əlifbanın layihəsini hazırlayan M.F.Axundzadənin əsas məqsədi müsəlman Şərqində dini fanatizmi aradan qaldırmaq, xalqları qəflət yuxusundan oyadaraq mədəni tərəqqi yoluna yönəltmək, inkişaf etmiş Avropa mədəniyyətinə və estetik dəyərlərinə qovuşdurmaq idi.



Azərbaycan Prezidenti İlham Əliyevin dahi M.F.Axundzadənin 200 illik yubileyinin təntənəli şəkildə keçirilməsi məqsədilə 13 aprel 2010-cu il tarixdə imzaladığı Sərəncam milli mədəniyyətimizə, fikir tariximizə, dahi şəxsiyyətlərimizə ən yüksək diqqətin göstəricisidir.

Mədəniyyət və Turizm nazirliyi bu Sərəncamın yüksək səviyyədə icrası məqsədilə geniş tədbirlər planı hazırlamışdır. Buraya Dövlət teatrlarında M.F.Axundzadənin komediyalarının səhnələşdirilməsi, M.F.Axundzadəyə həsr edilmiş müsabiqə və festivalların keçirilməsi, mütəfəkkirin Şəki şəhərindəki Ev muzeyində əsaslı təmir-bərpa işlərinin aparılması, muzeydəki eksponatların bərpası və konservasiyası, həmçinin Tbilisi şəhərindəki M.F.Axundzadə adına Azərbaycan Mədəniyyəti Muzeyinin fondlarının zənginləşdirilməsi, Şəkidə kütləvi kitabxanalarda oxucu konfranslarının təşkili, elmi seminarların, konfrans və sərgilərin keçirilməsi, Şəkili rəssamların əsərlərinin ekspozisiyası, M.F.Axundzadənin əsərlərindən ibarət kitab sərgisi, M.F.Axundzadə Ensiklopediyasının yaradılması, Seçilmiş əsərlərinin rus, ingilis və fransız dillərində nəşri, "Azərbaycanfilm" kinostudiyasında ədibin həyat və yaradıcılığına həsr olunmuş bədii filmin çəkilişi və digər tədbirlər daxildir. Bundan başqa AMEA-da dramaturqun 200 illiyinə həsr olunmuş təntənəli yubiley tədbiri, elmi sessiyalar, Şəki şəhərində yubiley tədbiri, Müəllimlər İnstitutunun Şəki filialında təntənəli gecə,

M.F.Axundzadəyə həsr olunmuş internet saytının yaradılması, mətbuatda dahi sənətkarın yaradıcılığı haqqında məqalələrin dərc edilməsi, Tele-radioda xüsusi verilişlərin hazırlanması, poçt markasının və suvenirlərin buraxılması da nəzərdə tutulmuşdur. Yubiley tədbirləri Heydər Əliyev Sarayında təntənəli yekun tədbiri ilə başa çatacaq. Böyük mütəfəkkirin anadan olmasının 200 illiyi beynəlxalq mahiyyət daşıyacaq, tədbirlərə həmçinin xarici ölkələrdən mütəxəssislər, ziyalılar və digər qonaqlar dəvət olunacaq. 2012-ci il həmçinin TÜRKSOY tərəfindən "Axundzadə ili" elan edilmişdir.



***

Şərqin böyük dühası, bəşəriyyəti dostluğa, qardaşlığa çağıran, ədalətsizliyə qarşı iti qələmi ilə mübarizə aparan M.F.Axundzadənin adını əbədiləşdirmək, evini, əşyalarını qoruyub saxlamaq və gələcək nəsillərə çatdırmaq üçün hələ 1940-cı ildə onun yaşadığı evə muzey statusu verilmişdir. XVIII əsrin sonlarında çiy kərpicdən tikilmiş, bir mərtəbəli bina olub iki kiçik otaqdan ibarət ev-muzey bu gün abadlaşdırılaraq, zəngin ekspozisiya ilə tamaşaçıların ixtiyarına verilmişdir. Həqiqətən hər bir şəkili bu dahi həmyerlisi ilə fəxr edə bilər.




*M.F.Axundzadənin ev – muzeyi*

# RƏŞİD BƏY ƏFƏNDİYEV



Görkəmli pedaqoq, şair, nasir, publisist, dramaturq, tərcüməçi və etnoqraf kimi tanınan, həyatı boyu mütərəqqi fikir və əməllərlə yaşayıb yaradan 1863-cü ildə Azərbaycanın ən qədim diyarlarından olan Şəki şəhərində anadan olmuş Rəşid bəy Əfəndiyevin ev-muzeyi 1992-ci ildə fəaliyyətə başlamışdır.

R.B.Əfəndiyevin yaşadığı ev-muzey XIX əsrdə yerli inşaat materiallarından inşa edilmiş ikimərtəbəli binadan ibarətdir.



*R.B.Əfəndiyevin ev-muzeyi*





Muzey ikinci mərtəbədə fəaliyyət göstərir.Birinci otaqda R.B.Əfəndiyevin büstü qoyulmuş, yazmış olduğu əsərlər, tərcümələr, illüstrasiyalar, mahir sənətkar fırçasından çıxmış portreti, ikinci otaqda isə ailə üzvlərinin istifadə etdiyi məişət və mətbəx əşyaları nümayiş etdirilir.

Üçüncü otaqda R.B.Əfəndiyevin istifadə etdiyi eynəyi, şəxsi iş dəftəri, möhürü, örtüklü lampa, saat, patefon, rəf boyu düzülmüş kitablar, radioqəbuledici, telefon, masa və oturacaqlar tamaşaçılara nümayiş etdirilir.

## AŞIQ MOLLA CUMA



*XIX* əsrin sonu - XX əsrin əvvəllərində yaşayıb yaratmış aşıq Molla Cuma 1854-cü ildə Şəkidə anadan olub. Molla Cuma özü bu barədə belə deyir: "...Mahalım Göynükdür, şəhərim Şəki, Layisqi kəndinin binasıyam mən." Savadlı olduğu üçün camaat ona "molla" təxəllüsü vermişdi. Molla Cuma geniş dünyagörüşlü, Azərbaycan klassik poeziyasını bilən şair olub. Ərəb və fars dillərini bilib. Erkən yaşından şeir sənətinə, poeziyaya meyl göstərib. O əsasən, qoşma, gəraylı və müxəmməslər yazmışdır.



Molla Cumanın şeirlərinin bir hissəsi 30-cu illərdə toplanaraq "Aşıqlar" kitabında dərc edilib. 1966, 1983 və 1995-ci illərdə aşığın üç kitabı çap olunub. Molla Cumanın bir neçə saz havası da məlumdur: "Şəki dübeyti", "Molla Cuma gözəlləməsi", "Molla Cuma gəraylısı", "Molla Cuma müxəmməsi".

Molla Cuma 1918-20-ci illərdə Azərbaycan Xalq Cümhuriyyətinin fəal tərəfdarlarından olub. Həmin dövrdə Qarabağda, Zəngəzurda erməni quldurları dinc azərbaycanlı əhaliyə divan tutarkən, bütün bölgələrdən Milli Orduya kömək üçün könüllü dəstələr yaradılırdı. Belə dəstələrdən birini də Şəkidə aşıq Molla Cuma və onun əmisi uşaqları yaratmışdı. 1920-ci ilin mayında, Azərbaycanın Sovetlər tərəfindən işğalından sonra bolşeviklərin həyata keçirdiyi repressiyada aşığın bütün qohumları həbs edilir. Bu haqsızlıq şairə təsir edir, ömrünün ixtiyar çağında o çox sarsılır... Repressiyadan qurtula bilməyən Molla Cuma 1920-ci ilin iyununda xaincəsinə öldürülür. Aşıq çiynində saz Laysqıdan çıxıb başqa kəndə məclisə gedərkən yolda XI «Qırmızı ordu»nun erməni əsgərləri onun qarşısını kəsir və güllələyir...



Molla Cuma incə zövqlü, yüksək təbli lirik şair idi. Elinin yaxşı-yamanını tanıyan, qəlbini-könlünü oxuyan və hal-əhvalını bilən sənətkar kimi lazımi sözləri seçib incələməyi gözəl bacarıb. Hələ həyatının gənclik çağlarında mömin bir ailənin qızına vurulub, lakin istəklisinə qovuşa bilməyib. Nakam məhəbbəti ömrünün sonuna kimi unutmayıb. İsmi Pünhan ləqəbi ilə sevdiyi xanımı daim vəsf edib.

**İsmi Pünhan, neçün məndən küsübsən,**
**Yaxşı-yaman ya bir ola, ya iki.**
**Bu gün ölsəm hamı deyər hayıfdır,**
**Canı yanan ya bir ola, ya iki.**

**Sən şöləsən, dörd yanında fanaram,**
**Bülbülünəm, gülşənindən kənaram,**
**Hər məclisdə od tutuban yanaram,**
**Dərdim qanan ya bir ola, ya iki.**

**Hilal qaşa nə lazımdır ol sürmə,**
**Meyli qırıb məndən yüzün çevirmə,**
**Cuma deyər: hər yetənə sirr vermə,**
**Dost mehriban ya bir ola, ya iki.**



## SALMAN MÜMTAZ



Görkəmli ədəbiyyatşünas-alim Salman Mümtaz 1884-cü ildə Şəkidə dünyaya gəlib. İki yaşında olarkən anası Zəhra xanımla birlikdə Aşqabada köçür və Azərbaycanda Xalq Cümhuriyyəti qurulana qədər orada yaşayır. Balaca Salman qardaşları ilə birlikdə dayılarına ticarət işlərində kömək edir.

İlk təhsilini mollaxanada alan Salman uşaqlıqdan çox zəkalı idi, qabiliyyəti, xüsusi istedadı ilə seçilirdi. O, ərəb, fars, rus, urdu, özbək, qırğız dillərini öyrənmişdi. Ədəbiyyata böyük marağı vardı. Təsadüfi deyil ki, hələ gənc ikən "Molla Nəsrəddin" jurnalında "Xortdan bəy", "Sərçəqulu bəy" və s. imzalarla müxtəlif şeirləri çap olunurdu. Klassiklərimiz haqqında yazdığı analitik məqalələri hələ o zaman diqqəti çəkirdi.

1918-ci ildə Ənvər və Nuru paşaların Azərbaycana gəlişinə şeir həsr edir. Bu şeirlə də Salman Mümtaz sonradan ona vurulacaq "panturkizm" damğasının qurbanına çevrilir. Baxmayaraq ki, sovet dövründə Azərnəşrdə, EA-nın tarix, dil və ədəbiyyat İnstitutunda

elmi işçi kimi çalışırdı və bəlkə də bir neçə dil bildiyinə görə hələ ki ona toxunulmurdu, ancaq 1937-ci ildə repressiyanın dəhşətli küləyi minlərlə ziyalımız kimi, onun da başı üzərində əsdi. Onu "burjua-millətçi", "pantürkist" kimi əvvəlcə işindən uzaqlaşdırır və ev dustağı edirlər. Amma işdən çıxarılmasına baxmayaraq, Salman bəy nadir əlyazmaları, kitabları toplayıb araşdırmaqda davam edirdi. Və heç şübhəsiz ki, bu onun Azərbaycan ədəbiyyatı qarşısında ən böyük xidməti idi. Bu xidmətə bütün ömrünü həsr etmişdi görkəmli yazıçı topladığı çoxsaylı əlyazma məxəzlərini «Kitabxaneyi-Mümtaziyyə» adlı kitabxanasında yerləşdirdi.

Amma «Erməni fitnəsi» hər yerdə özünü göstərirdi. O dövrdə Azərbaycanın 51 rayonundan 31-nin "Xalq Daxili İşlər Komissarlığı" rayon şöbələrinin rəisi erməni idi. Təkcə 1937-ci ildə "xalq düşməni" adı ilə 29 min ziyalımız güllələndi. Hüseyn Cavid, Mikayıl Müşfiq, Yusif Vəzir Çəmənzəminli, Əli Nəzmi, Əhməd Cavad... və b. o illərin repressiya qurbanları arasında idi.

Nəhayət, Salman Mümtazı da 1937-ci il oktyabrın 8-də gecə saatlarında yaşadığı Buynakski (indiki Şeyx Şamil küçəsi) ev 25 ünvanında həbs edib barəsində ölüm hökmü çıxarırlar. Ağır zindan həyatından, işgəncə və əzab-əziyyətlərdən sonra, 1941-ci il dekabrın 21-də hökm icra olunur.

Ölümündən sonra - 1956-cı il noyabrın 16-da Salman Mümtaza bəraət verilib.

İndi Respublika Milli Arxiv İdarəsi Salman Mümtazın adını daşıyır.



## ELİN BƏXTİYAR OĞLU

### BƏXTİYAR VAHABZADƏ



Gözəl Şəki təbiətinin yetirdiyi istedadlı şəxslərdən biri də alovlu vətənpərvər, filoloq-alim və pedaqoq, qələmi ilə xalqı daim azadlıq və müstəqillik uğrunda mübarizələrə ruhlandırmış Azərbaycanın xalq şairi Bəxtiyar Vahabzadədir.

Vahabzadə Bəxtiyar Mahmud oğlu (16 avqust,1925 – 13 fevral, 2009) - şair, dramaturq, ədəbiyyatşünas, filologiya elmləri doktoru (1964), professor, Azərbaycanın xalq şairi (1984), Azərbaycan MEA-nın həqiqi üzvü (2000), Əməkdar incəsənət xadimi (1974), Azərbaycan Dövlət mükafatı laureatı (1976), SSRİ Dövlət Mükafatı laureatı (1984), M.F.Axundov adına ədəbi mükafatın laureatı (1988), Azərbaycan Respublikası Ali Sovetinin deputatı (1990), millət vəkili (1995, 2000).

Bəxtiyar Vahabzadə 1925-ci ildə Şəki şəhərində fəhlə ailəsində anadan olmuşdur. Kiçik yaşlarından

ailəliklə Bakıya köçmüşlər (1934). Burada orta məktəbi qurtarandan sonra ADU-nun filologiya fakültəsində təhsil almışdır (1942-1947). "Səməd Vurğunun lirikası" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir (1951). Bədii yaradıcılığa 1943-cü ildə "Ana və şəkil" adlı ilk şeirini çap etdirməklə başlamışdır. "Mənim dostlarım" adlı ilk kitabından başlayaraq, onun şeir və poemalarında, mənzum pyeslərində müasir dövrün problemləri lirik-fəlsəfi planda, əlvan boyalarla təsvir edilir. Pyesləri dəfələrlə ölkə və dünya teatrlarında tamaşaya qoyulmuşdur.





B.Vahabzadə 1964-cü ildə "Səməd Vurğunun həyat və yaradıcılığı" mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş, BDU-nun professoru olmuşdur.

Azərbaycan MEA-nın müxbir üzvü (1980), sonra həqiqi üzvü (2000) seçilmişdir. 1981-ci ildə SSRİ Yazıçılarının VII qurultayında SSRİ Yazıçılar İttifaqı İH-nin üzvü seçilmişdir. Ədəbi prosesin yorulmaz təbliğatçısı və təşkilatçısı idi. X çağırış Azərbaycan Ali Sovetinə, 1995 və 2000-ci illərdə isə Azərbaycan Milli Məclisinə deputat seçilmişdir. 1976-cı ildə "Leninlə söhbət" və "Muğam" poemalarına görə Azərbaycan Dövlət mükafatına layiq görülmüşdür. "Qırmızı Əmək Bayrağı" və "İstiqlal" (1995) ordenləri ilə təltif olunmuşdur.

Bəxtiyar Vahabzadə 60-cı illərdən başlayan mili azadlıq hərəkatının öncüllərindən idi. O, 1959-cu ildə yazdığı "Gülüstan" poeması ilə iki yerə parçalanmış Azərbaycanın tarixi faciəsini dilə gətirmiş, rus və fars imperiyasının pəncəsi altında, inləyən Azərbaycan xalqının azadlıq və istiqlal uğrundakı ədalətli mübarizəsinə qoşulmuşdur.

Bu poemaya görə 1962-ci ildə şair "millətçi" damğası ilə Azərbaycan Dövlət Universitetindən çıxarılmış, yalnız 2 ildən sonra işə bərpa edilmişdir. Sovet rejimində milli varlığı tapdanan, hər cür məhrumiyyətlərə məruz qalan millətin dərdlərini rəmzlər və müxtəlif ədəbi üsullarla ifadə etmiş, iri həcmli poemaları və pyeslərində millətinin dərdlərini dilə gətirmişdir. Birbaşa Sovet diktaturasını ifşa edən əsərlərini isə şair, Sovet İttifaqı dağılandan sonra "Sandıqdan səslər" başlığı altında nəşr etdirmişdir. B.Vahabzadə 70-dən artıq şeir kitabının, 2 monoqrafiyanın, 11 elmi publisist kitabın və yüzlərlə məqalənin, eləcə də tarixi və müasir mövzuda 20-dən artıq iri həcmli poemanın müəllifidir. Şairin əsərləri dünyanın bir çox dillərinə tərcümə edilmişdir.

Bəxtiyar Vahabzadə 2009-cu il fevralın 13-də, 84 yaşında uzun sürən xəstəlikdən sonra Bakıda vəfat etmişdir.







# MƏŞHUR KOMEDİOQRAF

## SABİT RƏHMAN



Şəkinin məşhur qələm sahiblərindən biri olan dramaturq Sabit Rəhman 1910-cu il mart ayının 26-da Şəki şəhərinin qədim Ağvanlar məhəlləsində anadan olmuşdur. O, ilk təhsilini burada almış, uşaqlıq və gənclik illərini də Şəkidə keçirmişdir.

Şəkililərin baməzə danışıqlarından, deyimlərindən, hazırcavablığından, duzlu, məzəli lətifələrindən bəhrələnən S.Rəhman tezliklə Azərbaycanın məşhur komedioqrafı kimi tanınmışdır.

İndi Sabit Rəhmanın Şəkidəki ev-muzeyi bura gələnləri təbəssümlə qarşılayır. Muzey arxitektura baxımından çox yaraşıqlı ikimərtəbəli binada yerləşir. Muzeydə 460-a yaxın eksponat toplanmışdır. Böyük ekspozisiya zalında S.Rəhmanın müxtəlif vaxtlarda istifadə etdiyi şəxsi əşyalar, yazıb-yaratdığı masa, uşaqlıq və gənclik illərində çaldığı royal nümayiş etdirilir.

Otağın üst hissəsində gözəl naxışlarla işlənmiş buxarı, böyük divar sobası otağı daha da zənginləşdirir.

Lektoriya otağında S.Rəhmanın oğlu məşhur bəstəkar, 600-dən çox mahnının müəllifi Emin Sabitoğluna aid eksponatlar nümayiş etdirilir. Beləliklə, muzeyə gələn qonaqlar iki böyük sənətkarın həyat və yaradıcılığı ilə tanış olurlar.






*Sabit Rəhmanın ev-muzeyi*



## ZİRVƏDƏKİLƏR

Bərəkətli Şəki torpağının yetirdiyi məşhur şəxsiyyətlərdən biri - Azərbaycan Xalq Cümhuriyyətinin qurucularından olan, ölkənin ilk Baş naziri - **Fətəli Xan Xoyski** nəinki doğulduğu torpağın, ümumən Azərbaycanın, bütün xalqımızın fəxr etdiyi görkəmli şəxsiyyətlərdəndir.

İmperiyadan qurtulduqdan sonra dövlət müstəqilliyi bərpa olunmuş Azərbaycan Respublikası hökumətinin tərkibində uzun illər gərgin və səmərəli fəaliyyəti ilə seçilən Baş nazirin müavini **Abid Şərifov**, Ədliyyə naziri **Fikrət Məmmədov** və b. sanki öz klassik həmyerlilərinin başladığı dövlət quruculuğu yolları ilə inamla irəliləyərək özlərini vətənə, xalqa xidmət işinə həsr etmişlər.

Şəkinin məşhur şəxslərindən söz düşəndə heç şübhəsiz böyük elm fədailəri olan akademiklər, Azərbaycan MEA Ədəbiyyat İnstitutunun direktoru, professor **Yaşar Qarayevin**, EA Tarix İnstitutunun direktoru, millət vəkili, professor **Yaqub Mahmudovun**, istedadlı heykəltəraş, Bakıdakı Nizami, Səməd Vurğun, Mehdi Hüseynazdə heykəllərinin müəllifi, xalq rəssamı **Fuad Əbdürrəhmanovun**, dahi kinorejissor, Dövlət mükafatı laureatı, xalq artisti **Rasim Ocaqovun** da adları həmişə hörmətlə çəkilir.



F.X.Xoyski



A.Şərifov



Y.Mahmudov



Y.Qarayev



F.Əbdürrəhmanov



R.Ocaqov



# ABİD ŞƏRİFOV



Abid Qoca oğlu Şərifov 1940-cı il yanvarın 6-da Şəki şəhərində anadan olmuşdur.

1957-ci ildə Şəki şəhər 10 saylı orta məktəbini bitirib. Həmin il Azərbaycan Dövlət Politexnik İnstitutuna daxil olmuş, 1962-ci ildə oranı "İnşaat mühəndisi" ixtisası üzrə bitirmişdir. Gənc mütəxəssis kimi "Bakıbaştikinti" idarəsinə təyinat alan Abid Şərifov 2 saylı trestin 25 nömrəli tikinti idarəsində tikinti ustası vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1971-ci ildən "Bakısosialmədəntikinti" trestində, 1972-ci ildə "Bakıbaştikinti" idarəsində çalışıb. 1978-ci ildən Azərbayjan SSR Nazirlər Sovetinin əsaslı tikinti şöbəsində böyük referent vəzifəsində işləmişdir. 1980-ci ildə SSRİ Nəqliyyat və tikinti nazirliyinin "Azərnəqliyyattikinti" trestinin rəisi vəzifəsinə təyin olunmuşdur. 1980-87-ci illərdə A.Şərifovun rəhbərlik etdiyi trestin kollektivi Azərbayjan KP MK-nın (indiki Prezident Aparatının), Milli Təhlükə-

sizlik Nazirliyinin yeni inzibati binalarının inşasında və ölkə iqtisadiyyatı üçün mühüm əhəmiyyəti olan bir sıra obyektlərin tikintisində də çalışmışdır. 1988-ci ildə "Azərnəqliyyatyoltikinti" Layihə-Sənaye Tikinti Birliyinin rəisi vəzifəsinə təyin edilmişdir.

A.Şərifov 1990-cı ildə SSRİ Nəqliyyat Nazirliyi tərəfindən Türkiyə Cümhuriyyətinə ezam olunmuşdur. Qardaş Türkiyədə öhdəsinə düşən vəzifəni layiqincə yerinə yetirib 1992-ci ildə vətənə qayıdan A.Şərifov 1993-1995-ci illərdə "Azərnəqliyyatyoltikinti" Dövlət Şirkətinin prezidenti kimi fəaliyyətini davam etdirmişdir.



1995-ci ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Fərmanı ilə Abid Qoca oğlu Şərifov Azərbaycan Respublikası Baş nazirinin müavini vəzifəsinə təyin olunmuşdur.

Bu vəzifədə çox böyük məsuliyyət və gərginliklə çalışan A.Şərifov müstəqil Azərbaycan Respublikasında gedən nəhəng tikinti-quruculuq işlərində daha da yaxından iştirak etməyə başlamış, inşaat sənayesinə, nəqliyyat, rabitə, kommunal təsərrüfatı və regionların inkişafı sahələrinə rəhbərliyi yüksək peşəkarlıq və bacarıqla həyata keçirmişdir.

Bacarıqlı mütəxəssis və dövlət xadimi olan Abid Şərifov Azərbaycan Respublikası Prezidentinin Fərman və Sərəncamları ilə bir neçə Dövlət Komissiyalarına başçılıq edir.

Abid Şərifovun zəhməti dövlət tərəfindən yüksək qiymətləndirilmiş, o "Şərəf nişanı" və "Oktyabr inqilabı" ordenləri ilə təltif edilmiş, SSSR-nin "Fəxri nəqliyyat işçisi", Azərbaycanın "Əməkdar inşaatçısı" fəxri adlarına layiq görülmüşdür.

## FİKRƏT MƏMMƏDOV



Fikrət Məmmədov 1955-ci ildə Bakı şəhərində anadan olub. O, 1977-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin hüquq fakültəsini, 1989-cu ildə Bakı Ali Partiya Məktəbini bitirmişdir.

Əmək fəaliyyətinə 1977-ci ildə rayon prokurorunun köməkçisi kimi başlamış, Bakı şəhər və Respublika prokurorluqlarında, sonra isə Azərbaycan KP MK İnzibati orqanlar şöbəsində çalışmışdır.

1994-2000-ci illərdə Baş prokurorun müavini olmuşdur.

2000-ci ilin aprel ayında Azərbaycan Respublikasının Ədliyyə naziri təyin edilmişdir.

Azərbaycan Respublikasının ədliyyə orqanlarında xidmətlərinə görə "Şöhrət" ordeni ilə təltif edilmişdir. I dərəcəli Dövlət ədliyyə müşaviri, Prokurorluğun fəxri işçisidir.



## ZİYA YUSİFZADƏ



Ziya Yusifzadə 1929-cu ildə Şəkidə anadan olub.

Uzun illər Dövlət Təhlükəsizliyi sistemində çalışan Ziya Yusifzadə 1977-ci ildə general-mayor, 1984-cü ildə general-leytenant hərbi rütbəsi alıb.

1980-ci ildən 1988-ci ilə qədər Azərbaycan SSR Dövlət Təhlükəsizliyi Komitəsinin sədri işləyib.

1999-cu ilin iyunundan Milli Təhlükəsizlik Nazirliyi Akademiyasının rəisidir. 2004-cü ildə «Azərbaycan Bayrağı» ordeni ilə təltif edilib.

2009-cu ildə Azərbaycan prezidenti İlham Əliyev anadan olmasının 80 illiyi münasibətilə Milli Təhlükəsizlik Nazirliyi Akademiyasının rəisi Ziya Yusifzadənin "Şöhrət" ordeni ilə təltif edilməsi barədə Sərəncam imzalayıb.

## PYOTR BABAYEV



Pyotr Babayev 1883-cü il iyunun 10-da Rusiyanın Ryazan qurbeniyasının kiçik Kasimovo qəsəbəsində doğulub. Atası Hakim Babayev vaxtilə Azərbaycanın Nuxa qəzasında fəhlə iğtişaşlarının təşkilatçısı kimi həbs edilərək, bu ucqar əyalətə sürgün olunmuşdu. Vətənindən uzaqlarda yaşamağa məcbur olan qaradinməz, zəhmli kişi yerli zavodların birində fəhlə işləyirdi. Tale onu Lyubov Qriqoryevna ilə rastlaşdıranda, bu sadə, təvazökar və zəhmətkeş qızcığaz nabələd cənublu ilə ömrünü paylaşmaqdan çəkinmədi. Onlar ailə qurdular və birlikdə 8 uşaq böyüdüb boya-başa çatdırdılar.



Hakim kişi mütərəqqi baxışlı insan olduğundan uşaqlarının təhsil almasını istəyirdi. Lakin kasıbçılıq buna imkan vermədi. Atası balaca Pyotru gimnaziyanın 4-cü sinfindən çıxarıb zavodda şəyird işinə qoymalı oldu.

Gənc Pyotr Babayev zavodda inqilabi hərəkata qoşuldu, haqsızlığa qarşı amansız mübarizəyə qalxdı. Çar məmurları bu təhlükəli sosial-demokratı susdurmaq üçün həbs edərək karserə salmaqdan başqa yol görmədilər. Və uzun müddət nəmli kamerada ağır şəraitdə saxlanmaq gənc Pyotrun səhhətinə sarsıdıcı zərbə vurdu.

Sonra Pyotru həbsdən çıxarıb Uzaq Şərqə, Rus-Yapon müharibəsinə göndərdilər. Orada Pyotr mərdliklə vuruşub Vətəni qorudu. Və hərbi xidməti bitirib birbaşa doğulduğu Kasimovoya qayıtdı. Nataliya Kuznesova ilə evləndi. Moskvaya köçüb Sokolniki tramvay parkında çilingər işlədi... Çarizm heç cür ipə-sapa yatmayan bu azərbaycanlıdan canını qurtarmaq üçün 1914-cü ildə yenidən onu hərbi xidmətə çağırıb cəbhəyə göndərdi. Ancaq iki il sonra səhhətinə görə geri qaytardılar.

...Oktyabr inqilabını Pyotr Sankt-Peterburqdakı hərbi zavodda qarşıladı. 1918-ci ildə almanlar cəbhəni yarıb sürətlə irəliləyəndə isə Sovet Rusiyasının hərbi komissarı N.Podvoyski şəxsən özü Pyotr Babayevi xidmətə dəvət edib cəbhəyə yardıma göndərdi.

Müharibədən sonra Pyotr Babayev fəhlələr arasında qazandığı böyük hörmətə və nüfuzuna görə Sokolnikidən

deputat seçildi, sonra raykom katibi kürsüsünə yüksəldi. Lakin ömrü boyu çəkdiyi əzab-əziyyət, gərgin iş, aclıq və səhhətində yaranmış ciddi problemlər onun daha geniş fəaliyyət göstərməyinə mane olurdu. Xüsusən, çarizmə qarşı mübarizə illərində türmələrdə və cəbhələrdə "qazandığı" ağır tuberkulyoz onu haldan salmışdı. Yataq xəstəsinə çevrilən Pyotr daha işə çıxa bilmirdi.

...Nəhayət, uzun sürən ağır xəstəlikdən sonra 1920-ci il aprelin 25-də Pyotr Hakim oğlu Babayev 37 yaşında dünyasını dəyişir...



Bu gün Moskvada, Sankt-Peterburqda, Ryazan, Tambov və s. kimi bir çox Rusiya vilayətlərində müəssisələr, küçə və parklar əslən şəkili olan Pyotr Babayevin adını daşıyır. 1922-ci ildə keçmiş Abrikosovski Karamel Fabrikinə Pyotr Babayevin adı verilib. "Babayev Konditer konserni" adlanan həmin şirniyyat müəssisəsi indi nəhəng Səhmdar Cəmiyyətə çevrilib, öz keyfiyyətli konfet-şokolad məhsulları ilə bütün dünyada tanınır.

Doğma diyarda da onun xatirəsi əbədiləşdirilmiş, Şəkinin "Yuxarı Baş" Tarix-Memarlıq Qoruğu ərazisində P.Babayevin adına park salınmış və büstü qoyulmuşdur.

## ŞƏKİLİ HƏRBÇİLƏR

Əslən Şəkidən olan məşhur adamların içərisində hərbçilərin də xüsusi yeri var. Keçmiş SSRİ silahlı qüvvələrində general-polkovnik rütbəsinədək yüksələn Tofiq Ağahüseynovun, generallar Məmmədşərif Həmidovun, Səlahəddin Kazımovun, habelə faşizmlə mübarizədə Fransa qəhrəmanı olmuş "De Qoll Əhmədiyyə" ləqəbi daşıyan - Əhmədiyyə Cəbrayılovun adları Azərbaycan xalqının yaddaşında əbədilik qazanmışdır.

Bu hərbçilərlə yanaşı başqa bir tanınmış şəkili zabit haqqında isə hələlik az sayda insanların məlumatı vardır. Çünki həmin zabit taleyin hökmü ilə doğma diyardan çox uzaqlarda fəaliyyət göstərmişdir. Ancaq o da türk torpaqlarında və türk xalqının azadlığı naminə şərəflə qulluq etmişdir. Bu hərbçi - Mehmet Nuri Bərközdür.

Şəkidə doğulub boya-başa çatan Mehmet Nuri Bərköz sonralar Türkiyəyə köçmüş və orada hərbi xidmətə daxil olaraq general-polkovnik rütbəsinədək yüksəlmişdir. Atatürk ordusunun qurulmasında, TC Silahlı Qüvvələrinin inkişafında Şəkili igid Mehmet Nurinin də xidmətləri həmişə türk xalqı tərəfindən hörmətlə anılır.



1915-ci ildə böyük Türk sərkərdəsi Mustafa Kamal Paşa Atatürkün apardığı Qurtuluş Savaşında iştirak edən peşəkar hərbçi Mehmet Nuri həm Osmanlı imperiyası

dönəmində, həm də Cümhuriyyət zamanında Türkiyə Silahlı Qüvvələrində 1951-ci ilə qədər xidmətdə olub.

Maraqlıdır ki, Mehmetin kiçik qardaşı Mahmud da hərbçi olmuş və Türkiyə Silahlı Qüvvələrində Ordu generalı rütbəsinədək şərəflə qulluq keçmişdir.

Hesab edirik ki, şəkili hərbçi-generalların həyat və fəaliyyəti ayrıca bir tədqiqat kitabının mövzusu ola bilər.









## TOFİQ AĞAHÜSEYNOV



Tofiq Yaqub oğlu Ağahüseynov 1923-cü ildə Şəkidə anadan olub. O, 1941-ci ildə ordu sıralarına çağrılıb. 1942-ci ildə Bakı Artilleriya Məktəbini bitirib Arxangelskdə Hava Hücumundan Müdafiə (HHM) qoşunlarında xidmət edib. İkinci Dünya müharibəsində 1-ci Belorusiya cəbhəsində faşizmə qarşı vuruşmuşdur. Əlahiddə zenit artilleriyası divizionunda qərargah rəisinin köməkçisi kimi Visla-Oder və Berlin əməliyyatlarında iştirak etmişdir.

Müharibədən sonra T. Ağahüseynov HHM hissələrində qulluq etmişdir. O, diviziya, alay və ordu birləşmələrinin komandanı olmuşdur. 1972-ci ildə general-leytenant olan Tofiq Ağahüseynov 1975-ci ildən Bakı HHM Dairəsi komandanının 1-ci müavini işləyib. İstedadlı hərbi xadim sonralar general-polkovnik rütbəsi almışdır. T. Ağahüseynov qüsursuz xidmətə görə orden və medallarla təltif edilmişdir.

## MƏMMƏDŞƏRİF HƏMİDOV



Məmmədşərif Həbibulla oğlu Həmidov 1917-ci ildə Şəkidə anadan olmuşdur. İbtidai məktəbi bitirdikdən sonra, 12 yaşında ipək fabrikində işə girmiş, eyni zamanda texniki-peşə məktəbində təhsilini davam etdirmişdir.

1940-cı ildə ordu sıralarına çağrılan M.Həmidov müharibdə vzvod komandiri, batalyon qərargahının rəisi, diviziya bölm rəisinin köməkçisi olmudur. 1945-ci ildə Ali Hərbi Məktəbi bitirdikdən sonra M.Həmidov Xaçmaz rayon hərbi komissarı və Respublika Hərbi Komis-sarlığında şöbə müdiri işləyib. Eyni zamanda BDU-nun Tarix fakültəsində oxuyub.

O, 1960-69-cu illərd Azərbaycanın hərbi komissarı olub. Müxtəlif orden-medallarla təltif edilən M.Həmidov 1962-ci ildə general-mayor rütbəsi almışdır. Görkəmli hərbçi 1969-cu il fevralın 14-də xidməti vəzifəsini yerinə yetirərkən faciəli surətdə həlak olmuşdur.



## ƏFSANƏVİ XARQO
## ƏHMƏDİYYƏ CƏBRAYILOV



Əhmədiyyə Cəbrayılov 22 sentyabr 1920-ci ildə Şəki rayonunun Oxud kəndində anadan olmuşdur. II Dünya Müharibəsi illərində partizanlara qoşularaq, Fransa Müqavimət hərəkatının iştirakçısı olmuş, "Ahmed Mişel", "Rus Ahmed", "Xarqo" və b. adlarla Fransanın azadlığı uğrunda döyüşlərdə iştirak etmişdir. Fransanın orden və medalları ilə, o cümlədən Fəxri Legion ordeni ilə təltif olunmuşdur.

1935-ci ildə Şəkidə Kənd təsərrüfatı texnikumunun Zootexnika və aqronomiya fakültəsinə daxil olub, 1938-ci ildə buranı Aqronom ixtisası üzrə bitirmişdir. Sonrakı illərdə Quba-Qusar-Xaçmaz-Dəvəçi-Yalama rayonları zonasında ipəkçi kimi işləyib.

...1941-ci ildə Böyük Vətən Müharibəsinin başlanması ilə könüllü olaraq cəbhəyə yollanan Əhmədiyyə Orconikidze diyarında aviasiya məktəbində hazırlıq keçir, kiçik leytenant rütbəsi ilə Moskva yaxınlığında yerləşən 35-ci divizionun 350-ci bombardmançı eskadriliyasına texniki xidmətçi təyin olunur.

1942-ci ilin aprelində 350-ci polkun siyasi rəhbərinin köməkçisi kimi Ukraynanın Donbas şəhərinə göndərilir. Bu polkun tərkibində Ukrayna uğrunda döyüşlərdə iştirak edib, baş leytenant rütbəsi alır.

1942-ci ilin aprel-may aylarında onun təyyarəsi Kursk ətrafında vurulur. Şimali Donetskdə İzyum çayının yaxınlığında ağır yaralanır və almanlara əsir düşür. Lvovdakı həbs düşərgəyə göndərilir. İlk dəfə 1943-cü ildə Daxau həbs düşərgəsindən qaçmağa cəhd edir. Lakin almanlar yenidən onu tutub Fransanın cənubuna, Tuluza yaxınlığındakı Montoban həbs düşərgəsinə göndərirlər. Burada o, vərəm xəstəliyinə tutulandan sonra, 1943-cü ildə həbsxana komendantının qulluqçusu madam Jannanın köməyi ilə fransız vətənpərvərləri tərəfindən tabuta qoyulub Jannanın evindəki zirzəmiyə aparılır. Jannanın qayğısı sayəsində burada sağalan Əhmədiyyə faşistlərdən qisas almaq üçün partizanlarla əlaqəyə girir. Müqavimət hərəkatının 4-cü eskadronun üzvü olur. Əhmədiyyə Cəbrayılov "Xarqo", "Fraji", "Qoçaq", "Rus Armed" və s. gizli ləqəblər altında fəaliyyət göstərir. Almanlar onun başına 10 min alman markası mükafat təyin etmişdilər.



Parisdə general Şarl de Qolla görüşən Xarqo - Əhmədiyyə Cəbrayılov fransa partizanları ilə yanaşı bütün döyüşlərdə iştirak edir. O dəmir yolu xətlərini partladaraq minlərlə fransızın Almaniyadakı həbs düşərgələrinə aparılmasına mane olur. Xarqo körpüləri partladır, alman anbarlarını dağıdır, faşist zabitlərinin yaşadığı yerləri yandırır, düşmən tanklarını sıradan çıxarırdı... Müvəffəqiyyətlə yerinə yetirilən bütün bu təhlükəli əməliyyatlara görə Fransa KP Baş katibi Moris Torez ona şəxsi silah bağışlayır. Fransa Əhmədiyyənin hərbi şücaətlərini layiqincə qiymətləndirir, o Fəxri Legion ordeni ilə, medallarla təltif edilir.

Nəhayət, müharibədən sonar, 1946-cı ildə Əhmədiyyə vətənə qayıtmaq qərarına gəlir. Lakin SSRİ-yə daxil olan kimi ona "vətən xaini" damğası vurulur. Moskvadakı yoxlamalarda mükafatlarının bir hissəsi əlindən alınır. Şəkiyə qayıdan Əhmədiyyə 1947-ci ildə Sürəyya xanımla ailə qurur, 7 övladı dünyaya gəlir.

...1966-cı ildə Fransa prezidenti Şarl de Qoll SSRİ-yə səfəri zamanı Əhmədiyyə Cəbrayılovu görmək istədiyini bildirir. Onu Moskvaya çağırırlar. 1968-ci ildə Sovet hökuməti "vətən xaini" adını onun üstündən götürür və bəraət verir. 1971-ci ildə Əhmədiyyə Cəbrayılov "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif olunur.

1972-ci ildə artıq yaşa dolmuş Əhməddiyyə döyüşlərdə iştirak etdiyi yerləri gəzməyə icazə istəyir. O, Montoban, Rodez, Tuluza, Albi şəhərlərinə gedir, Paris, Bordo, Strasburq, Lion, Dijon və Marseldə olur, keçmiş döyüş yoldaşları ilə görüşür. Fransa Senatında ona xatirə medalı təqdim edilir.



1976-cı ildə II dünya müharibəsindəki iştirakına görə "Oktyabr İnqilabı Ordeni" ilə təltif olunur. 1977-ci ildə Fransa partizan hərəkatında birgə iştirak etdiyi Rene Şambar SSRİ-yə gəlib Əhmədiyyə Cəbrayılovu tapır.

1986-cı ildə Əhmədiyyə Cəbrayılov 5 fransız mükafatına layiq görülür — Müharibə Xaçı, Hərbi şücaət xaçı, Fransa Müqavimət hərəkatı medalı, İgidliyə görə medal və Yaralanmağa görə medal. 1990-cı ildə Şarl de Qollun ana-

dan olmasının 100 illiyinə həsr olunmuş mərasimdə iştirak etmək üçün Parisə dəvət olunur. 1994-cü ildə Əhmədiyyə Cəbrayılova Fransanın Fəxri Legion ordeni təqdim edilir.

...1994-cü il oktyabrın 10-da Şəkidə ağır yol qəzası baş verir. Yük maşını sürətlə telefon budkasına çırpılır. O budkanın içində Əhmədiyyə Cəbrayılov telefonla danışırmış...

Fransa qəhrəmanı doğulduğu Oxud kəndində dəfn edilir.

Lakin onun ölümündən xəbərsiz olan Fransa hökuməti bir il sonra faşizm üzərində qələbənin 50 illiyi münasibətilə əfsanəvi Xarqoya fəxri təqaüd kəsib, ona xatirə medalı göndərmişdi...

Fransanın azadlığı uğrunda döyüşlərdə iştirakına görə 1998-ci ildə Fransa Müqavimət hərəkatının könüllü döyüşçüsü Əhmədiyyə Cəbrayılova ölümündən sonra Minnətdarlıq Diplomu verilmişdir. Əhmədiyyə Cəbrayılovun döyüş yoldaşı Rene Şambar Şəkiyə gələrək həmin diplomu onun ailəsinə təqdim etdi...



## AKADEMİK QURBAN CƏLİLOV



Qurban Nizaməddin oğlu Cəlilov 1927-ci il oktyabrın 27-da Şəki şəhərində anadan olub.

1945-ci ildə Şəki ş. 10 saylı orta məktəbi bitirib BDU-da fizika-riyaziyyat fakültəsinə daxil olmuş, 1955-ci ildə ali təhsilini başa vurmuşdur. 1950-53-cü illərdə Azərbaycan EA-nın Fizika-Riyaziyyat institunda, sonra isə Moskvada aspiranturada oxumuşdur. 1954-cü ildə fizika-riyaziyyat elmləri namizədi dərəcəsi alaraq, Azərbaycan EA Neft Ekspedisiyasında elmi işçi kimi çalışmışdır.

1964-cü ildə texnika elmləri doktoru alimlik dərcəsi almışdır. 1966-cı ildə ona professor elmi adı verilmişdir. 1972-ci ildə isə Neft, qaz və qazkondensat yataqlarının istismarı ixtisası üzrə AMEA-nın müxbir üzvü seçilmişdir.

1974-88-ci illərdə AMEA-nın Dərin Neft və Qaz Yataqları Problemləri İnstitutunun elmi işlər üzrə direktor müavini və şöbə müdiri vəzifəsində çalışmış, "Yer haqqında Elmlər" bölməsinin akademik-katibinin müavini olmuşdur.

Qurban Cəlilov 1989-cu ildə AMEA-nın həqiqi üzvü seçilmişdir.

## SADIQ SADIQOV



Azərbaycanın Əməkdar iqtisadçısı Sadıq Səməd oğlu Sadıqov 1926-cı ildə Şəkidə anadan olmuşdur.

1944-cü ildə Şəki ş. 1 №-li orta məktəbi bitirərək M.Əzizbəyov adına Azərbaycan Sənaye institutuna daxil olan Sadıq nümunəvi təhsilinə və davranışına görə II kursdan Moskvaya Avtomexanika institutuna göndərilmişdir. Lakin səhhəti ilə əlaqədar o təhsilini yarımçıq qoyaraq Şəkiyə qayıtmalı olur.

1948-ci ildə Sadıq Sadıqov yenidən ali təhsil almaq üçün Azərbaycan Xalq Təsərrüfatı institutunun maliyyə-kredit fakultəsinə daxil olmuşdur. 1952-ci ilə bu institutu fərqlənmə diplomu ilə bitirərək, SSRİ Dövlət Bankının Azərbaycan Respublika Kontorunda işə başlamışdır. 1953-58 –ci illərdə Dövlət Bankının rayon şöbəsində müdir, 1958-61 –ci illərdə həmin Bankın Azərbaycan Respublika Kontorunun şəhər idarəsinin rəisi, 1961-1975 –ci illərdə isə Azərbaycan Respublika Kontorunun müdir müavini vəzifələrində çalışmışdır.



Sadıq Sadıqov 1975-ci ildə SSRİ Tikinti Bankının Azərbaycan Respublika Kontoruna müdir təyin edilmiş, 1987-92 –ci illərdə bu Bankın Azərbaycan filialında sədri olmuşdur.

O, 1992-93-cü illərdə Azərbaycan Milli Bankı Sənaye İnvestisiya Bankında İH-nin sədri vəzifəsində, 1994-cü ildən isə Azərbaycan Sənaye İnvestisiya Səhmdar Kommersiya Bankı İH-nin sədri vəzifələrində işləmişdir.

Sadıq Sadıqov 2005-ci ildə vəfat etmişdir.

## YAŞAR QARAYEV



Yaşar Vahid oğlu Qarayev 1936-cı il martın 5-də Şəki şəhərində sənətkar ailəsində anadan olub. 1946-cı ildə ailəliklə Bakıya köçmüşlər. Burada 31 saylı şəhər orta məktəbini bitirmişdir. ADU-nun filologiya fakültəsində təhsil almışdır (1954-1958). Sonra Azərbaycan EA Nizami adına Dil və Ədəbiyyat İnstitutunda baş laborant, kiçik elmi işçi, baş elmi işçi, nəzriyyə və ədəbi proses şöbəsinin müdiri, institutda direktorun elmi işlər üzrə müavini işləmiş, həmin şöbəyə başçılıq etməklə yanaşı, institutun direktoru vəzifəsində çalışmışdır (1987).

Ədəbi fəaliyyətə 1955-ci ildə "Lenin tərbiyəsi uğrunda" və "Azərbaycan gəncləri" qəzetlərində çıxan ilk ədəbi qeydləri ilə başlamışdır. Bundan sonra müasir ədəbi prosesə, teatr tənqidinə, bədii ədəbiyyatın digər problemlərinə dair elmi-nəzəri məqalələri ilə dövri mətuatda müntəzəm çıxış etmişdir. Məqalə və kitabları "Yaşar", "Q.Yaşar", "Y.Qarayev" imzaları ilə dərc olunmuşdur. Yaşar Qarayev milli ədəbi-bədii fikrin inkişafına güclü təkan verən “Faciə və qəhrəman” (1965), “Tənqid: problemlər, portretlər” (1976), “Poeziya və nəsr” (1979), “Realizm: sənət və həqiqət” (1980), “Mirzə Fətəli Axundov” (1982), “Meyar-şəxsiyyətdir” (1989), “Tarix: Yaxından və uzaqdan” (1996) və s. kitabların müəllifi kimi Azərbaycan mədəniyyəti tarixində əbədi yaşarılıq qazanmış fenomendir.

O, "Ədəbi proses" adlı illik elmi-tənqidi məcmuənin təşəbbüsçüsü, müəlliflərindən biri və məsul redaktoru olmuşdur. M.Qorki adına Dünya Ədəbiyyatı İnstitutunun hazırladığı doqquz cildlik dünya ədəbiyyatı tarixi, "Çoxmillətli Sovet ədəbiyyatı tarixi (inqilaba qədərki dövr)" və Nizami adına Ədəbiyyat İnstitutunun hazırladığı yeddicildlik "Azərbaycan ədəbiyyatı tarixi" monumental əsərlərin müəlliflərindən biridir.

Respublikanın elmi və ədəbi-mədəni inkişafında fəal çalışmış, Dünya ədəbiyyatının inkişaf qanunauyğunluqları problemi üzrə əlaqələndirmə şurasının sədri, ədəbiyyat institutu elmi şurasının sədri, Memarlıq və İncəsənət İnstitutunun, Türkmənistan EA Dil və Ədəbiyyat İnstitutu elmi şurasının, Azərbaycan Dövlət nəşrkomu yanında redaksiya heyətinin, Mədəniyyət Nazirliyinin və "Yazıçı" nəşriyyatının bədii şurasının, "Azərbaycan" və "Ulduz" jurnalı redaksiya heyətinin, "Bilik" Cəmiyyəti rəyasət heyətinin, ensiklopediya elmi redaksiya heyətinin üzvü olmuşdur.

Eyni zamanda SSRİ Yazıçılar İttifaqı rəyasət heyəti yanında tənqid və ədəbiyyatşünaslıq şurasının, M.F.Axundov adına mükafat komissiyasının üzvü idi.

Yaşar Qarayev 2002-ci il avqustun 25-də vəfat etmiş, Fəxri Xiyabanda dəfn olunmuşdur.

## DAHİ KİNO USTASI

## RASİM OCAQOV



Kinorejissor Rasim Mirqasım oğlu Ocaqov 22 noyabr 1933-cü ildə Şəkidə həkim ailəsində anadan olub. Gənclik illərində foto ilə maraqlanıb. Arzusu geoloq olmaq idi. Kinoya gəlişi isə təsadüfən olub. Bir dəfə Şəkiyə sənədli film çəkən qrup gəlir. Bu vaxt fotoqrafiya ilə ciddi məşğul olan Rasim peşəkarların işlərini görmək üçün yanlarına gedir. Möcüzəli kino aləmi onu özünə elə çəkir ki, gənc fotoqraf bu sənəti dərindən öyrənməyi qərara alır.

Orta məktəbi bitirdikdən sonra Moskvaya gedir. ÜDKİ-nun kinooperatorluq fakültəsində (1951-1956) təhsil alır. 1956-cı ildən "Azərbaycanfilm" kinostudiyasında quruluşçu-operator kimi çalışmağa başlayır. Sonralar M.A.Əliyev adına ADİİ-nun rejissorluq fakültəsini də bitirib (1977) kinorejissor olur.



Rasim Ocaqov 1973-cü ildən quruluşçu-rejissor kimi çalışıb. İlk filmi "Qatır Məmməd"dən sonra Rasim Ocaqovun çəkdiyi "Tütək səsi" filmi əsl mənada kinomuzun şedevrlərindən birinə çevrildi. "Tütək səsi" öz orijinal səhnələri, şəkiliş manerası, mövzunun bədii həlli baxımından kinomuza xeyli yeniliklər gətirdi. Ad günü", "Bağlı qapı", "Özgə ömrü", "Park", "Ölsəm bağışla", "Həm ziyarət, həm ticarət" və "İstintaq" filmləri müasirlərimizin dolğun obrazını yaratmaqla bizi ətrafımıza diqqətlə yanaşmağa, cəmiyyətdə baş verən olaylara həssas olmağa çağırır.

Rasim Ocaqov 1990-cı ildən "Ocaq" müstəqil studiyasının rəhbəri olub. Çeçen-İnquş respublikasının (1964) və Azərbaycanın (1967) əməkdar incəsənət xadimi, xalq artisti (1982), Azərbaycanın (1980) və SSRİ-nin (1981) Dövlət mükafatları laureatı Rasim Ocaqov 7 iyul 2006-cı ildə 73 yaşında ürək çatışmazlışından dünyasını dəyişib.





# ELM, TƏHSİL, MAARİF YOLUNDA




Tarixi faktlara nəzər saldıqda aydın görünür ki, Şəkinin əhalisi hər zaman mütərəqqi fikirli, qabaqcıl dünyagörüşü olmuş, həyata ayıq baxışları ilə seçilmişdir. Mübaliğəsiz demək olar ki, şəkililər bütün dövrlərdə elmə, təhsilə, maarifə çox böyük diqqət yetirmiş, bu sahənin inişafı yolunda ölkəmizin ən qabaqcıl bölgələrindən biri olmuşdur.

Hələ yüz illər öncə Azərbaycanın digər bölgələrində olduğu kimi Şəkidə də təhsil ruhanilərin tabeliyində olan mədrəsələrdə, camelərdə, məscidlərdə, yaxud evlərdə tədris edilməklə əsasən ilahiyyət və islami şərtlər şərh olunurdu. Belə ənənəvi məktəblərin və orada oxuyan şagirdlərin sayına görə də Şəki ölkə üzrə öncül yerlərdən birini tuturdu.

...Hələ XIX əsrin əvvəllərində Azərbaycan Rusiya və İran arasında bölündükdən sonra, ölkənin şimal ərazisindəki bəzi qəzalarda, o cümlədən Şəkidə, yeni tipli məktəblər fəaliyyət göstərməyə başladı. 1831-ci ilin dekabr



ayında Şəkidə ilk müasir məktəb açıldı. Dahi mütəfəkkir Mirzə Fətəli Axundzadə də bu məktəbdə oxumuşdur. Burada dərslər əsasən rus dilində aparılırdı. Məktəbin açılmasıda əsas məqsəd Rusiya qayda-qanunlarını əhali arasında təbliğ edən məmurlar, katiblər, tərcüməçilər hazırlamaqdan, ruslaşdırma siyasəti yeritməkdən ibarət olsa da, təhsilin məzmunu və mahiyyəti etibarı ilə o vaxt daha mütərəqqi sayıla bilər. Təhsil alanlar arasında varlıların övladları çoxluq təşkil edirdi. 1833-cü ildə qəza məktəbində oxuyan 29 şagirddən 21-i tacir balalrı idi. 1835-ci ildə təsdiq edilmiş Zaqafqaziya məktəblərinin yeni nizamnaməsinə görə ikisinifli qəza məktəbi üçsinifli məktəbə çevrildi. Artıq rus və Azərbaycan dilləri ilə bərabər tarix, coğrafiya, riyaziyyat barədə ilk məlumatlar verilir, hüsnxətt, rəsm fənləri tədris olunurdu. Lakin çar hökuməti həmin məktəbin saxlanmasına cüzi miqdarda pul ayırdığına görə yerli əhali tədris ocağını saxlamaq üçün özü vəsait toplamağa məcbur olmuşdu. Hətta Şəki sakini Əbdülqaffar bəy Hüseyinov bu məktəbin hesabına 500 manat ödəməklə məktəbin hamisinə çevrilmişdi.

1850-ci ildə şəkililər vəsait toplayaraq xüsusi məktəblər açmaq təşəbbüsünü irəli sürdülər. Yeni təşkil olunan tədris ocaqlarında əsasən ilahiyyat fənləri keçilirdi. 1860-cı illərin islahatı ilə əlaqədar 1877-78-ci dərs ilində Şəki qəza məktəbi daha mütərəqqi tədris planı tərtib etdi. Belə ki, birsinifli şəhər məktəblərində təhsil müddəti iki il, ikisiniflidə – dörd il, üç və dördsiniflidə isə - altı il müəyyənləşdirildi. Amma buna baxmayaraq şəriət dərsləri keçirilən məktəblərdə oxuyanların sayı yenə də çoxluq təşkil

edirdi. 1863-cü ilin məlumatına görə ruhani məktəblərində oxuyanların sayı 1830 nəfər olduğu halda, dünyəvi təhsil alanların sayı cəmi 98 nəfər idi. Öz dövrünün qabaqcıl ziyalılarından olmuş İmam Hacı Məhəmməd Əfəndi, müdərris Hacı Abdulla Əfəndi, Məmmədəmin Şeyxzadə və başqaları came və mədrəsələrdə öz zəmanələrinin mütərəqqi elmini tədris edirdilər.

Qafqaz məktəblərinin 1853-cü il nizamnaməsinə uyğun olaraq, 1884-cü ildə Şəkinin Qoxmuq kəndində rus-tatar (rus-Azərbaycan) məktəbi açıldı. Burada təhsil alan 39 nəfər şagirddən 31-i azərbaycanlı idi. O zaman məktəbdə üç müəllim dərs deyirdi.



**Hacı Məmmədsadıq Əliyev.**

Şəki şəhər məktəbi nəzdində xüsusi musiqi sinfi də yaradılmışdı. 1882-ci ildə bu ixtisas üzrə 25 şagird təhsil alırdı. Xatırladaq ki, belə ixtisaslaşmış sinif ölkəmizdə yalnız Şuşa şəhərində mövcud idi.

Əhali arasında savadsızlığın aradan qaldırılması üçün «Bazar günü» məktəbi və kursları da açılmışdı.

Dərslər məscidlərdə və xüsusi evlərdə tədris edildiyindən Şəkinin məşhur xeyriyyəçisi Hacı Məmmədsadıq



Əliyev 1896-cı ildə öz vəsaiti hesabına məktəb binası tikdirmişdi. Şagirdlərə o dövrün qabaqcıl bilikləri öyrədilirdi.

Yeri gəlmişkən, yaşlı nəslin bir çox nümayəndəsi Hacı Məmmədsadıq Əliyevin nə qədər xeyirxah insan olduğu barədə dönə-dönə danışır, xüsusən onun təmənnasız insan olması ilə bağlı maraqlı məqamları vurğulayırlar: Hacı elan edibmiş ki, ondan maddi yardım istəyənlər idarəyə yox, axşam qaranlıq vaxtı evinə gəlsinlər. Bunun sirri isə onda imiş ki, yardıma gələnlər qapını döyəndə qapını açmağa gedən Hacı əvvəlcə əl çırağını söndürərmiş, kasıbın nə istədiyini dinləyib qapını örtərmiş və yenidən əl çırağını yandırıb evə qalxar, yardım üçün pul götürüb yenidən qapıya yaxınlaşar, çırağı söndürüb pulu verərmiş. Beləliklə, o tam təmənnasız yardım etdiyi üçün gələnin kim olduğunu da görüb tanımazmış...



**Abdullabəy Əfəndiyev.**

Ancaq mövcud şəhər məktəbi orta təhsil vermədiyindən, təhsili davam etdirmək üçün şəkililər övladlarını Bakıya, Gəncəyə və ya Şuşaya göndərməli olurdular.

O dövrdə savadlı müəllimlərə çox böyük ehtiyac duyulurdu. XİX əsrin 90-cı illərində müəllimlik fəaliyyətinə başlayan görkəmli pedaqoq Rəşid bəy Əfəndiyevin kiçik qardaşı Abdulla bəy Əfəndiyev şagirdlərin təlim-tərbiyəsini müasir pedaqoqikanın tələbləri əsasında təşkil edir,

onlarda fanatizmə, cəhalətə qarşı maarifçilik ideyaları aşılayırdı. Abdulla bəy 1899-cu ildə Tiflisdə Aleksandrovski Müəllimlər İnstitutunu bitirmişdi və Şəkinin ilk ali təhsilli müəllimi idi. O, vaxtilə Şəkidə müəllimlik edən «Molla Nəsrəddin» jurnalının banilərindən biri Ömər Faiq Nemanzadə ilə bərabər maarif və mədəniyyətin inkişafı üçün müxtəlif üsullara əl atırdı. Hətta onlar M.F.Axundzadənin «Molla İbrahimxəlil Kimyagər» və «Müsyö Jordan və dərviş Məstəli şah» əsərlərini tamaşaya qoyaraq əldə olunan vəsaiti məktəblərin hesabına keçirmişdilər.



Şəki qəzasının kənd yerlərində də məktəblərin açılması üçün xüsusi təşəbbüs göstərilirdi. Kənd camaatı öz vəsaiti hesabına tədris binası tikməyi, məktəbin saxlanmasını, müəllimlərə məvacib verməyi, mənzil və yanacaqla təmin etməyi öhdələrinə götürürdü. 1883-cü ildə Şəki qəzasının Xaçmaz, Padar və Vəndam, 1884-cü ildə Aşağı Göynük, Qoxmuq, 1887-ci ildə Oğuz, 1890-cı ildə Bumda məktəblərinin əsası qoyuldu.

1897-ci ildə Daşbulaq kəndinin əhalisi məktəb açmaq üçün 3500 manat vəsait toplayaraq inşaat işlərinə başladı. Tezliklə bu təşəbbüsə qəzanın digər kəndləri də qoşuldular.

Şəkidə o zaman bir sıra mədəniyyət ocaqları da fəaliyyət göstərirdi. 1910-cu ildə şəhərdə bir qiraət zalından ibarət kitabxana, 1914-cü ildə isə bir klub, iki kitabxana, dörd xeyriyyə cəmiyyəti var idi..

1917-ci ildə çarizmin devrilməsi ilə əlaqədar Şəki qəzasında məktəblərin əksəriyyəti öz fəaliyyətini dayandırdı. Bu vəziyyəti görən şəkililər geriliyi aradan qaldırmaq üçün şəhərdə «Hürriyyəti-maarif cəmiyyəti» yaratdılar. Tezliklə 11611 manat vəsait toplandı və növbəti ildən qəza məktəbi fəaliyyətini bərpa etdi. Sonra «Hürriyyəti-maarif cəmiyyətinin» təşəbbüsü ilə şəhərin Yuxarıbaş hissəsində qız məktəbi açıldı. Müəllim hazırlığı üçün kurslar təşkil olundu. Kursları bitirən tələbələr məktəbdə dərs demək hüququ qazanırdılar.

Azərbaycanda baş verən aprel çevrilişindən sonra geriliyi və savadsızlığı aradan qaldırmaq məqsədilə 1920-ci ilin may ayında Qəza İnqilab Komitəsi yanında Xalq Maarifi şöbəsi yaradıldı. Azərbaycanın tanınmış ziyalılarından olan, xalqın maariflənməsi yolunda böyük təşkilatçılıq fəaliyyəti ilə seçilən Ələkbər Mahmudov həmin şöbəyə müdir təyin edildi. Qəzada savadsızlığın ləğvi, müəllim kadrlarının yetişdirilməsi, yeni məktəblər şəbəkəsinin genişləndirilməsi üçün səmərəli işlər aparıldı.



Əlbəttə, kütləvi şəkildə xalq maarifinin yüksəldilməsi çətin idi. Çünki məktəb binaları, dərs ləvazımatları və müəllimlər çatışmırdı. Lakin buna rəğmən, 1920-ci ilin oktyabr ayında Şəkidə oğlan və qız seminariyaları açıldı. Onların saxlanılmasına, lazımi avadanlıqla təchiz edilməsinə zəruri maliyyə vəsaiti ayrıldı. Yeni təhsil

müəssisəsinin yaradılmasında əvəzsiz təşkilatçılıq işi görmüş görkəmli maarif xadimi Rəcəb Əfəndiyev seminariyaya direktor təyin edildi.



Rəcəb Əfəndiyev.

Müəllim kadrları hazırlamaq işinə Rəşid bəy Əfəndiyev, Ələkbər Mahmudov, Mahmud Əfəndiyev, Əhməd Bayramzadə kimi təcrübəli maarifçi-pedaqoqlar cəlb edilirdilər. Qəzanın şəhər və kəndlərindən, qonşu rayonlardan seminariyaya çoxlu gənc gəlirdi.

1920-ci ilin sentyabrından seminariyanın nəzdində qızlar üçün 3 aylıq kurs fəaliyyət göstərirdi. Həmin kursa Anabəyim Ağayeva, Zəhra İmamverdiyeva, Asiyabəyim Qasımova kimi gənc qızlar cəlb edilmişdilər.

1920-23-cü illəri Şəkidə xalq maarifinin yenidən təşkili və inkişafı dövrü kimi səciyyələndirmək olar.

Bu dövrdə qızların məktəblərə cəlb olunması işinə geniş fikir verilirdi. 1921-ci ildə müəllimlərdən Seyfi Hüseynov və Səltənət Axundovanın təşəbbüsü ilə Dodu məktəbi nəzdində qızlar üçün şöbə təşkil edilir. Suçma, Böyük Dəhnə, Kiçik Dəhnə məktəblərində qızlar oğlanlarla bir yerdə təhsil alırdılar.



İctimaiyyətçi qadın Gülarə Köylü qızının təşəbbüsü ilə 1920-1922-ci illərdə Baş Göynük kəndində qızlar üçün ayrıca məktəb açılır. Burada bacarıqlı müəllimlərdən S.Xancanov, S.Hacızadə, M.Qazıyev, M.Əfəndiyev, S.Qazıyev dərs deyirdilər. Bu kənddən çoxlu müəllim, mühəndis, alim, heykəltaraş, memar yetişmişdir ki, onlar ilk təhsillərini məhz həmin məktəbdə almışdılar. Məktəbin ilk yerli müəllimlərindən Mabud Əfəndiyev və Mahmud Qazıyev Lenin ordeni ilə təltif edilmişlər.



Gülarə Köylü qızı

Qədimdən öz sənətkarları ilə məşhur olan Şəkidə ənənəvi peşələri davam etdirmək məqsədi ilə 1921-ci ildə respublikada ilk dəfə Veysəl Əfəndi Şəkidə «Nümunə Zəhmət Məktəbi» təşkil etmişdi. Bu təhsil ocağında şagirdlərə papaqçılıq, dərzilik, misgərlik, dülgərlik və s. peşələr öyrədilirdi.

1922-23-cü illərdə Şəki xalq maarifi sahəsində çox böyük irəliləyiş oldu. Şəhərin bir çox yerlərində, habelə kəndlərdə yeddiillik və orta məktəblər açıldı, uşaq evləri təşkil olundu. Milliləşdirilmiş bəzi binalar qaydaya salınaraq məktəblərə çevrilirdi. Əhali pul toplayaraq məktəblərin ehtiyacına xərcləyir, iməcilik yolu ilə sinif otaqları tikirdilər. Doduda tikilən məktəb binasının

inşasında Məmmədəli Cəbrayılov, Əbdüləziz Əliyev və b. yaxından iştirak edirdilər. Qəzada savadsızlığın ləğvi məqsədilə kurslar, fəhlə fakültələri açılırdı.

Şəki Qəza İcraiyyə Komitəsinin 8 fevral 1923-cü il tarixli 6 saylı qərarı ilə qəzada olan bütün xüsusi məktəblər bağlanılır və milli məktəblərin açılması qadağan edilir. Bununla da şagirdlərin dövlət hesabına oxumaları təmin olunur. Ancaq yenə də yerli əhali maarif sisteminin inkişafı naminə əllərindən gələn köməyi əsirgəmirdi. 15 yanvar 1924-cü il tarixli «Şəki fəhləsi» qəzeti yazırdı ki, 2 nömrəli ipəkəyrici fabrikində keçirilən yığıncaqda fəhlələr Qışlaqda məktəb binası tikmək haqqında təşəbbüs qaldırmışlar. Yığıncaq 1000 nəfərlik məktəb binası inşa edilməsi haqqında qərar qəbul edib. Hər fəhlə aylıq əmək haqqının 4%-ni məktəb tikintisinə ayırmağı öhdəsinə götürmüşdür. Bu təşəbbüsə Qışlağın bütün zəhmətkeşləri qoşuldular. Hətta gənclərdən İsmayıl Kərəm oğlu, Həsən Cabbar oğlu, Rəsul Hacıabdul oğlu və b. hər biri 5 çervon verdi.



O vaxt istifadəyə verilən həmin təhsil ocağı indi 11 saylı orta məktəb kimi fəaliyyət göstərir.

Sincan kəndi 90 evdən ibarət idi. Oradakı məktəb yararsız binada yerləşdiyindən bağlanmışdı. 1923-cü ildə kənd camaatı yeni məktəb binası tikmək təşəbbüsü qaldırdı. Onlar öz qüvvələri ilə daş, kirəc, ağac, taxta hazırladılar. Mismar, pəncərə şüşəsi, kirəmit kimi materialları isə lazımi idarələr öz öhdəsinə götürdü. Məktəb həmin il tikilib istifadəyə verildi. Onun inşasında kənd əhli Məmməd Məmmədhüseyn oğlu, Qədir Nəsrullah oğlu, Abdulqədir Əbdürəhman oğlu yaxından iştirak etmişlər.

Maarifin inkişafına yaşlı adamlar da öz köməyini əsirgəmirdilər. Aşağı Göynükdə məktəb binası olmadığından kəndin 80 yaşlı sakini Əhməd Molla Məhəmməd oğlu özünə məxsus evinin 2-ci mərtəbəsini təmənnasız olaraq məktəb üçün istifadəyə vermişdir.

İpəkçiliyin, kənd təsərrüfatının və səhiyyənin inkişafı ilə əlaqədar ixtisaslı gənc kadrlara olan tələbatı nəzərə alaraq, 1923-cü ildə Şəkidə toxuculuq, kənd təsərrüfatı və tibb texnikumları fəaliyyətə başladı. Kəndlərdən və qonşu rayonlardan da bu ixtisas məktəblərində təhsil almağa gələnlərin sayı ilbəil artırdı.

Qəza Xalq Maarif Şöbəsinin səyi ilə fəhlə fakültələri və savad kurslarının açılması daha geniş vüsət alırdı. Hətta qadınlar klubu yanında da savad kursları təşkil edilərək buraya onlarca evdar qadın və qızlar cəlb edilmişdi. Bu yolda maarifpərvər Xanım Mahmudova daha çox fəallıq göstərirdi. Təkcə 1924-cü ildə qəzada 600 nəfər gənc savadsızlığını ləğv etmiş, 320 nəfər ibtidai təhsil almışdı. «Rabfak» adlanan fəhlə fakultəsində zəhmət adamları işdən sonra öz təhsillərini davam etdirirdilər.

Məktəblərin və burada oxuyanların sayı xeyli artmışdı. 1924-cü ildə məktəblərin sayı 63-ə çatdırılmışdı.

Təhsil alan 5378 nəfərdən 1205 nəfəri qızlar idi. 1926-cı ilin sentyabr ayında istifadəyə verilən 7 saylı qızlar məktəbi 1935-ci ildə orta məktəbə çevrildi.

...1920-ci ildə açıldıqdan sonra uğurla fəaliyyət göstərən seminariya da 1925-ci ildə texnikuma çevrildi. Texnikumun məzunları fəaliyyət göstərdikləri məktəblərdə fənləri xüsusi ustalıqla, ilhamla tədris edirdilər. Tezliklə onlar şagirdlərin yol göstərəni, təlimçisi, tərbiyəçisi, qayğıkeşi, mənəvi valideyni kimi tanınmağa başladılar. Sonralar ölkəmizdən çox-çox uzaqlarda məşhurlaşan professorlardan Əbdüləzəl Dəmirçizadə, Mirəli Axundov, Əbdülrəhim Hacızadə, Abuzər Rəsulov, Yusif Əbdülrəhmanov, Heydər Əfəndiyev, Hüseyn Əfəndiyev,



Çingiz Xəlifəzadə, Məmməd Qasımov vaxtilə həmin texnikumun bacarıqlı məzunları kimi çalışmışdılar. Azərbaycan KP MK-nin keçmiş katibi Nazim Hacıyev, Respublika maarif nazirinin keçmiş müavini Əhməd Rəhimov, dramaturq-komedioqraf Sabit Rəhman və b. Şəki Pedaqoji Texnikumunun yetirmələridir. Məşhur xalq şairi Səməd Vurğun da 1926-cı ildə bu texnikumda müəllimlərin ixtisasını artırma kursunda təhsil almışdır. O illərdə «Şəki maralı» adlı şeir də yazmışdır.

1924-25-ci illərdə Xaldan dairəsində yalnız bir məktəb olduğu halda, 1927-28-ci illərdə buranın bütün kəndlərində məktəblər açılmışdı. Məktəblərin inşası çox sürətlə gedirdi. Yalnız 1926-28-ci illərdə Şəki qəzasında 56 məktəb tikilərək istifadəyə verilmişdi. Qəzanın məktəblərində oxuyan şagirdlərin də sayı xeyli artaraq 11000 nəfərə çatmışdı. Bunlardan 1000 nəfəri qızlar idi.

1929-30-cu dərs ilində ipək sənayesini ixtisaslı işçilərlə təmin etmək üçün 120 nəfərlik "FZŞ" məktəbi fəaliyyətə başladı. Təhsil alanlardan 16 nəfəri qızlar idi. Məktəbin ilk məzunu olan Ziyvər Xəlilova uzun illər həmin tədris müəssisəsinin direktoru olmuşdur.

1930-31-ci ildə ölkədə ümumi təhsilə, 1933-34-cü ildə isə 7 illik ümumi icbari təhsilə keçildi. Bu məqsədlə gənclərin təhsilə cəlb edilməsində xüsusi əhəmiyyəti olan axşam və qiyabi məktəblər açıldı. 40-cı illərin sonuna yaxın bütün uşaqların təhsilə cəlb edilməsi işi başa çatdırılmışdı.

1934-cü ildən Şəkidə ədəbiyyat, riyaziyyat, təbiət fənləri üzrə qiyabi fakültələr fəaliyyət göstərirdi. 1939-40-cı tədris ilində Şəkidə Müəllimlər İnstitutu açılır. İnstitutda ədəbiyyat, fizika-riyaziyyat, tarix, biologiya fakültələri fəaliyyət göstərirdi. Respublikamızın tanınmış alimlərindən Əbdüləzəl Dəmirçizadə, Əhməd Rəhimli, Hüseyn Əfəndiyev və başqaları orada dərs deyirdilər. İnstitutun rəhbəri maarifpərvər, fəal ictimaiyyətçi Rəsul Rəsullu idi.



1941-ci ildə müəllimlərin böyük əksəriyyətinin cəbhəyə getməsi ilə əlaqədar, institutun tələbələri onları əvəz edirdilər.

Tələbələr təhsil almaqla yanaşı, eyni zamanda müəllimlik fəaliyyəti ilə də məşğul olurdular. Beləliklə,

Şəkinin maarif ocaqları müharibənin ağır illərində də öz işini davam etdirirdi.

1954-cü ilə qədər fəaliyyət göstərən institutdan rayonun və qonşu regionların məktəblərinə yüzlərlə müəllim hazırlanıb göndərilmişdi. Artıq Şəki ölkənin ixtisaslı müəllim kadrlara olan tələbatını təmin etməkdə aparıcı mövqe tuturdu...

İndi Şəkidə Azərbaycan Milli Elmlər Akademiyasının Şəki Regional Elmi Bazası, Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı, tibb, pedaqoji, musiqi və texnologiya texnikumları, Əkinçilik İnstitutunun Şəki dayaq məntəqəsi və digər təhsil və elm idarələri fəaliyyət göstərir.



# MƏŞHUR 10 №-Lİ MƏKTƏB



*10 №-li məktəbin ilk buraxılışı*
*(7 may 1926-cı il)*

**1898**-ci ildə Hacı Əbdürrəhim Ağa öz hesabına şəhərin mərkəzində yerləşən Cümə məscidinin həyətində ikimərtəbəli məktəb binası tikdirərək onun üçün lazım olan avadanlıqları aldı. Məktəb hündür və işıqlı sinif otaqlarına, nümunəvi səliqə-səhmana və sinif mebellərinə malik idi. Həmin ildə bu binada yeni rus-tatar (rus-Azərbaycan) məktəbi fəaliyyət göstərməyə başladı. Müasir tipli məktəbin açılması qısa müddət ərzində əhalinin rəğbətini qazanır.

Məktəbi bitirənlərin bir hissəsi təhsillərini davam etdirmək üçün Tiflisə, Qoriyə, Rusiyanın şəhərlərinə gedirdilər...

Ancaq 1920-ci ildən sonra məktəbin fəaliyyəti dayandırılır. Yaşlı nəslin söylədiklərinə görə burada həmin ildən yeni tipli 10 saylı məktəb fəaliyyətə başlayır. Əldə edilmiş mənbələr bunu bir daha təsdiq edir. Belə ki, Nuxa qəzası İcraiyyə Komitəsi Rəyasət Heyətinin 27 sentyabr 1924-cü il tarixli iclasında şəhərdəki 3, 6, 10, 11 və 12 saylı məktəblərin təcili təmir olunub başa çatdırılması haqqında qərar qəbul olunur.

Qurban Abbasovun əmək kitabçasında, kadrların şəxsi uçot vərəqəsində və tərcümeyi-halında 1926-cı ildə



Şəki Pedaqoji Məktəbini bitirib, şəhər 10 saylı ibtidai məktəbdə iki tədris ili (1926-27 və 1927-28-ci illər) işlədiyi qeyd edilib. Eyni zamanda Məmməd Rəşidov tərcümeyi-halında 1932-ci ildə 10 nömrəli məktəbi bitirdiyini göstərir.

İstanbulda ali təhsil almış Şəki şəhər sakini Mustafayev Məmməd Hacı Mustafa oğlu, Yusif Məmmədov, Qurban Abbasov və başqaları məktəbin ilk müəllimləri olmuşlar.

Bütün bu deyilənlərə və məktəbin ilk buraxılışının 1926-cı ildə çəkilmiş fotoşəklinə əsasən 10 saylı məktəbin 1920-ci ildə fəaliyyətə başlaması qənaətinə gəlmək olar.

Şəhərin mərkəzində yerləşən bu təhsil ocağına oxumağa gələnlərin çoxluq təşkil etməsi və binanın darısqallığı yeni məktəb binasının tikilməsini zəruri edirdi. Nəhayət, Nuxa şəhər Soveti Rəyasət Heyətinin 17 fevral 1936-cı il tarixli qərarında oxuyuruq:

**«Xalq Maarif Komissarlığının «Nuxa şəhərində on illik məktəb binasının tikintisi üçün torpaq sahəsinin ayrılması haqqında» teleqrammı əsas götürülərək qərara alındı: Keçmiş kolxoz bazarının şimal-şərq tərəfindən on illik məktəb tikintisi üçün aşağıdakı sərhədlər daxilində torpaq sahəsi ayrılsın:**

**Şimaldan – 89,0 metr, xüsusi tikintilərlə yanaşı; Şərqdən – 106,0 metr, Dəyirman arxı çayından; Cənubdan – 73,0 metr (boş sahə); Qərbdən – 92,0 metr (boş sahə). Ümumi sahəsi: 0,80 ha.**

**Bu sahə özünün yerləşməsinə, ölçülərinə və tərəflərinə görə tam uyğundur.»**

Həmin qərarda proletar yazıçısı M.Qorkinin adının əbədiləşdirilməsi məqsədilə Nuxa şəhərindəki yeni onillik məktəbə onun adının verilməsi də qeyd olunmuşdur.

Üçmərtəbəli, geniş, işıqlı otaqları, bina boyu dəhlizləri, gül-çiçəkli həyəti olan məktəb 1937-ci ildə tikilib istifadəyə verilir. Yeni maarif ocağı hər cür lazımi tədris avadanlıqları ilə təchiz edilir. Müasir təhsilin tələblərinə cavab verən fənn kabinələri yaradılır, zəngin kitabxana, idman zalı, tibb məntəqəsi, bufet-çayxana kollektivin istifadəsinə verilir. Dərslər qabaqcıl ixtisaslı, fədakar müəllimlər tərəfindən tədris olunurdu.



Yeni bina istifadəyə verildikdən sonra Əsmayə Məmmədova (1937-43), Luizə Əfəndiyeva (1944), Seyfi Hüseynov (1944-51), Hüseyn Salehov (1951), Qədir Əhmədov (1951-57), Hüseyn Rəsulov (1957-75), Zəkiyyə Mehdiyeva (1975-77), Məmmədnuru Yusifov (1977-82), Niyazi Əsgərov (1982-2005), Elxan Abdullayev (2005-2011) 10 saylı orta məktəbin direktoru vəzifəsində çalışmışlar. 2011-ci ildən məktəbə "Respublikanın Qabaqcıl Təhsil işçisi" Abid Yusifov rəhbərlik edir.

1950-55-ci illərdə məktəb üçün ayrılan istifadəsiz qalmış Ədil xanın bağında sınaq-təcrübə sahəsi yaradılaraq nadir bitkilər, gül növləri əkilib becərilirdi. Əldə edilmiş uğurlu nəticələrə görə məktəb iki dəfə Ümumittifaq Xalq Təsərrüfatı Nailiyyətləri sərgisinin medalına və pul mükafatına layiq görülmüşdür.

Müəllimlər elmi metodiki ədəbiyyatla təchiz edilirdi. Məktəbdə tez-tez açıq dərslər keçirilir, gənc müəllimlərə faydalı məsləhətlər verilir, qabaqcıl pedaqoqların iş təcrübəsi öyrənilərək fənlərin tədrisində tətbiq olunurdu.

1950-60-cı illərdə böyük nailiyyətlər əldə edən bu təhsil müəssisəsi artıq respublikamızda qabaqcıl maarif ocağı kimi tanınırdı. Öz həyatlarını xalq təhsilinin inkişafına həsr edən, əməkləri dövlət tərəfindən yüksək qiymətləndirilən - «Qabaqcıl Maarif Xadimi», «Lenin», «Qırmızı Bayraq», «Qırmızı Əmək Bayrağı» ordenli, «Qırmızı Ulduz» döş nişanlı Qədir Əhmədov, «SSRİ Maarif əlaçısı», «Qabaqcıl Maarif Xadimi», «Lenin» ordenli Rza Cəlilov, «Lenin» ordenli, «Miçurin» medallı, Respublikanın əməkdar müəllimi Seyfi Hüseynov, «Qabaqcıl Maarif Xadimi», «Qırmızı Əmək Bayrağı» ordenli Mustafa Mustafayev, Respublikanın əməkdar müəllmləri Hüseyn Rəsulov, Məmməd Allahyarov, «Azərbaycanın Maarif əlaçısı» Məmməd Rəşidov, «Qırmızı Əmək Bayrağı» ordenli Mustafa Cabbarzadə, «Qabaqcıl Maarif Xadimi» Əhəd Qədirov və başqaları bu məktəbdə şagirdlərin təlim-tərbiyəsində fədakarlıqla çalışırdılar.



Bu müəllimlərdən dərs alan məzunlar hər zaman onları haqlı olaraq «ustadımız, istinadgahımız, fərəhimiz,

inamımız, sevincimiz, mənəvi dayağımız...» deyə xatırlayırlar.

Təəssüflər olsun ki, bu dəyərli insanlar dünyasını dəyişmişlər. Allah onlara rəhmət eləsin, ruhları şad olsun!

10 saylı məktəbin məzunları Moskva, Leninqrad, Kiyev, Minsk, Odessa və digər şəhərlərdəki tanınmış ali məktəblərdə oxuyurdular. Öz fəaliyyəti müddətində yüzlərlə alim, dövlət xadimi, ədib, müəllim, həkim, mühəndis, aqronom, geoloq və s. hazırlanmasında məktəb müəllimlərinin fədakar əməyi danılmazdır. **Azərbaycan Respublikası Baş nazirinin müavini Abid Şərifov, sabiq Azərbaycan SSR Neft Sənayesi naziri Bəxtiyar Məmmədov, sabiq Rabitə naziri Nadir Əhmədov, Moskva Ekologiya və Təbiətdən İstifadə Beynəlxalq Akademiyasının həqiqi üzvü Edison Salehli, elmlər doktorları Rasim Hacıyev, Aydın Əhmədov, Zəkəriyyə Əlizadə, Qeysər Xəlilov, İbrahim Məmmədov, Məmməd Adilov, Vaqif Mövlazadə, Nazim Mustafayev, Fərman Hacıyev, Qüdrət Əbdülsəlimzadə, onlarla elmlər namizədi orta təhsillərini bu məktəbdə almışlar.**



Şəkililər haqlı olaraq qəlbi ali duyğularla çırpınan belə ziyalılarla fəxr edirlər.

1992-ci ildən Azərbaycanın maarifpərvər ziyalısı, yazıçısı, dramaturq, publisist, etnoqraf Rəşid bəy Əfəndiyevin adını daşıyan 10 saylı məktəb bu gün də öz ənənələrini davam etdirir. Bu təhsil ocağı indi hər il min nəfərədək şagird kontingenti ilə dərsə başlayır. Bu şagirdlərin tərbiyəsi ilə 200-dək müəllim və tərbiyəçi məşğul olur. Onların 110 nəfəri ali, 67 nəfəri orta ixtisas təhsillidir. Heyət arasında «Baş müəllim», «Metodist müəllim» adına layiq görülmüş, «Ali kateqoriyalı müəllim» ixtisas kateqoriyası almış müəllimlər var.

Bu məktəbin məzunlarının bir çoxu ali məktəbə qəbul imtahanlarında 600 baldan yüksək nəticə göstərmiş, Prezident təqaüdünə layiq görülmüşlər. Məzunlar arasında hərbi məktəblərə qəbul olmaq, şərəfli zabit peşəsinə yiyələnmək istəyənlər də çoxdur.

İndi məktəbin pedaqoji kollektivi əsasən gənclərdən və orta nəslin nümayəndələrindən ibarətdir. Onlar zəngin keçmişə malik doğma məktəbin adını, şərəfini daim yüksək tutur, onun şanlı ənənələrini davam etdirirlər.





*10 №-li məktəb bu gün*

# MÜƏLLİMLƏR

## SEYFULLA HÜSEYİNOV



*1896*-cı ildə Nuxa (Şəki) şəhərində anadan olmuşdur. İbtidai məktəbdə təhsil alıb. 1917-ci ildə iki aylıq müəllimlər kursunda müdavim olduqdan sonra 9 saylı məktəbə direktor və müəllim tə'yin edilir. O, 1921-ci ildə məktəbin nəzdində Qızlar Şöbəsinin açılmasına müvəffəq olur. Bu müddət ərzində Seyfulla müəllim rayonda açılmış "Savadsızlığın ləğvi" kursunda da fəhlələrin savadlanması üçün dərslər təşkil edir. Şəhərin 18-ci rayonunda məktəb binasının olmaması gənc müəllimi narahat edir və bu ərazidə ictimaiyyətinköməkliyi ilə yeni məktəb binasının inşa edilməsinə nail olur.

1924-27-ci illərdə Azərbaycan Ali Pedaqoji İnstitutunda təhsil alır və yenidən doğma şəhərinə qayıdır. 1927-ci ildən Nuxa (Şəki) Stalin adına (o dövrdə belə adlanırdı) Pedaqoji



Məktəbinə müəllim tə'yin edilir. 1939-cu ilə qədər Seyfulla müəllimin pedaqoji fəaliyyəti həmin təhsil ocağı ilə bağlı olur. O Pedaqoji Məktəbdə dərs hissə müdriri və direktor vəzifələrində çalışır.

Həmin illərdə bacarıqlı rəhbər Pedməktəbin nəzdində "Məktəbəqədər tərbiyəçilərin hazırlıq" kursunun da açılmasına müvəffəq olnıuşdur. 1936-37-ci illərdə Azərbaycan XTN-nin sistemi üzrə aparılan attestasiya koınissiyasının sədri olan Seyfulla müəllim Nuxa, Qax, Zaqatala, Oğuz və Qəbələ räyon müəllimlərinin attestasiyası işini aparmışdır. Bitib-tükənməyən enerjili müəllim həmin dövrdə elmi-metodik ədəbiyyatınçatışmamazlığı problemi ilə qarşılaşmalı olur. Lakin o, bu sahədə də çıxış yolu tapır. Pedaqoji məktəbin savadlı, bacarıqlı müəllimlərinin köməkliyi ilə bütün fənlərə aid elmi-metodiki ədəbiyyat hazırlanmasına və yerli mətbuatda dərc edilərək çoxaldılmasına nail olur.

Seyfulla müəllinıin 1939-cu ildən 1960-cı ilə qədər olan fəaliyyəti ümumtəhsil məktəbləri ilə bağlıdır. O, 7 saylı orta məktəbdə müəllim, həm də rayon Pedaqoji kabinetində müdir, müharibənin ağır illorində isə Bakı şəhərinin Caparidze və Xətai rayonlarında, Balakən rayonunun Xalatala kəndində dərs hissə ınüdiri və müəllim vəzifələrində çalışmışdır.

1944-59-cu illərdə isə Seyfulla müəllim yenidən doğma şəhərinə qayıdaraq 10 saylı orta məktəbdə direktor və müəllim vəzifələrində çalışmışdır. Böyük təşkilatçılıq qabiliy-

yətinə malik olan bacarıqlı pedaqoqun müəllimlik həyatının ən böyük uğurları da məhz həmin illərlə bağlıdır.

Dərs dediyi şagirdlərlə birlikdə Seyfulla müəllim məktəbin həyatində sınaq-təcrübə sahəsi yaratmışdır. Şagirdlər onlar üçün ayrılmış sahədə və biologiya kabinetində dünyanın ən nadir 75 növ gül-çiçək növünü əkib-becərməyə nail olmuşlar. Sonralar həmin növlərlə məktəbin pedaqoji kollektivi iki dəfə Ümumittifaq Xalq Təsərrüfatı Nailiyyətlori sərgisində iştirak etmiş, sərginin medalına və pul mükafatına layiq görülmüşdür.



S.Hüseynovun arxiv materialları arasında 7 mart 1991-ci il tarixli "Bakı" qəzetində Sabir Gəncəlinin BDU-nun professoru, şərqşünas alim Təhminə xanım Rüstəmova haqqında yazısında onun ali təhsil almasında böyük əməyi olan Seyfulla Hüseynova dərin minnətdarlığını bildirir.

Seyfulla müəllimin xalq maarifı qarşışmda çox böyük xidmətləri var. Bu danılmaz faktdır.

Seyfi müəllim Azərbaycanın əməkdar müəlimidir. Lenin ordeni, Qələbə medalı ilə təltif edilmişdir.

Seyfulla müəllimin ocağının şamını bu gün onun oğlu - şəkililərin sənətinə böyük hörmət etdikləri, bir insan kimi yüksək qiymətləndirdikləri Akif həkim və onun iki oğlu yandırır.

Xalqını, millətini cəhalətdən oyadan, onları əbədi aydınlığa çıxaran Seyfulla Hüseynov xeyirxah əməllərilə əbədiyyata qovuşmuş, doğma torpağında dərin iz qoymuşdur.

## ƏLİHÜSEYİN ƏFƏNDİYEV



**1897**-ci ildə Şəki şəhərində anadan olmuşdur. Tbilisi şəhərində ibtidai təhsil aldıqdan sonra Şəkidə ali-ibtidai məktəbi bitirmişdir. Əlihüseyin Əfəndiyev əmək fəaliyyətinə 1917-ci ildə başlamışdır. 1924-cü illədək teleqrafçı, 1928-ci ilədək həmkarlar ittifaqı komitəsində, şəhər icraiyyə komitəsinin statistika şöbəsinin müdiri vəzifələrində calışmışdır.

1928-1930-cu illərdə Ə. Əfəndiyev Sankt-Peterburq (Leninqrad) Kommunal Akademiyasında oxumuşdur. Sonralar Şəkidə kommunal təsərrüfat şöbəsində su idarəsinin müdiri, Nicdə fındıq zavodunun direktoru, Naxçıvanda Xalq Kommunal Təsərrüfatı Komissarı, daha sonra Şəki şəhər 2 və 5 saylı məktəblərdə müdir vəzifəsində işləmişdir. 1948-ci ildən 1969-cu ilədək Şəki şəhər 10 saylı orta məktəbdə rus dili fənni üzrə müəllimlik etmişdir. Rus dilini mükəmməl bilən Əlihüseyin müəllim, bu fənni bacarıqla tədris edir və şagirdlərinə həvəslə öyrədirdi. O ərəb dilini də çox gözəl bilir və rus dilinə tərcümə etməklə də məşğul olurdu.

Əlihüseyin müəllimin çox zəngin şəxsi kitabxanası vardı. Ən nadir kitadlara, hətta rus və ərəb dillərində qədim əlyazmalarına onun kitabxanasında rast gəlmək olardı. O Şəki şəhər 3 saylı orta məktəbinə öz kitabxanasından 750 kitab bağlamışdı. Ə.Əfəndiyev gözəl ailə başçısı idi. Dörd qızı və bir oğul atası, 10 nəvə babası idi.

Ziyalı ailəsində böyüyən Ə. Əfəndiyev həmişə özünü intizamlı, işgüzar, təvazökar bir insan kimi göstərmiş, ona tapşırılan bütün işlərin öhdəsindən ləyaqətlə gəlmişdir. Onun xidmətləri və pedaqoji fəaliyyəti dövlət tərəfindən layiqincə qiymətləndirilmiş, orden və medallarla təltif olunmuşdur. Ə.Əfəndiyev xalq müəllimi adını daim uca tutmuş, gənc nəslin dərin biliklərə yiyələnməsinə məsuliyyətlə yanaşmışdır. Hündür qamətli, zəhmli ( el arasında ona Bığ Əlihüseyin deyərdilər) həm ailəsində, həm işlədiyi müəssisə və məktəblərdə düzgünlüyü, prinsipiallığı və əsl kişi qüruru ilə seçilən Əlihüseyin müəllim xatirələrdə daim yaşayacaqdır.

Ə. Əfəndiyev 1970-cı ildə vəfat etmişdir.



## MUSTAFA CABBARZADƏ



1903-cü ildə anadan olmuşdur. O, əvvəllər mədrəsə təhsili almış, sonra Nuxa şəhərində (indiki Şəki şəhərində) nümunə-zəhmət məktəbində təhsilini davam etdirmiş, 1920-ci ildən 1923-cü ilədək Nuxa şəhər 6 №-li yeddiillik məktəbdə müəllim işləmişdir. 1923-1926-cı illərdə Azərbaycan Pedoqoji İnstitutunun fizika-riyaziyyat fakültəsində təhsil almışdır.

1926-1927-ci illərdə M.C.Cabbarzadə Nuxa fəhlə fakültəsində, 1927-1931-ci illərdə Nuxa Pedoqoji Texnikumunda müəllim işləmiş, 1931-1933-cü illərdə Nuxa fəhlə fakültəsinin direktoru, 1933-1936-cı illərdə Bakı fəhlə fakültəsinin tədris hissə müdiri və müəllimi vəzifələrində işləmişdir. O, 1936-1943-cü illərdə Bakı elektrorabitə texnikumunun tədris hissə müdiri və müəllimi vəzifələrində çalışmışdır.

M.C.Cabbarzadə 1943-cü ildən 1953-cü ilə qədər Nuxa rayon Maarifi Şöbəsinin müdiri vəzifəsində işləməklə, eyni zamanda, Nuxa şəhər 7 №-li və 10 №-li orta məktəblərdə fizika fənnindən dərs demişdir. O, 1954-cü

ildən ömrünün sonuna qədər – 1963-cü ilə qədər Nuxa İpəkçilik Texnikumunun direktoru vəzifəsində işləmişdir.

Şəki şəhərində xalq maarifinin inkişafında M.C.Cabbarzadənin böyük xidmətləri olmuşdur. O, məktəb və maarif sahəsində uzun müddət və qüsursuz çalışdığına görə keçmiş SSRİ Ali Soveti Rəyasət Heyətinin 12 fevral 1949-cu il tarixli Fərmanı ilə «Qırmızı əmək bayrağı» ordeni ilə təltif edilmişdir.

M.C.Cabbarzadə «Elmi-siyasi bilikləri yayan Cəmiyyət»in (sonralar həmin qurum «Bilik cəmiyyəti» adlandırıldı) rayon şöbəsinin idarə heyətinin üzvü olmuş və keçmiş Sovetlər Birliyində Böyük Vətən müharibəsindən sonrakı illərdə inkişaf etməkdə olan raket texnikası və digər elmi-texniki nailiyyətlərinin aktual məsələləri barədə əmək kollektivlərində, xüsusilə gənclər auditoriyasında, mütəmadi olaraq, maraqlı elmi-kütləvi mühazirələrlə çıxış etmişdir.M.C.Cabbarzadə 1963-cü ildə vəfat etmişdir.



## RZA CƏLİLOV



1906-cı ildə Cənubi Azərbaycanın Təbriz şəhərinin Üsçü kəndində anadan olmuşdur.

1931-ci ilin sentyabr ayında V.İ.Lenin adına Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutuna daxil olmuş və 1934-cü ildə həmin institutun tarix fakultəsini bitirmişdir.

1934-cü ildən 1941-ci ilə qədər İ.V.Stalin adına Şəki Pedaqoji Məktəbində və Kirov adına pedrabfakda müəllim, Şəki rayon Xalq Maarif Şöbəsinin müdiri vəzifələrində çalışmışdır.

1942-ci ildə ordu sıralarına çağırılan R.Cəlilov 1943-cü ildə səhhətinə görə tərxis olunmuşdur.

1949-cu ildən Şəki şəhər 10 saylı oğlanlar məktəbində yuxarı siniflərə tarixdən dərs deyən Rza müəllim 1960-cı ildə oradan təqaüdə çıxmışdır.

1925-ci ildən maarif, Ali məktəb və Elmi idarə işçilərinin həmkarlar ittifaqı Respublika Komitəsinin , 1930-cu ildən Sov.İKP-nin üzvü olmuş ,ictimai işlərdə fəal iştirak etmişdir.

Uzun illər müəllimlik fəaliyyətinə görə bir sıra qiymətli hədiyyələrlə, medal və ordenlərlə mükafatlandırılmışdır.

1957-ci ildə Azərbaycan Maarif Nazirliyinin "Qabaqcıl Maarif Xadimi" adına layiq görülmüş,, 1971-ci ildə " SSRİ maarif əlaçısı" döş nişanı və "Lenin ordeni" ilə təltif edilmişdir.

Rza müəllim 1985-ci ildə vəfat etmişdir.



## QƏDİR ƏHMƏDOV



**1906**-cı ildə anadan olmuşdur. İlk əmək fəaliyyətinə lap kiçik yaşlarından - 1917-ci ildən sahibkarın fabrikində baramadöyən kimi başlamışdır.

1931-ci ildə Ali Pedaqoji Məktəbi bitirmiş və 1933-cü ildən Şəki Pedaqoji Məktəbində müəllim işləməyə başlamışdır. Sonralar Toxuculuq Texnikumunun direktoru, Kənd Təsərrüfatı Texnikumunun müəllimi, fəhlə tibb fakültəsinin dərs hissə müdiri vəzifələrində işləmişdir.

Yüksək intizamı və fəalbğı, işə məsıüyyətlə yanaşması diqqəti cəlb etmiş və rəhbər vəzifələrə irəli çəkilmişdir. 1937-ci ildə Şəki şəhər Siyasi Maarif Evinin müdiri təyin olunmuş, Şəhər Soveti İcraiyyə Komitəsinin sədri, rayon İcraiyyə Komitəsinin sədri, Şəhər Sovetinin sədr müavini vəzifələrində işləmişdir. 1941 - 1947-ci illərdə Sovet ordıısı sıralarında xidmət etmişdir. Berlinə qədər döyüş yolu keçmişdir. Ordudan tərxis olunduqdan sonra Şəki şəhər Partiya Komitəsinin kadrlar üzrə katibi, az sonra ikinci katib təyin olunmuş və 1951-ci ilə qədər bıı vəzifədə çalışmışdır.

1951-ci ildən pedaqoji sahədə fəaliyyətini davam etdirən Q.R.Əhmədov Şəki ş. 10 nömrəli məktəbin direktoru, şəhər Xalq Maarif Şöbəsinin müdiri, məktəbdə tədris hissəsinin müdiri işləmişdir. "Qabaqcıl maarif xadimi" adına layiq görülən Q.Əhmədov Azərbaycan SSR Ali Sovetinin deputatı, şəhər partiya komitəsinin büro üzvü, icraiyyə komitəsinin üzvü kimi Şəki rayonunun mədəni və iqtisadi həyaımda fəal iştirak etmışdir. O, "Lenin ordeni", iki dətə "Qırmızı Ulduz" nişanı, "Qırmızı Bayraq", "Qırmızı Əmək Bayrağı" ordenləri ilə təltif olunmuşdur.

Q.R.Əhmədov 1968-ci ildə dünyasını dəyişmişdir.



## QURBAN ABBASOV



**1908**-ci ildə anadan olmuşdur. Əvvəl mədrəsədə, 1918-ci ildə rus-tatar məktəbində, daha sonra nümunə-zəhmət məktəbində təhsilini davam etdirmiş, Nuxa pedoqoji məktəbinə daxil olmuşdur. 1926-cı ildə, Nuxa şəhər 10 №-li orta məktəbində ibtidai sinif müəllimi kimi, əmək fəaliyyətinə başlamış, 1928-ci ildə isə 9 №-li məktəbin direktoru və müəllimi vəzifələrində işləmişdir.

1929-1932-ci illərdə Q.C.Abbasov Azərbaycan Pedoqoji İnstitutunun kimya-biologiya şöbəsində təhsil almışdır. O, 1932-ci ildə İ.Stalin adına Nuxa pedoqoji məktəbinə müəllim təyin edilmiş, 1939-cu ildə tədris hissə müdiri vəzifəsinə irəli çəkilərək 1941-ci ilə kimi həmin vəzifədə işləmişdir.

1941-ci ilin avqust ayında hərbi səfərbərliyə əsasən Böyük Vətən müharibəsi cəbhəsinə göndərilmiş, Krım, Şimali Qafqaz cəbhələrində 44-cü ordunun 416-cı Taqanroq diviziyasının tərkibində düşmənə qarşı döyüşlərdə, leytenant rütbəsində vzvod komandiri kimi, fəal iştirak etmiş, 1942-ci ilin fevral ayında Kerç uğrunda gedən döyüşlərdə baş nahiyəsindən ağır yaralanmışdır. 18

iyul 1943-cü ildə, II qrup əlil kimi, ordu sıralarından tərxis olunub, əvvəllər işlədiyi Nuxa pedoqoji məktəbinə qayıdaraq, 1952-ci ilə kimi həmin məktəbdə tədris işləri üzrə direktor müavini vəzifəsində işləmişdir.

Q.C.Abbasov 1952-1957-ci illərdə İ.Stalin adına Nuxa pedoqoji məktəbinin direktoru, 1957-1961-ci illərdə 10 №-li orta məktəbin tədris hissə müdiri, 1961-1963-cü illərdə 11 №-li orta məktəbin direktoru vəzifələrində, 1963-cü ilin may ayında şəhər 2 №-li internat-məktəbinə direktor vəzifəsinə təyin edilərək, pensiyaya çıxanadək – 1972-ci ilin sentyabr ayına kimi həmin vəzifədə işləmişdir. O, uzun müddət xalq maarifi sahəsində rəhbər vəzifələrdə işləməsinə baxmayaraq, heç vaxt sevimli müəllimlik peşəsindən uzaqlaşmamış, işlədiyi tədris müəssisələrində fasiləsiz olaraq, zoologiya, anatomiya və Darvnizmin əsasları fənlərini böyük həvəslə tədris etmişdir. Onun rayonda xalq maarifinin inkişafında böyük xidmətləri olmuşdur.



Uzun illər rəhbər vəzifələrdə işləmiş Q.C.Abbasovu hamı olduqca ciddi, prinsipial və qanunpərəst şəxs kimi tanıyırdı. O, rayonun ictimai həyatında da yaxından iştirak etmiş, bir neçə çağırış Nuxa şəhər Xalq Deputatları Sovetinin deputatı seçilmiş, XD Sovetinin təbiəti mühafizə və abadlıq işləri daimi komissiyalarının üzvü kimi, şəhərin yaşıllaşdırılması və abadlaşdırılması işlərində rəhbərlik etdiyi kollektivlə birlikdə yaxından iştirak etmişdir.

Q.C.Abbasov 1950-1955-ci illərdə Nuxa rayon xalq məhkəməsinin iclasçısı seçilərək, həmin illərdə, eyni zamanda, xalq hakimini əvəz edərkən özünün ədalətliliyi və qanunçuluğa sədaqəti ilə xüsusi fərqlənmişdir.

Qocaman maarif işçisi Q.C.Abbasov «1941-1945-ci illər müharibəsi zamanı arxa cəbhədəki fədakar əməyinə görə» və digər bir sıra medallarla təltif edilmişdir. O, rayon ictimaiyyəti arasında böyük nüfuza malik olmuşdur.

Q.C.Abbasov 1973-cü ildə vəfat etmişdir.

## ƏHƏD QƏDİROV



**1908**-ci ildə Nuxada (Şəkidə) anadan olmuşdur. Şəkidə təhsilin inkişafmda və tərəqqisində, əhalinin savadlanmasında böyük örnəyi olan pedaqoqlardan biri də Əhəd Məmmədseyid oğlu Qədirovdur.

Balaca Əhəd gözünü açandan evdə Quran, azan səsləri eşitmişdi. Atası Məmmədseyid kişi dini təhsil almışdı, Quranı sərbəst oxuyurdu. Məhz bu mənada yaşadığı mühitin onun dünyagörüşünə təsiri böyük olmuşdur. İlk əvvəl ərəb əlifbasının qrammatikasını atasından öyrənmiş, sonra isə mollaxana təsili almışdı. Lakin sonralar müəllimlik sənətinə böyük həvəs Əhəd Qədirovu Nuxa Pedaqoji Məktəbinə gətirmişdi. O, məktəbi bitirdikdən sonra bir il Qutqaşen (indiki Qəbələ) rayonunda müəllimlik edir. Lakin fizika-riyaziyyat kimi dəqiq elmlərə maraq göstərən Ə.Qodirov tezliklə müəllimlik fəaliyyətini yarımçıq qoyur və Azərbaycan Dövlət Pedaqoji İnstitutunda təhsil almaq üçün Bakıya gedir. Uğurlu keçən təhsil illərini 1930-



cu ildə başa vuran Əhəd müəllim Nuxa Dövlət İkiillik Müəllinılər İnstitutuna fizika müəllimi tə'yin edilir. Sonrakı illərdə isə Əhəd müəllim 4, 11 saylı məktəblərdə müəllim, 7 saylı məktəbdə dərs hissə müdiri işləyir. 1941-42-ci illərdə ön cəbhədə faşist Almaniyasına qarşı igidliklə vuruşan Ə.Qədirov 1943-cü ildə yaralandığına görə ordudan azad edilir.

Artıq şəhərdə tanınmış, xeyli təcrübə toplamış Əhəd müəllim Şəki Tibb Texnikumuna dərs hissə müdiri tə'yin olunur. Müharibədən sonrakı illərdə əhalinin fıziki cəhətdən zəifliyini, cəbhədən qayıdan yaralılara və əlillərə tibbi xidmətin vacibliyini nəzərə alan gənc pedaqoq burada dərslərin ən optimal variantlarla aparılması üçün əlindən gələni edir. Məktəbin müəllim kollektivi, tələbələr ən çətin məqamda Əhəd müəllimə müraciət edir və ondan lazımi məsləhətlər alırdılar. 1950-ci ildən isə Ə.Qədirov taleyini yenidən 10 saylı orta ınəktəblə bağlamiş olur. Bu məktəbdə o, ən yaxşı pedaqoqlarla çiyin-çiyinə işləyərək, savadlı şagirdlərin hazırlanması işində fəal iştirak edirdi. Müəllimin yetirmələri bu gün elmimizin, təhsilimizin və hətta dövlət məmurlarının ön sıralarında öz gərgin əməkləri ilə fərqlənənlər siyahısındadır. Fərəhli haldır ki, BDU-nun professoru, şərqşünas alim Təhminə Rüstəmova, Baş nazirin. müavini Abid Şərifov da bu siyahıya daxildir.

1970-ci ilə qədər Əhəd Qədirov bu məktəbdə fasiləsiz işləmiş və həmin il səhhəti ilə əlaqədar təqaüdə çıxmışdır.

1975-ci ildə vəfat etnişdir.

## ZÜLEYXA ABDURƏHMANOVA



**1910**-cu ildə Şəki şəhərində anadan olmuş və qızlar seminariyasında təhsil almışdır. V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunu bitirdikdən sonra Şəki şəhəri Pedaqoji Məktəbində 10 il müəllim vəzifəsində işləmiş və şəhərin Dodu və Kiş kəndlərində yaşayan əhalinin kütləvi savadsızlığının ləğvi istiqamətində fəal iştirak etmişdir.

Sonrakı illər ərzində Şəki şəhəri 10 saylı orta məktəbdə botanika və zoologiya fənnləri üzrə müəllimə işləmişdir. Pedaqoji fəaliyyətində əldə etdiyi nailiyyətlərə görə dövlət tərəfindən müxtəlif orden və medallarla təltif edilmişdir.

1993-cü ildə vəfat etmişdir.



## MUSTAFA MUSTAFAYEV



**1910**-cu ildə Nuxa şəhərində sənətkar ailəsində anadan olmuşdur. İlk təhsilini xeyriyyə hesabına idarə olunan Milli Məktəbdə almışdır. 1928-ci ildə Nuxa Pedaqoji Məktəbini bitirərək müəllimlik fəaliyyətinə başlamışdır. Maarif Komissarlığının göndərişi ilə 4 il Qutqaşen (indiki Qəbələ) rayonunun kəndlərində müəllimlik etmişdir. 1933-38-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun "Dil-ədəbiyyat" fakültəsində qiyabi yolla təhsilini davam etdirmişdir. Həmin illərdə rayonun Oxud və Kiş kənd məktəblərinə rəhbərlik etmişdir.

Öikədə müəllim kadrlar;na ciddi ehtiyac duyulduğundan Mustafa müəllim və onun həmkarları tez-tez iş yerlərini dəyişməli olurdular. Onlar Xalq Komissarlığının göstərişi ilə daha vacib sahələrə göndərilir və tezliklə həmin təhsil ocağlarında nizam-intizam yaratmalı, şagirdləri təhsilə cəlb etməli, savadsızlığın aradan qaldırılması üçün kurslar təşkil etməli idilər. Mustafa müəllim də pedaqoji cəbhənin həmin əsgərlərindən idi. Təyin olunduğu bütün vəzifələrdə özünü doğrulda bilirdi. 1938-41-ci illərdə şəhər 2 və 11 saylı

məktəblərində direktor işləyən M.Mustafayev 1941-ci ildə Böyük Vətən müharibəsi cəbhəsinə yola düşdü. Pedaqoji cəbhənin mətin əsgəri hərbi cəbhədə də şücaətlər göstərdi. 1943-cü ildə cəbhədən geri çağırılan Muslafa müəllim yenidən 11 saylı məktəbdə əmək ləaliyyətinə başlayır. Sonrakı illərdə şəhərin 1 saylı internat məktəbində, 10 saylı məktəbdə, Şəki Pedaqoji Məktəbində müxtəlif vəzifələrdə fəaliyyət göstərən M.Mustafayev daima təhsilin qabaqcılları sırasında getmişdir. Rəhbərlik etdiyi pedaqoji kollektivdə daima müəllimlərin yaxın köməkçisi, məsləhətçisi olmuşdur. hissə Dərslərin təhlili zamanı gənc kadrlara dəyərli məsləhətlər verirdi. Pedaqoji Məktəbdə müəllim kadrlarının hazırlanması işinə xüsusi diqqətlə yanaşırdı. Gələcəyin müəllimlərinə dilimizi, ədəbiyyatımızı sevməyi və gələcəyimiz olan şagirdlərə sevdirməyi tövsiyə edirdi. Mustafa Mustafayevin səmərəli pedaqoji fəaliyyəti yüksək qiymətləndirilmişdir. 1954-cü ildə "Qırmızı əmək bayrağı" ordeni, 1962-ci ildə "Qabaqcıl maarif xadimi" döş nişanı ilə təltif edilmişdir. Böyük Vətən müharibəsi cəbhələrində iştirakına görə verilmiş orden və medallar da Mustafa müəllimin şəxsi arxivində saxlanılır.

İstedadlı pedaqoq, bacarıqlı rəhbər artıq uzun illərdir ki, aramızda yoxdur. Onun əziz xatirəsi həmkarlarının, onu tanıyanlarm, şagirdlərinin qəlbində əbədi yaşayır.



## HÜSEYİN SALEHOV



1911-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1936-cı ildə Azərbaycan Pedaqoji İnstitunun fizika-riyaziyyat fakultəsini bitirmişdir. Həmin il Şəki rayonunun Dəhnə kəndindəki natamam orta məktəbə müdir vəzifəsinə təyin olunur və ilk dəfə əlində jurnal sinifə daxil olaraq müəllimlik fəaliyyətinə başlayır.

1941-ci ilin sentyabr ayında Şəkidəki 11 nömrəli məktəbdə direktor müavini işlədiyi zaman hərbi komissarlıqdan göndərilmiş çağırış vərəqəsi alır və səhəri gün cəbhəyə yola düşür. Elə ilk günlərdən Hüseyn müəllim qızğın döyüşlərdə iştirak edir. 1943-cü ilin ilk günlərində qulluq etdiyi hərbi hissənin hücumu zamanı onun yaxınlığında partlayan mərmi qəlpəsindən ağır yaralanır və həmin ilin fevralında ordudan tərxis olunur.

Ordudan qayıtdıqdan sonra Şəki şəhərinin 10 saylı orta məktəbində riyaziyyat müəllimi kimi fəaliyyətə başlamış və ömrünün 29 ilini bu məktəbdə keçirmişdir. Bu illər ərzində o neçə-neçə gəncə həyata vəsiqə vermişdir. Fizika-riyaziyyat elmləri doktoru, professor Qurban Cəlilov, Lomonosov adına Moskva Dövlət Universitetinin müəllimi, fizika-riyaziyyat elmləri namizədi Ramiz Cabbarov, Azərbaycan Pedaqoji İnstitunun müəllimi, fizika-riyaziyyat elmləri namizədi Loğman Abdulkərimov, Gəncə Kənd Təsərrüfatı İnstitunun müəllimi, texnika elmləri namizədi Tərlan Mana-

fov və onlarca başqaları riyaziyyatın sirrlərini məhz ondan öyrənmişlər. Hüseyin müəllimin dərs dediyi şagirdlərin çoxu riyaziyyat və texniki elmlərə meyl göstəriblər. Bunun sirri hər şeydən əvvəl ondadır ki, Hüseyin müəllimin dərsləri həmişə canlı və maraqlı keçərdi. O hər bir mövzunun tədrisinə yaradıcılıqla yanaşar, şagirdlərin dərin bilik almalarına, qazandıqları biliyin daha da möhkəmlənməsinə, məsələ və misal həllində, praktik hesablamalarda onların bacarıqla istifadə etmələrinə nail olurdu.

Hüseyin müəllimin əldə etdiyi bu nailiyyətlər, onun institutda aldığı biliklərlə bərabər, daim öz üzərində çalışmasının, elm və texnika yeniliklərini izləyərək dərindən öyrənməsinin, qabaqcıl riyaziyyatçıların iş təcrübələri ilə daim maraqlanmasının nəticəsində mümkün olmuşdur.

Hüseyin müəllim 1965-ci ildə Bakıya köçür. Əvvəlcə 19, sonra 13 nömrəli məktəbdə, 1967-68-ci dərs ilindən etibarən isə 11 nömrəli məktəbdə çalışmışdır. 60 yaşı tamam olduqda təqaüdə çıxmışdır. O ömrünün 35 ilini yeniyetmələrin təlim-tərbiyəsinə, onların dərin bilik almasına sərf etmiş, şərəfli və mənalı bir həyat yolu keçmişdir.

Hüseyin müəllimin həyat və fəaliyyəti dövlət tərəfində yüksək qiymətləndirilmişdir. "Qafqazın müdafiəsi uğrunda", " 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində Almaniya üzərində qələbə", " 1941-1945-ci illərdə Böyük Vətən müharibəsi dövründə fədakar əməyə görə" və "Əmək-də fərqlənməyə görə" medalları ilə təltif edilmişdir.

Hüseyin müəllim 19 yanvar 1988-ci ildə vəfat etmişdir.

Bu gözəl müəllimin xatirəsi onun çoxsaylı tələbələrinin qəlbində daim yaşayacaqdır.



## MƏMMƏD RƏŞİDOV



**1916**-cı ildə ipəkçi ailəsində anadan olmuşdur. 1932-ci ildə 10 nömrəli orta məktəbi və Şəki Pedaqoji Məktəbini bitirdikdən sonra Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakultəsində təhsilini davam etdirmişdir. 1937-ci ildə oranı bitirib Şəkiyə qayıdır. 1939-cu ilə qədər Şəki Pedaqoji Texnikumunda müəllim və tədris hissəsi üzrə direktor müavini vəzifəsində işləmişdir. 1939-40-cı illərdə hərbi xidmətdə olmuş, 1945-ci ilədək cəbhə bölgələrində vuruşmuş, bir sıra orden və medallarla təltif olunmuşdur.

Müharibə qurtardıqdan sonra ordudan tərxis olunan M.Rəşidov Azərbaycan EA-nin Nizami adına Azərbaycan Ədəbiyyatı Muzeyində Sovet ədəbiyyatı şöbəsinin müdiri vəzifəsində işləmişdir.

1946-cı ildən M.Rəşidov İctimai Elmlər Akademiyasının "Ədəbiyyat tarixi və nəzəriyyəsi" kafedrasının aspiranturasında təhsilini davam etdirmiş, namizədlik dissertasiyası yazmışdır. 1952-ci ildə Şəkiyə qayıtmış, Stalin rejiminin süqutundan sonra Azərbaycan Pedaqoji İnstitutunun fəlsəfə kafedrasında baş müəllim vəzifəsinə bərpa olunmuş və öm-

rünün sonuna qədər orada işləmişdir. 1973-cü ildə müsabiqə yolu ilə kafedranın dosenti vəzifəsinə seçilmişdir. M. Rəşidov bir çox elmi-tənqidi məqalələrin müəllifidir. Onun "M.Qorki və bədii yaradıcılıq məsələləri" adlı monoqrafiyası oxucuların rəğbətini qazanmışdır. Məmməd müəllim respublika mətbuatında mütəmadi olaraq məqalələrlə çıxış edirdi.

M.Rəşidov cəbhə xidmətlərinə görə "Vətən müharibəsi" ordenlərinin bütün dərəcələrinə, "İgidliyə görə" medalına layiq görülmüş, "Azərbaycan maarif əlaçısı" döş nişanı, "Əmək veteranı" medalı ilə təltif edilmişdir.

M.Rəşidov 1988-ci ildə vəfat etmişdir.



## ŞAKİR MƏMMƏDOV



1917-ci ildə Şəki şəhərində kolxozçu ailəsində anadan olmuşdur. Kiçik yaşlarında atasını itirmiş, anasının himayəsində böyümüşdür. Hələ orta məktəbdə oxuyarkən idmana böyük həvəsi olmuş, məşhur idmançıların, pəhləvanların həyat yollarını daim izləmişdir.

1938-ci ildə Bakı Bədən Tərbiyəsi Texnikumuna daxil olmuş, ancaq 1939-cu ildə həqiqi hərbi xidmətə çağırıldığına görə təhsili yarımçıq qalmış, cəbhəyə göndərilərək Finlyandiya ilə müharibədə iştirak etmişdir. II Dünya Müharibəsi illərində Şakir müəllim Şimali Qafqazda, Estoniyada döyüşlərdə iştirak etmiş, bu döyüşlərin birində ağır yaralanmışdır. Müalicə olunduqdan sonra cəbhəyə qayıdır və uzun müddət topçu batalyonunda xidmət edir. Qələbəni Baltik dənizi sahillərində qarşılayır.

1941-1945-ci illərdə orduda nümunəvi xidməti, döyüşlərdə göstərdiyi şücaət dövlət tərəfindən yüksək qiymətləndirilmiş, Ali Baş komandanlığın Fəxri fərmanı, "İgidliyə

görə", "Almaniya üzərində qələbəyə görə" medalları ilə təltif edilmişdir.

1945-ci ildə Ş.Məmmədov ordudan tərxis olunub vətənə qayıdaraq yarımçıq qalmış təhsilini davam etdirir. 1946-cı ildə texnikumu bitirib 10 saylı Şəki şəhər orta məktəbində bədən tərbiyəsi müəllimi kimi fəaliyyətə başlayır. Şakir müəllim 1983-cü ilədək həmin məktəbdə çalışmış, kollektivin dərin hörmət və ehtiramını qazanmış, dəfələrlə şəhər bədən tərbiyəsi və idman komitəsi tərəfindən əla məşqçi, baş hakim, fəal müəllim kimi müxtəlif Fəxri fərmanlarla təltif olunmuşdur.

1984-cü ildə vəfat etmişdir.



## MƏMMƏD ALLAHYAROV



*1918*-ci ildə anadan olmuşdur. Şəkidə ilk təhsilini başa vuraraq 1936-cı ildə Şəki Pedaqoji Məktəbini bitirmişdir. Məktəbi qurtardıqdan sonra Şəki rayonunun Aydınbulaq sovetinin Ağpilləkən kənd məktəbində müəllim və sonra direktor vəzifələrində işləmişdir. Burada işlədiyi dövrdə əldə etdiyi yüksək nailiyyətlərə görə RXMŞ tərəfindən mükafatlandırılmışdır.

1939-cu ildə Ordu sıralarına çağırılmış M.Allahyarov Boyük Vətən müharibəsinin sonunadək döyüşlərdə iştirak etmiş və 1946-cı ildə ordudan tərxis olunmuşdur. Müharibə illərində orduda xidmətlərinə görə müxtəlif medallarla təltif olunmuşdur.

1946-1948-ci illərdə M.F.Axundzadə adına müəllimlər institunun "Rus dili və ədəbiyyatı" fakultəsində oxumuş və həmin fakultəni əla qiymətlərlə başa çatdırmışdır. 1948-ci ildə Şəki şəhər 10 saylı orta məktəbə rus dili müəllimi vəzifəsinə təyinat almış və bu vəzifədə 1958-cu ilədək çalışmışdır. 1959-cu ildə Şəki Pedaqoji Məktəbində rus dili üzrə müəllim işləmişdir. Əməkdə qazandığı nailiyyətlərə görə M.Allahyarov Azərbaican SSR Ali və orta təhsil nazirliyinin Fəxri fərmanı ilə təltif olunmuş, Azərbaycan SSR-nın "Əməkdar müəllimi" adına layiq görülmüşdür.

Məmməd müəllim 1988-ci ildə təqaüdə çıxmış, 1993-cü ildə vəfat etmişdir.

## OSMAN GÜLÜZADƏ



*1919* -cu ildə Şəki şəhərində anadan olmuşdur. 1935-ci ildə Şəki şəhər 7 saylı məktəbi bitirmiş və Şəki Pedaqoji Məktəbinə daxil olmuşdur. 1937-ci ildə həmin məktəbi fərqlənmə diplomu ilə bitirmişdir. 1937-1939-cu illərdə Şəki məktəblərində müəllim vəzifələrində çalışmışdır.

1939-cu ildə Sovet ordusu sıralarına çağırılmış, 1941-ci ildə müharibənin ilk günlərindən topçu alayında kiçik zabit rütbəsində nişançı vəzifəsində döyüşlərdə iştirak etmişdir. Elə 1941-ci ildə ilk döyüşlərdən birində mərmi qəlpəsi ilə yaralanaraq bir qolunu itirmiş və müalicədən sonra ordudan tərxis olunmuşdur.

Ordudan qayıtdıqdan sonra 1943-cü ildə Şəki şəhər Müəllimlər İnstitunun fizika-riyaziyyat fakultəsinə daxil olaraq, oranı bitirmiş və yenidən müəllimlik sənətinə başlamışdır. Ömrünün son illərində Şəki şəhər 10 saylı orta məktəbdə fizika – riyaziyyat fənni üzrə müəllim və tədris hissə müdiri vəzifələrində çalışmışdır.

Müharibədə aldığı yaraların Osman müəllimin səhhətinə dərin təsiri nəticəsində 1958-ci ildə 39 yaşında vəfat etmişdir.



## HÜSEYİN RƏSULOV



*1923*-cü ildə Nuxada anadan olub. 1938-ci ildə yeddillik məktəbi bitirərək, həmin il Pedaqoji Məktəbə daxil olub. 1941-ci ildə təhsilini başa vurduqdan sonra müəllimlik fəaliyyətinə başlayıb. Üç il ordu sıralarında xidmət edib. Cəbhədə aldığı yaraların ağırlığını ömrünün sonuna kimi hiss etmişdir. 1943-45-ci illərdə Nuxa Dövlət İkiillik Müəllimlər İnstitutunda ali təhsil alan Hüseyin Rəsulov həyatının sonuna kimi müəllimlik fəaliyyəti ilə məşğul olmuşdur. Dil-ədəbiyyat müəllimi kimi həmkarları arasında böyük nüfuz qazanmışdır. Şagirdlərə vətənpərvərlik hisslərinin aşılanmasında məqsədyönlü işlər aparmışdır. Böyük Vətən müharibəsinin ağır günlərində arxa cəbhədə insanlarda qələbə əzminin yaradılması, Vətənin müdafiəsi üçün bütün səylərin toplanması, "Hər şey qələbə üçün" şüarı altında insanların öz fəaliyyətlərini tənzimləsi istiqamətində səmərəli işlər görmüşdür.

Otuz ilə yaxın 6 və 10 saylı məktəblərdə dərs hissə müdiri direktor, rayon və şəhər maarif şö'bəbrində müdir vəzifələrində çalışmışdır.

Dəfələrlə rayon və şəhər sovetlərinin deputatı olmuş, Azərbaycan müəllimlərinin III, IV və VI qurultaylarında Şəki müəllimlərini təmsil etmişdir.

İctimai iş-vəzifə onu insanlara, cəmiyyət hadisələrinə daha da yaxınlaşdırmış, o, özünü həmişə ictimai-siyasi işlərin

axarında görmüşdür. Pedaqoji bilikləri yayan Xalq Universitetinin rektoru, Xalq Məhkəməsinin iclascısı, Azərbaycan Könüllü "Qayğı" cəmiyyəti şəhər təşkilatının sədri kimi ictimai vəzifələrdə də fəaliyyətini bilavasitə xalq maarifinin inkişafına yönəltmişdir.

Hüseyin Rəsulovun əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, respubıikanın "Əməkdar müəllimi" və "Qabaqcıl maarif xadimi" kimi fəxri adlara layiq görülmüşdür. O, həmçinin, "Əmək igidliyinə görə", 'Torpağın müdafiəsi uğrunda" medalları ilə də təltif olunmuşdur.

H.Rəsulov bədii yaradıcılıqla da məşğul olurdu. Bir sıra şeirlərin, hekayələrin, komediya və dram əsərlərinin müəllifi idi. Yaxın dostu, həkim Lütfəli Həsənovla birlikdə yazdığı "Bağışla məni, əzizim" adlı dram əsəri Şəki teatrının səhnəsində müvəffəqiyyətlə oynanılmışdır.

Ömür-gün yoldaşı Mina xanım İbrahimova ilə birlikdə dörd övlad böyüdüb tərbiyə etmişlər.

Yaşlı nəslin layiqli nümayəndəsi, gənclərin yaxın məsləhətçisi, fəal ictimaiyyətçi mərhum Hüseyin Rəsulov əvəzsiz pedaqoq, bacarıqlı rəhbər olmaqla yanaşı, həm də qayğıkeş ata idi.



## ZƏRƏFŞAN FƏRƏCZADƏ



*1930*-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1948-ci ildə Azərbaycan Xarici Dillər Instituna daxil olmuşdur. 1953-cü ildə institutu fərqlənmə diplomu ilə bitirmiş və həmin ildən Şəki şəhər 5 saylı orta məktəbdə müəllimlik fəaliyyətinə başlamışdır. 1954 – 1985-ci illər ərzində fasiləsiz olaraq Şəki şəhər 10 saylı orta məktəbində çalışmışdır.

Zərəfşan müəllimə müəllimlik sənətini çox sevirdi. O bu sənətə daim sevgi və vicdanla yanaşmış, işlədiyi kollektivlərdə hərtərəfli hörmətə layiq olmuşdur.

Zərəfşan müəllimə 1994-cü ildə dünyasını dəyişmişdir.

## RƏMZİYƏ RƏSULOVA



**1931**-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1938-c- ildə Şəki şəhər 7 saylı məktəbin 1-ci sinifinə daxil olmuş, 1948-ci ildə həmin məktəbin 10-cu sinifini bitirmişdir.

1949-cu ildə Şəki Dövlət Müəllimlər Institunun təbiət-coğrafiya şöbəsinə daxil olmuş və 1951-ci ildə Təbiət –coğrafiya ixtisası üzrə tam kursu bitirmişdir. Həmin ildə Rəsulova Rəmziyə Lenin adına Azərbaycan Dövlət Pedaqoji institutuna daxil olmuş və 1955-ci ildə coğrafiya ixtisası üzrə həmin institutu bitirmişdir.

1955-ci ilin avqust ayından başlayaraq 1999-cu ilin sentyabr ayınadək Şəki şəhər 10 nömrəli orta məktəbdə coğrafiya fənnini tədris etmişdir.

Əmək fəaliyyəti müddətində dəfələrlə müxtəlif döş nişanları və Fəxri fərmanlarla təltif edilmiş, müəllim adını şərəflə daşımışdır. 1985-ci ildə Maarif nazirinin əmri ilə Rəmziyə xanıma "Müəllim-metodist" adı verilmişdir.

Rəmziyə Rəsulova 12 aprel 2005-ci il tarixdə vəfat etmişdir.



## ZƏKİYƏ MEHDİYEVA



**1932**-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1938-ci ildə Şəki şəhər 10 saylı orta məktəbə daxil olmuş, 7-ci sinifi bitirdikdən sonra Şəki Pedaqoji məktəbinə qəbul edilmişdir. 1950- ci ildə həmin məktəbi fərqlənmə diplomu ilə bitirmişdir. 1950-ci ildə Azərbaycan Dövlət Pedaqoji institutuna daxil olmuş və 1954-cü ildə həmin institutu müvəffəqiyyətlə bitirmişdir.

1954-cü ildə Maarif nazirliyinin əmri ilə Şəki şəhər 10 saylı orta məktəbə riyaziyyat-fizika müəllimi təyin edilir və 1989-cu ilə qədər bu məktəbdə əmək fəaliyyətini davam etdirir.

Əmək fəaliyyəti dövründə ibtidai siniflər üzrə tədris hissə müdiri, məktəb direktorunun müavini, məktəbin direktoru vəzifələrində işləmişdir. İşlədiyi dövrdə yerli komitənin sədri, komsomol təşkilatının katibi və ilk partiya təşkilatının katibi kimi ictimai vəzifələri aparmışdır.

1957-ci ildə Şəki rayon zəhmətkeş deputatları sovetinə deputat seçilmişdir.

Zəkiyə müəllimənin əmək fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilmiş, müxtəlif medal və fəxri fərmanlarla mükafatlandırılmışdır. O məktəbin müəllimlər heyətinin və bütün şagirdlərin hörmət və etiqadını qazanmışdır.

1961-ci ildə ailə həyatı qurmuşdur.3 övladı vardır.

Gözəl pedaqoq və ailə başçısı olan Zəkiyə müəllimə 1992-ci ildə dünyasını dəyişmişdir.



## 1957–ci ilin məzunları:

**ABDULLAYEVA XALİDƏ HACIMƏMMƏD QIZI**
**ABDURƏHMANOVA BİLGEYİS ƏHMƏD QIZI**
**AĞAKİŞİYEVA MAHNUR LÜTVƏLİ QIZI**
**BAĞIYEV KNYAZ DURSUN OĞLU**
**BAĞIYEV SEYFULLA ŞİRƏLİ OĞLU**
**BALAYEV NƏRİMAN İBRAHİMXƏLİL OĞLU**
**BƏŞİROV RAQUB ABBAS OĞLU**
**CABBAROVA NƏZAKƏT ABDURƏŞİD QIZI**
**CƏFƏROV XANLAR HƏTƏM OĞLU**
**CƏLİLOV MƏMMƏD PAŞA OĞLU**
**DAVIDOV TELMAN MƏMMƏDƏLİ OĞLU**
**ƏHMƏDOV AZAD ALLAHYAR OĞLU**
**ƏHMƏDOV FÜZULİ İBRAHİMXƏLİL OĞLU**
**ƏHMƏDOV NADİR ALI OĞLU**
**ƏKBƏROV ƏLƏFSƏR HÜSEYİN OĞLU**
**ƏLİXANOV RAUF ƏLİXAN OĞLU**
**ƏZİZOV ADİL SABİT OĞLU**
**ƏLİYEV NƏSİF YUSİF OĞLU**
**FEYZULLAYEV NƏSİB ZÜBEYİR OĞLU**
**HACIYEV ƏHMƏDİYYƏ ƏYYUB OĞLU**
**HACIYEV İBRAHİMXƏLİL ƏLİ OĞLU**
**HACIYEV NEMƏT HƏMİD OĞLU**

HACIYEV RAMİZ VEYSƏL OĞLU
HACIYEVA SİMUZƏR HÜSEYİN QIZI
HEYDƏROV SANİ İSLAM OĞLU
HƏMİDOV NADİR VAHİD OĞLU
HƏMİDOV VAQİF İSMAYIL OĞLU
HÜSEYİNOV NƏSİR ŞAKİR OĞLU
HÜSEYİNOVA LƏTAFƏT MAHMUD QIZI
XASIYEVA İQLİMƏ HÜSEYİN QIZI
İBRAHİMXƏLİLOVA HUMAYƏ MƏMMƏD QIZI
İLYASOV EMİN ADIŞİRİN OĞLU
İLYASOV NADİR QƏDİR OĞLU
İSAYEV MÜLAHİM ABDULQƏNİ OĞLU
ISMAYILOVA ÇİMNAZ İSMAYIL QIZI
İSMAYILOVA SARİYƏ DAVUD QIZI
İSRAFİLOVA SƏDAQƏT İSMAYIL QIZI
KƏRİMOV AĞALAR AĞAMİ OĞLU
QARAYEV AKİF ƏHMƏDİYYƏ OĞLU
QAZIYEVA OPERA CAHANGİR QIZI
QƏDİROV YAŞAR ABDULLA OĞLU
QƏDİROVA SUDƏ ƏHƏD QIZI
LƏTİFOVA LƏTAFƏT LƏTİF QIZI
MABUDOVA ZİYAFƏT VAHİD QIZI
MEHDİYEVA BİLQEYİS QURBAN QIZI
MEHDİYEVA NİGAR QURBAN QIZI
MƏCİDZADƏ RƏNA İSMAYIL QIZI
MƏMMƏDOV ADİL YUSİF OĞLU



MƏMMƏDOV ŞAHİD NADİR OĞLU
MƏMMƏDOV ŞÜKÜR QURBANƏLİ OĞLU
MƏMMƏDOVA ƏDALƏT ƏHMƏD QIZI
MƏMMƏDOVA KUBRA SALEH QIZI
MƏMMƏDOVA SARA BƏXTİYAR QIZI
MƏMMƏDOVA ŞƏFİQƏ İBRAHİM QIZI
MƏMMƏDZADƏ ZÜLQƏDƏ MƏMMƏD QIZI
MURADOV FURMAN BƏKİR OĞLU
MUSAYEV NEMƏT İSMAYIL OĞLU
MUSTAFAYEV AKİF ABİD OĞLU
MUSTAFAYEV OKTAY YUSİF OĞLU
OSMANOVA BARAT RƏHİM QIZI
RƏHİMOV ROBERT RƏHİM OĞLU
RƏŞİDOVA RƏNA MƏMMƏD QIZI
SALEHLİ EDİSON MİRZƏ OĞLU
SÜLEYMANOVA NURİYƏ ƏLƏŞRƏF QIZI
SULTANOV AKİF ƏNVƏR OĞLU
SULTANOV ARİF ƏNVƏR OĞLU
ŞƏRİFOV ABİD QOCA OĞLU
TEYMUROV AĞALAR ƏBDÜRRƏHİM OĞLU
YUSİFOVA SƏYYARƏ SEYFULLAH QIZI





## ABDULLAYEVA XALİDƏ HACIMƏMMƏD QIZI



Abdullayeva Xalidə Hacıməmməd qızı 1941-ci il may ayının 25-də Qax rayonunda anadan olmuşdur.1957-ci ildə Şəki şəhərinin 10 saylı orta məktəbini bitirmişdir.1963-cü ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun baytarlıq fakultəsini, 1964-cü ildə Leninqrad (indiki Sankt-Peterburq) Kənd Təsərrüfatı İnstitutunda ət-süd məhsullarının baytar-sanitar ekspertizası kursunu bitirmişdir.

1965-ci ildə Azərbaycan Elmi-Tədqiqat Baytarlıq İnstitutunun balıq xəstəlikləri üzrə aspiranturasına daxil olmuş,1971-ci ildə "Kürün aşağı axını boyunca yerləşən göllərdə yaşayan balıqların parazit faunası"na dair namizədlik dissertasiyası müdafiə edərək "Biologiya elmləri namizədi"-alimlik dərəcəsi almışdır. Sonraki illərdə institutda baş, aparıcı elmi işçi vəzifəsində çalışmışdır. Hal-hazırda həmin institutda laboratoriya müdiri vəzifəsində işləyir.

Əmək fəaliyyətinə başladığı dövrdən elmi fəaliyyəti respublikanın təbii və süni su hövzələrində yaşayan müxtəlif növ balıqların arasında qeniş yayılmış xəstəliklərin öyrənilməsinə, onlara qarşı mübarizə tədbirlərinin işlənməsinə həsr olunmuşdur. Eyni zamanda dovşanların xəstəliklərinin

öyrənilməsi üzrə tədqiqat işləri aparmış və onlarla mübarizə üçün tədbirlər planı işləyib hazırlamışdır. 60-dan artıq elmi məqalənin, "Dovşan xəstəliklərinə qarşı mübarizə tədbirləri" nə dair kitabçanın, "Balıq xəstəliklərinin diaqnostikası"adlı metodik vəsaitin, baytar həkiminin sorğu kitabında balıq xəstəlikləri üzrə bölmənin,balıq və balıq məhsullarının baytar-sanitar ekspertizası üzrə materialın, bir neçə təklifin, balıq xəstəliklərinin respublikanın su hövzələrində yayılmasına dair kartoqrammanın müəllifidir.

Evlidir, 2 oğul evladı, 2 nəvəsi vardır.



## ABDURƏHMANOVA (MƏMMƏDOVA) BİLQEYİS ƏHMƏD QIZI



*1935*-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə 10 nömrəli orta məktəbi qurtarmışdır. Həmin ildə ailə həyatı qurmuşdur. 4 övladı, 8 nəvəsi var.

1975-ci ildə Şəki doğum evində kiçik tibb işçisi kimi əmək fəaliyyətinə başlamışdır.

Bilgeyis Əhməd gızının dediklərindən:

"Həyatda öz məgsədimə çatmışam. Övladlarıma, nəvələrimə layigli vətəndaş olmağı, böyüklərə hörmət etməyi, yaxşı insan olmağı tövsiyə edirəm".

2007-ci ildə vəfat etmişdir.

## AĞAKİŞİYEVA MAHNUR LÜTVƏLİ QIZI



*1938* -ci ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. İlk təhsilini Şəki 7 saylı məktəbdə almış, 1954-cü ildən 10 nömrəli məktəbdə davam etdirmiş və 1857-ci ildə həmin məktəbi bitirmişdir. Həmin ildə Şəki Tibb məktəbinə daxil olmuş, 1959-cu ildə məktəbi bitirərək Şəki Uşag xəstəxanasında əmək fəaliyyətinə başlamışdır.

1960-cı ildə ailə həyatı gurmuşdur. 3 övladı, 6 nəvəsi var.

Hazırda Şəki mərkəzi xəstəxanasının Diagnostika şöbəsində işləyir.

## BAĞIYEV KNYAZ DURSUN OĞLU



*1941* -ci ildə 23 may tarixdə Şəki rayonunun Kiş kəndində anadan olmuşdur. Kiş kəndindəki 7 illik məktəbdə oxuduqdan sonra 1954-cü ildə Şəki şəhər 10 nömrəli orta məktəbə daxil olmuş və 1957-ci ildə bu məktəbi bitirmişdir. Həmin ildə Bakı şəhərində Ticarət Texnikumuna daxil olmuş və 1960-cı ildə həmin texnikumu bitirmişdir.

Texnikumu bitirdikdən sonra 5 il ticarət sahəsində fəaliyyət göstərmişdir. Sonra Sumqayıt Kimya Kombinatında maşinist vəzifəsində işləmişdir.

1980-cı ildə Şəki şəhərinə qayıdaraq Şəki İpək kombinatında sex təsərrüfatı rəisi vəzifəsində çalışmışdır.

1999-cu ildən Sumqayıt şəhərinin Corat qəsəbəsində yaşayır. 2003-cü ildən təqaüddədir. Evlidir. Övladları və nəvələri var.

## BAĞIYEV SEYFULLA ŞİRƏLİ OĞLU



5 fevral 1940-cı ildə Şəki şəhərinin Kiş kəndində anadan olmuşdur. 1946-cı ildə Kiş kəndindəki məktəbə qəbul olunmuş, 7-ci sinifi bitirdikdən sonra Şəki şəhər 10 saylı orta məktəbə qəbul olunaraq təhsilini orada davam etdirmişdir. 1957-cı ildə həmin məktəbi bitirmişdir.

1959-1962-ci illərdə Sovet ordusu sıralarında xidmət etmişdir. Xidməti dövründə nümunəvi əskər olduğuna görə dəfələrlə komandanlıq tərəfindən fəxri-fərmanlarla təltif edilmişdir. Hərbi xidməti başa vurduqdan sonra Şəkiyə qayıtmış və Şəki şəhər milis şöbəsində işləmişdir. 1965-ci ildə Bakı Milis məktəbinə daxil olmuş, 1967-ci ildə həmin məktəbi bitirmişdir. 27 il Daxili i.lər orqanlarında qullyq edərək mayor rütbəsinədək yüksəlmişdir.

1969-cu ildə ailə həyatı qurmuşdur. 5 övladı və 9 nəvəsi vardır.

S. Bağıyev 1991-ci ildə vəfat etmişdir.



## BALAYEV NƏRİMAN İBRAHİMXƏLİL O.



3 mart 1940-cı ildə Şəki rayonu Aşağı Göynük kəndində anadan ollmuşdur. 1947-ci ildə Aşağı Göynük kəndinin 1 saylı 7-illik məktəbinə daxil olub oranı bitirmiş, sonra isə Şəki şəhər 10 nömrəli orta məktəbdə təhsilini davam etdirərək və həmin məktəbi 1957-ci ildə bitirmişdir. 1959-1962-ci illərdə orduda hərbi xidmətdə olmuşdur. Ordudan tərxis olunduqdan sonra 1968-ci ildə Az.Pİ-nun axşam şöbəsinin İnşaat fakultəsinə daxil olmuş, 1968-ci ildə həmin fakultəni bitirərək "İnşaat mühəndisi" ixtisası almışdır. 1962-ci ildə Bakı BTİ – nin 6 saylı tikinti idarəsində fəhlə vəzifəsində əmək fəaliyyətinə başlamışdır. İnstitutu bitirdikdən sonra Respublikanin müxtəlif rayonlarında, o cümlədən Balakən, Zakatala, Şəki rayonlarında, iş icraçısı, mühəndis , baş mühəndis, sahə rəisi, idarə rəisi vəzifələrində çalışmışdır. Hazırda Rabitə və İnformasiya Texnologiyaları nazirliyinin RQTTİ-ndə iş icraçısı vəzifəsində çalışır.

Evlidir. Yeddi övladı, səkkiz nəvəsi var.

## BƏŞİROV RAQUB ABBAS OĞLU



11 mart 1939-cu ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər M.Qorki adına 10 saylı məktəbə daxil olmuş, 1957-ci ildə həmin məktəbi bitirmişdir. Həmin il Şəki Toxuculuq Texnikumuna daxil olub, 1958-ci ildə könüllü orduya getmişdir. Orduda radist sənətinə yiyələnib. Hərbi qulluğun 3-cü ilində (1961) sənədlərini Moskva Elektrotexniki Rabitə İnstitutuna (MERİ) göndərmiş və oraya qəbul edildiyi üçün hərbi qulluqdan vaxtından qabaq buraxılmışdır. İnstitutda oxuduğu dövrdə institutun komsomol komitəsinin üzvü olmuşdur. 1966-cı ildə MERİ-nun "Radiorabitə və radio verilişləri" fakultəsini bitirib "Radio mühəndisi" ixtisası almışdır.

İnstitutu bitirdikdən sonra öz xahişi ilə Azərbaycan Respublikasının Rabitə Nazirliyinə təyinat almış, Respublika Radio mərkəzinin 3 saylı radiostansiyasına göndərilmişdir. Orada böyük mühəndis, sex rəisi və radiostansiyanın baş mühəndisi vəzifələrində işləmişdir.

1968-ci ildə Azərbaycan Dövlət Təhlükəsizliyi Komitəsinə müraciət edərək 1969-cu ildə Komitənin "Hökumət rabitəsi bölməsi"nə böyük muhəndis vəzifəsinə qəbul olunub. Sonralar bölmə rəisi, şöbə rəisi və idarə rəisi vəzifələrində çalışıb. AXC-Müsavat iqtidarı respublikada pəhbərliyə gəldikdə müəyyən tələblərlə razilasmadığı üçün 1992-ci



ilin 31 dekabrında təqaüdə çıxarılıb. 1993-cü ilin yanvar ayının 2-də respublikanın Müdafiə Nazirliyinə dəvət olunaraq, aprelin 20-dən " Baş qərargah rəisinin müavini – Rabitə idarəsinin rəisi" vəzifəsinə təyin edilib.

Respublikada rəhbərlik dəyişildikdən sonra 1993-cü ilin noyabr ayında Milli Təhlükəsizlik Nazirliyinin məktubuna əsasən MTN-in sərəncamına keçirilib və keçmiş tutduğu vəzifəyə, "Hökumət rabitəsi idarəsinin rəisi" vəzifəsinə bərpa olunub. 1994-cü ildə təkrarən təqaüdə çıxarılıb. 1995-ci ildə bir daha MTN-nə çağırılaraq əvvəlki vəzifəsinə bərpa olunub. 2001-ci ilin noyabrında polkovnik rütbəsində təqaüdə çıxıb. MN və MTN sistemlərində işlədiyi dövrlərdə Qarabağ uğrunda döyüşlərdə iştirak edib. Müharibə veteranıdır.

Polkovnik R.Bəşirov "Şifrləyici vasitələrin təhlükəsizliyinin təmini və onların Hökumət və Qapalı təsisat rabitəsi sistemlərində istismarı üzrə MDB dövlətləri Koordinasiya Şurası"nın fəxri üzvüdür.

2002-ci ilin fevralından Rabitə Nazirliyinin "Mərkəzi Xüsusi Rabitə İdarəsinin" rəisi vəzifəsində çalışıb.

1971-ci ildə ailə həyatı qurub. İki oğul atası, üç nəvə babasıdır.

**Oğlanları:**Eldar-MTN-də polkovnik-leytenant rutbəsində, Elçin - XİN-də İkinci katib vəzifəsində çalışırlar.

Əmək fəaliyyəti dövründə bir sıra orden və medallarla mükafatlandırılıb:

1. "Şərəf nişanı" ordeni;
2. I, II və III dərəcəli "Qüsursuz xidmətə görə" medalları;
3. I, II və III dərəcəli " Əlaçı sərhədçi" nişani;
4. "Azərbaycan Respublikasının Əməkdar rabitəçisi " fəxri adı;
5. Respublika Ali Sovetinin Fəxri fərmanları;
6. SSRİ və Azərbaycan Respublikası DTK-nin Fəxri fərmanları.

## PEŞƏSİNİN VURĞUNU



Azərbaycan təhlükəsizlik orqanlarında kadr seçiminə bütün dövrlərdə xüsusi həssaslıqla yanaşılıb. Bu orqanda bilik və dünyagörüşü ilə bərabər, peşəkarlıq keyfiyyətlərinə önəm verilib, Təsadüfi deyil ki, bu sahədə çalışan, böyük təcrübəyə malik şəxslərin dəyərli tövsiyələrinə günümüzdə də ehtiyac duyulur. Onların bilik və təcrübəsindən gənc nəsil bu gün də faydalanır. Belə peşəkar kadrlardan biri də polkovnik Raqub Bəşirovdur.



Raqub Abbas oğlu Bəşirov 1939-cu ildə Şəki şəhərində anadan olub, Orta məktəbi bitirdikdən sonra sənədlərini Azərbaycan Neft və Kimya İnstitutuna verir. 4 imtahandan əla qiymət alsa da, sonuncu imtahanda fizika müəllimi ona qeyri-kafi yazır. Şəkidə Raquba dərs deyən fizika müəllimi onun qeyri-kafi qiymət aldığını eşidəndə çox təəccüblənir. Çünki Raqub fizika fənni üzrə onun ən savadlı şagirdi idi. Müəllimi sevimli şagirdinə təsəlli verərək ona kömək edəcəyini deyir. 0, Raqubu Şəkidəki toxuculuq texnikumuna qəbul edir. Gənc yaşında üzləşdiyi bu haqsızlıq Raqubu sarsıtdığından o, hərbi xidmətə getməyi texnikumda oxumaqdan üstün tutur. Hərbi xidmət dövründə nümunəvi, bacarıqlı və savadlı əsgər kimi tanınır. Elə əsgəri xidmətdə olarkən qərara alır ki, Bakıya yalnız ali təhsil aldıqdan sonra qayıdacaq. Hərbi xidmətdən tərxis olunandan sonra o Moskvadakı Elektrotexniki Rabitə İnstitutuna daxil olur və burada təhsülini əla qiymətlərlə başa vurur.

Raqub müəllim o günləri belə xatırlayır: İnstitutu bitirəndən sonra təyinatımı Bakıya, Rabitə Nazirliyinə verdilər. Amma uşaqlıqdan təhlükəsizlik orqanlarında iştəmək arzusundaydım. Ona görə də həmişə çekistlər haqqındakı filmləri maraqla izləyir, bu barədə kitabları mütaliə edirdim. Hələ tələbə olarkən burada işləmək üçün Dövlət Təhlükəsizlik Komitəsinə müraciət etmişdim. O zaman Vitali Krasilnikov sədr müavini idi. Məni qəbul elədi, bir çox suallar verdi, dedi ki, institutu bitir, sonra gələrsən. Mən institutu bittrəndə isə Dövlət Təhlükəsizlik Komitəsinin sədri Ümummilli Lider Heydər Əliyev idi. Onu da qeyd edim ki, Azərbaycanın təhlükəsizlik orqanlarındä qapalı rabitə sistemlərinin yaradılmasında, təkmilləşməsində, inkişaf etməsində Heydər Əliyevin çox böyük rolu olub. Bu sahəni yaratmaqla bərabər, kadr hazırlığına, kadr potensialının artırılmasma xüsusi diqqət yetirib. Rabitə sisteminə gənc, peşəkar mütəxəssislərin cəlb edilməsini, onların iş fəaliyyətini həmişə nəzarətdə saxlayıb.

Polkovnik Raqub Bəşirov işindən çox həvəslə danışır. Onu dinlədikcə dü-şüncələrim baş alıb gedir. Fikirləşirəm ki, öz işinə bu cür sevgi və məsuliyyətlə yanaşan hər kəs hörmətə layiqdir. Və həmin şəxs mütləq öz əməyinin bəhrəsini görəcək, onun sevincini yaşayacaq. İnsanlara, vətənə, xalqa xidmətdən şərəf duyanlar xalqın yaddaşında ədəbi yaşayırlar.



1987-ci ildə məni rəis təyin etdilər. 1992-ci ildə Xalq Cəbhəsi hakimiyyətə gələndə isə çox təzyiqlərlə üzləşdim. Səriştəsiz cəbhəçilər icazəsiz-filansız bütün otaqlara soxulmaq istəyirdilər. Biz buna var gücümüzlə mane olur, onları başa salmağa çalışırdıq ki, bura məxfi idarədir. Elə şeylər var ki, bu barədə yainız l-2 adam məiumatlıdır. Sizin hər kabinetə girməyə ixtiyarınız yoxdur. Çox ağır günlər idi. İllərlə

qurub-yaratdığımız işlər fəlakət qarşısında qalmışdı. Cəbhəçilərlə söhbət aparmaq çox müşkül idi. Savadsız və bacarıqsız adamlardan təşkil olunmuş AXC-çilər heç nəyi başa düşmür, dediklərimizi anlamaq istəmirdilər. Çox mübahisələrdən sonra bu fikirdən əl çəkdilər. Sonralar gördülər ki, onlar deyənə əməl etmirəm, məni işdən uzaqlaşdırdılar. Cəbhəçilər məni işdən çıxarandan sonra Müdafiə Nazirliyinə işə çağrıldım. Burada general vəzifəsinə təyin edilsəm də özümü təhlükəsizlik orqanlarndan kənar hiss edə bümirdim. Xoşbəxtlikdən bir il sonra isə Heydər Əliyev yenidən hakimiyyətə qayıtdı və məni öz işimə qaytardılar.



Onu da qeyd edim ki, Qarabağ bölgəsində çox ezamiyyətlərdə olmuşam. Şuşadan sonuncu çıxan bizim işçilər olub. Əfsuslar olsun ki, torpaqlarımızın 20 faizindən çoxu indi düşmən əlindədir. Lakin bu, çox çəkməyəcək. Mən inanıram ki, erməni işğalçıları tərəfindən qəsb edilmiş doğma torpaqlanmız tezliklə azad olunacaq. Bizim xalq, vətənpərvər, döyüşkən olmaqla yanaşı, həm də sülhsevər xalqdır. Bu münaqişə sülhlə həll olunmasa, hərb yolunu seçməli olacağıq. Və mütləq qələbə çalacagıq.

Polkovnik Raqub Bəşirov işlədiyi müddətdə "Respublikanın Əməkdar rabitəçisi" adına layiq görülüb, "Şərəf nişanı" ordeni, müxtəlif medallar və Ali Sovetin fəxri fərmanları ilə təltif olunub.

*Xatirə TAĞIYEVA*
*"Ədalət" qəzeti,*
*25 mart 2006-cı il*

## CABBAROVA NƏZAKƏT ABDURƏŞİD QIZI



**1939**-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhəri 10 nömrəli orta məktəbi bitirmişdir. Şəki şəhər mədəniyyət evi nəzdində biçmə-tikmə kurslarını bitirmişdir. Gözəl əl qabiliyyəti vardır.

Ailə qurduğuna görə təhsilini davam etdirə bilməmişdir.

Nəzakət ailəlidir. Dörd uşağa ana, dörd nəvəyə nənədir.

## CƏFƏROV XANLAR HƏTƏM OĞLU



30 may 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə şəhər M.Qorki adına 10 saylı orta məktəbə daxil olmuş və 1957-ci ildə həmin məktəbi qurtarmışdır. 1956-1957-ci illərdə Şəki Avtobazasında gecə növbəsində çilingər vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1958-ci ildə Azərbaycan Dövlət Xalq Təsərrüfatı İnstitutuna daxil olmuş, institut ləğv olunduğu üçün oxuduğu sənaye iqtisadiyyatı fakultəsi M.Əzizbəyov adına Azərbaycan Dövlət Neft və Kimya İnstitutuna verilmiş, təhsilini orada davam etdirmiş və 1962-ci ildə həmin institutun mühəndis-iqtisad fakultəsini qurtarmışdır. İnstitutun buraxılış komissiyasının qərarı ilə gənc mütəxəssis kimi Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinə işə göndərilmişdir.1962-ci ildən 1988-ci ilə qədər - 25 təqvim ili daxili işlər orqanlarında operativ işdə qulluq etmişdir. 23 il nazirliyin mərkəzi aparatında işləmişdir: 18 il SƏDM (OBXSS) İdarəsində əməliyyat müvəkkili, baş əməliyyat müvəkkili, xüsusi mühüm işlər üzrə baş inspektor, 6 il 7-ci İdarənin əməliyyat işləri üzrə rəis müavini, 1 il Sumqayıt şəhər milis idarəsinin rəis müavini, axırıncı 3 ay rəis əvəzi vəzifələrində işləmişdir. İşlədiyi müddət ərzində keçmiş SSRİ və Azərbaycan SSR Daxili İşlər Nazirliyinin medalları, fəxri fərmanları, pul mükafatları və fəxri adları ilə təltif edilmişdir. SSRİ DİN Akademiyasının qiyabi hüquqşünaslıq fakultəsini qurtar-mışdır. 1988-ci ilin məlum Sumqayıt hadisələrindən sonra Sov İKP sıralarından çıxarılmış və təqaüdə göndərilmişdir. 1992-ci ildə Azərbaycan Kommunist Partiyasının Mərkəzi Komitəsinin bürosunda bəraət alaraq partiya sıralarına bərpa olunmuşdur. Elə həmin il Daxili İşlər Nazirliyinə işə çağırılmış və əmək fəaliyyətindəki məcburi fasilə daxili işlər orqanlarındakı əmək stajına daxil edilməklə sərəncama götürülmüşdür. Lakin artıq daxili işlər orqanlarında işləmək istəmədiyi üçün 3 aydan sonra, polkovnik rütbəsində, yenidən təqaüdə çıxmışdır.

1988-ci ildən, yəni daxili işlər orqanlarından təqaüdə çıxdıqdan sonra Azərbaycan Respublikasının Avtomobil Nəqliyyatı Nazirliyində, Bakı Neft Avadanlığı Maşınqayırma Zavodunda, Azərbaycan Respublikasının Vergilər Nazirliyində, Baş Dövlət Texniki İnventarlaşdırma, Mülkiyyət Hüquqlarının Qeydiyyatı və Şəhərsalma Kadastrı idarəsində müvafiq olaraq baş arbitr, hüquq şöbəsinin rəisi, aparıcı hüquqşünas, hüquq məsləhətçisi vəzifələrində işləmişdir.

Hazırda Respublika Daşınmaz Əmlakın Dövlət Reyestri Xidmətində hüquq məsləhətçisi işləyir.

1967-ci ildə ailə həyatı qurub. Həyat yoldaşı kimya elmləri namizədidir. İki övladı, dörd nəvəsi vardır.

Qızı – İlahə Zeynalova həkimdir, oğlu – İlqar Cəfərov Respublika Baş Prokrorluğunda idarə rəisidir, generaldır.

## CƏLİLOV MƏMMƏD PAŞA OĞLU



17 yanvar 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbin 1-ci sinifinə qəbul olunmuş, 1957-ci ildə bitirmişdir. Məktəbi bitirdikdən sonra tikintidə əmək fəaliyyətinə başlamışdır. 1960-cı ildə ordu sıralarına çağırılmış və 1963-cü ilədək hərbi qulluqda olmuşdur.

Hərbi xidməti başa vurduqdan sonra 1964-cü ildə əvvəl işlədiyi kollektivə, Kənd Tikinti Nazirliyinin Şəki şəhərində fəaliyyət göstərən 55 nömrəli tikinti-quraşdırma idarəsində işə qəbul olunur və 33 il fasiləsiz həmin idarədə işləyir. Əmək fəaliyyəti dövründə idarənin Komsomol təşkilatının katibi, Həmkarlar ittifaqı komitəsinin sədri və Partiya təşkilatının katibi kimi ictimai vəzifələri aparmışdır.

Həmin dövrdə dəfələrlə tabeliyində olan nazirlik, trest və idarə rəhbərliyi tərəfindən müxtəlif diplom və Fəxri fərmanlara mükafatlandırılmışdır. Fədakar əməyinə görə ÜİHİMŞ-nın Diplomu ilə təltif edilmişdir.

1997-ci ildə 35 illik iş stajı ilə təqaüdə çıxmışdır.

1967-ci ildə ailə həyatı qurmuş Məmməd Cəlilov bir qız və bir oğul atası, beş nəvə babasıdır.

Həyatdan razı qaldığını söyləyir və nəvələrinə kiçik yaşlarından yaxşı oxumağı, daim biliklərini artırmağı, vətənimizə, xalqımıza layiqli bir insan kimi böyümələrini tövsiyə edir.



## DAVIDOV TELMAN MƏMMƏDƏLİ OĞLU



1040-cı ildəŞəki şəhərində anadan olmuşdur. 1947-1957-ci illərdə Şəki M.Qorki adına 10 nömrəli orta məktəbdə oxumuşdur. 1973-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirmişdir.

1958-ci ildə Zəyzid kənd kino qurğusunun mexaniki vəzifəsində çalışmışdır. 1961-ci ildə ordu sıralarına çağırılmışdır. Ordudan tərxis olunduqdan sonra 1965-66-cı illərdə rayonun müxtəlif kəndlərində kinomexanik işləmişdir. 1967-77-ci illərdə Bakının neft sənayesində elektrik montyoru, 1977-1982-ci illərdə Şəki 43 nömrəli Texniki Peşə məktəbinin kinomexanik qrupunda istehsalat təlimi ustası, 1982-1994-cü illərdə kino birliyinin mühəndisi vəzifəsində çalışmışdır.

T. Davıdov 1994-cü ilin sentyabr ayından ömrünün axırına kimi Kiş kəndi 16 saylı məktəbdə müəllim işləmişdir. İşlədiyi müddətdə şagirdlərin təlim-tərbiyəsinin yüksəldilməsi üçün üzərinə düşən vəzifəni layiqincə yerinə yetirmiş, təhsilin dövlət standartları səviyyəsində öyrədilməsinə səy göstərmişdir. O, qabaqcıl təcrübəni öyrənməklə öz işində tətbiq etmişdir. O intizamı, mehriban davranışı ilə müəllimlər, şagirdlər və valideyinlər arasında dərin hörmət qazanmışdı. T.Davıdov ailəli olub. Bir övladı var.

22 may 2002-ci il tarixdə qəflətən vəfat etmişdir.

## ƏHMƏDOV AZAD ALLAHYAR OĞLU



**1939**-cu il sentyabrın 18-də Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbinə daxil olaraq 1957-ci ildə 10-cu sinfini bitirmişdir. Həmin il Bakı Etlektrotexniki Rabitə Texnikumuna daxil olun-araq 1960-cı ildə oranı bitirmişdir. 1960-63 - cü illərdə orduda xidmət etdikdən sonra Şəki şəhər ATS – ində elektromexanik vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1964 – cü ildə Azərbaycan Politexnik İnstitunun axşam şöbəsinə daxil olmuş, eyni zamanda Bakı şəhərindəki 65 indeksli ATS-də 1968-ci ilədək böyük elektromexanik, 1968-69-cu illərdə 93 indeksli ATS-də böyük mühəndis, 1969-77-ci illərdə Mərkəzi Telefon Qovşağında baş mühəndis vəzifələrində çalışmışdır. Sonralar Yasamal telefon qovşağının rəisi, Tikilən Müəssisələrin Direktorluğunun rəisi , Bakı şəhər Telefon Şəbəkəsinin mərkəzi abonent şöbəsinin rəisi, Mərkəzi Telefon Qovşağının baş mühəndisi vəzifələrində işləmişdir.

O, savadlı mühəndis, bacarıqlı təşkilatçı, yaxşı yoldaş, qayğıkeş insan idi. Öz dövrünün qabaqcıl rabitəçilərindən idi. Bakının telefonlaşdırılmasında, rabitənin inkişafında böyük xidmətləri olmuşdur.

15 oktyabr 1990-cı ildə faciəli surətdə həyatını dəyişmişdir.

Ailəli idi. 2 övladı var.



## ƏHMƏDOV FÜZULİ İBRAHİMXƏLİL OĞLU



**1938**-ci ildə Şəki rayonunun Böyük Dəhnə kəndində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbinə qəbul edilmiş, 1957-ci ildə həmin məktəbi bitirmişdir.

1964-cü ildə Bakı Sovet Ticarəti Texnikumuna daxil olmuş, 1968-ci ildə həmin texnikumun tam kursunu bitirmiş və xörəklərin hazırlanması texnologiyası ixtisasına sahib olmuş və öz ixtisasına uyğun olaraq müxtəlif ictimai-iaşə müəssisələrində işləmişdir. Yaxşı Işinə görə rəhbərliyi tərəfindən dəfələrlə mükafatlandırılmışdır.

1984-cü ildə ailə həyatı qurmuşdur. Şəki musiqi texnikumunda oxuyan yeganə qızı ixtisas təhsilli musiqiçidir.

F.Əhmədov 1994-cü ildə vəfat etmişdir.

## ƏHMƏDOV NADİR ALI OĞLU



**1940**-cı ildə Şəki rayonunun Aşağı Göynük kəndində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. 1960-cı ildə Bakı Rabitə Elektrotexnikumunu, 1965-ci ildə Odessa Elektrotexniki Rabitə İnstitutunu "Elektrik rabitəsi mühəndisi" ixtisası üzrə bitirmişdir. 1968-1970-ci illərdə Sovet ordusunda xidmət etmişdir. 1960-1985-ci illərdə Bakı Telefon Şəbəkəsində texnik, mühəndis, sex rəisi, stansiya xidməti rəisi, baş mühəndis və 12 il müddətində rəis vəzifəsində çalışmışdır. Məhz bu dövrdə Baki şəhərində telefonların sayı 2,5 dəfə artmış, telefonların keyfiyyətli işləməsinə, rüşvətxorluğun aradan qaldırılmasına, şəffaflığa nail olunmuşdur. 1985-ci ildən 12 il müddətində Rabitə nazirinin müavini vəzifəsində işləmişdir. Bu dövrdə respublikanın rabitə sistemlərinin inkişafında böyük xidmətləri inkaredilməzdir. Məlum Qarabağ hadisələri başlanan vaxtdan (1988-1992) müntəzəm olaraq Qarabağda olmuş, çətin şəraitdə, həyatının müxtəlif təhlükələrə məruz qalmasına baxmayaraq, azərbaycanlı əhalinin təhlükəsizliyinin təmin olunması, hərbi hissələrin və yaşayış məntəqələrinin telefonlaşdırılması işləri ilə ciddi məşğul olmuşdur. Xocalını çətin günlərdə radiotelefonlarla təmin etdiyinə görə



SSRİ-nin prokurorluq orqanlarının təzyiqinə məruz qalmış və istintaqa cəlb olunmuşdur.

50-dən çox səmərələşdirici təkliflərin, bir ixtiranın, beş texniki kitabın, çoxsaylı məqalələrin müəllifi Nadir müəllim 1997-ci ildə Rabitə naziri vəzifəsinə təyin olunur və elə bu vaxtdan beynəlxalq standartlara uyğun rabitənin inkişafı başlanır:

- Elektron ATS-lərin xüsusi çəkisi 1995-ci ildəki 4,4%-dən 2003 - cü ildə 50%- ə çatdırılır; Bakı və rayon rabitə müəssisələri kompüterləşdirilir və həmin müəssisələr respublikada ilk dəfə olaraq öz aralarında ON – LİNE rejimində əlaqə saxlamağa nail olurlar: nazirlik sistemində işçilərin orta əmək haqqı 1995-ci ildə 90 min manatdan 2003-cü ildə 517 min manata çatdırılır. 2003-cü ildə adi telefonların sayı 1 milyonu, mobil telefonların sayı isə 1,5 milyonu keçir; 2000-ci ildən başlayaraq respublikada ilk dəfə rabitə müəssisələrində hər il 300-600 məqsədyönlü iş yerləri açılır; rabitə xidmətlərinin qiymətləri hər il aşağı salınır;

N.Əhmədov rabitədə dönüş yaratmaqla bərabər rabitəçi gənclərin idman, mədəniyyət, elm və s. sahələrdə fəaliyyətini genişləndirmək, quruculuq, milli, Vətənin təəssübkeşi ruhunu qaldırmaq üçün əməli işlər görmüş, rabitəçi idmançıların yetişməsinə daim qayğı göstərmişdir. Onların bir çoxu Avropa və , dünya birinciliklərinin qalibi olmuşlar.

N.Əhmədov Azərbaycanlı gənclərin xaricdə və respublikada ali təhsil almalarına,sağlam milli düşüncəli, vətən təəssübkeşli milli rabitəçilərin yetişdirilməsinə hərtərəfli diqqət və qayğı göstərmiş, Odessa Rabitə İnstitutunda azərbaycanlıların təhsil alması üçün şərait yaratmışdır.

Bir nazir kimi N.Əhmədov daim ona müraciət edən vətəndaşları qəbul edər, onların şikayət, tələb və xahişlərini diqqətlə dinləyər, vaxtında yerinə yetirilməsi üçün müvafiq

göstərişlər verər və tam həll olunanadək nəzarətdə saxlardı. Odur ki, nazirə ünvanlanmış məktubların əksəriyyəti minnətdarlıq məktublarıdır.

Belə çoxsaylı məktublardan biri:

***"Hörmətli Nadir müəllim!***

***Sizə məktub yazarkən dahi Nizami Gəncəvinin məhşur kəlamı yadıma düşdü:***

***Çalış öz xalqının işinə yara***
***Geysin əməlinlə dünya zər-xara.***

***Cənab nazir, sizin haqqınızda çox eşitmişik. Bir var eşidəsən, bir var görəsən, şahidi olasan. Biz bunun şahidi olduq. Bircə dəfə müraciət etməyimizlə, Siz çox qısa müddətdə Şəmkirdən 60 km. uzaq olan Tatarlı kəndində ən müasir rabitə yaratdınız. Sizə bu işinizə görə kənddə yaşayan 2000 əhalinin təşəkkürünü bildirirəm. Allah sizə kömək olsun."***



Dövlət və ictimai işlərdə xidmətlərinə görə Nadir Əhmədov " Şərəf nişanı" ordeni ilə təltif olunmuş, SSRİ Rabitə Nazirliyinin " Rabitə ustası" adına, Respublikanın "Əməkdar Rabitəçi" fəxri adına, Respublika Ali Sovetinin Fəxri fərmanına, MDB dövlətlərinin Assambleyasında qızıl medala və xüsusi diploma layiq görülmüşdür.

Xüsusilə, Rabitə naziri vəzifəsindəki xidmətləri nüfuzlu beynəlxalq qurumlar tərəfindən də yüksək qiymətləndirilmişdir. Amerika Bioqrafiyalar İnstitunun (ABİ) İdarəedici Şurası Elektron və Poçt Rabitəsi sahəsində əldə etdiyi uğurlara görə apardığı sorğuya əsasən onun adını "2001-ci ilin adamı"; "21-ci əsrin Dahiyanə şəxsiyyəti" (2002); "Dünya xalqları Konqresinin ömürlük senatoru" (2003); "Dünyanın Qabaqcıl Ziyalıları" adlı 2002-2003-cü il buraxılışına daxil edib.

O, eyni zamanda mənzil-qərargahı Nyu-Yorkda yerləşən Ümumdünya Sülh Federasiyasının Sülh Elçisi statusuna layiq görülmüşdür.

1979-1987-c- illərdə Bakı Şəhər Xalq Deputatları Sovetinə deputat seçilmişdir.

N.Əhmədov KİV və Sosial Araşdırma Mərkəzləri tərəfindən 2000-ci ildə "İlin ən işgüzar dövlət məmuru" , 2001-ci ildə "İlin ciddi siması", 2002-ci ildə "İlin naziri", 2003-cü ildə "İlin dövlət məmuru" və "Veteranların dostu" adlarına layiq görülmüşdür.

N.Əhmədov bir-neçə kitabın müəllifidir:

"Telefon aparatları" – 1989;
"Rabitədə akkumulyatorların istismarı" – 1995;
"Azərbaycan rabitəsi. Tarixi xronika" – 2003;
"Nəvələrə nəsihət" – 2008;
"İblis xislətli erməni" – 2009.

Qarabağ müharibəsinin veteranıdır. Abşeron rayonunun və Mingəçevir şəhərinin fəxri sakinidir.

Gözəl ailə başçısıdır. Üç övlad atası, beş nəvə babasıdır. Qızı - Sevda tibb elmləri namizədi, xəstəxanada baş həkimin müavini vəzifəsində çalışır. Oğlu - Vahid DİN-də mayor rütbəsində qulluq edir. Qızı - Vəfa Rəssamlıq Texnikumunda müəllimədir.

Arzuları – sağlam, bilikli, milli düşüncəli yeni nəslin yetişdirilməsidir.

## ƏKBƏROV ƏLƏFSƏR HÜSEYİN OĞLU



**1937**-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə, Şəki 10 saylı orta məktəbə daxil olmuş, 1957-ci ildə həmin məktəbi bitirmişdir.1958-ci ildə Şəki Ipək Kombinatının toxuculuq istehsalatında tərəziçi vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1961-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya Institutunun qiyabi şöbəsinə daxil olmuş və 1968-ci ildə həmin institutu bitirmişdir. 1965-ci ildə Şəki şəhər Partiya Komitəsinin göndərişi ilə Şəki Ət-Süd Kombinatında iqtisadçı-mühəndis vəzifəsinə təyin edilmişdir. 1978-ci ilin mart ayında Ət-süd kombinatının Plan-iqtisad şöbəsinin rəisi vəzifəsinə təyin edilmişdir. 1997-ci ildən təqaüdçüdür.

Azərbaycan Respublikası Rabitə və İnfor-masiya Texnologiyalari Nazirliyinin "Azərmətbuatyayım" İstehsalat Birliyinin Şəki rayon şöbəsinin rəisi vəzifəndə çalışıb.

2007-ci idə vəfat edib.



Evli idi . Qızı və nəvəsi vardır.

Əmək fəaliyyəti dövründə "Əmək igidliyinə görə" və "Əmək veteranı" medallarına layiq görülmüş, müxtəlif Fəxri Fərmanlarla mükafatlandırılmışdır.

Yeganə nəvəsinə yaxşı oxumağı, intizamlı və bütün işlərində nümunəvi olmağı tövsiyə edərdi.

## ƏLİXANOV RAUF ƏLİXAN OĞLU



18 iyun 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 saylı orta məktəbə daxil olub, 1957-ci ildə həmin məktəbi bitirmişdir.

1959-cu ildə hərbi xidmətə çağırılmış, Tambov şəhərində Hərbi Təyyarəçilik Məktəbində oxumuş və 6 aydan sonra tərxis olunmuşdur. Həmin il Leninqrad Hərbi Gəmi Tikintisi Institutuna qəbul olunmuş və 1963-cü ildə həmin institutu mühəndis-torpedoçu ixtisası üzrə bitirmişdir. Şəkiyə qayıtdıqdan sonra Şəhər diş poliklinikasında diş texniki vəzifəsində çalışmış, 1965-ci ildə Azərbaycan Tibb İnstitununa daxil olmuş və 1970-ci ildə oranı bitirərək diş həkimi ixtisası almışdır.

Şəki MRX-nın diş poliklinikasında diş həkimi vəzifəsində əmək fəaliyyətinə başlayan R.Əlixanov indiyədək həmin vəzifədə çalışır. Məktəb illərində idmanın boks növü ilə məşğul olmuş , rayon və Respublika yarışlarında iştirak etmiş və mükafata layiq yerlər tutmuşdur .

Həyatda qazandığı nailiyyətlərə görə bütün müəllimlərinə minnətdarlığını bildirir. Yaxşı oxumağı daim müəllimlərin hörmətini qazanmağı və saxlamağı övladlarına və nəvələrinə tövsiyə edir.

Ailəlidir. 4 övladı, 4 nəvəsi var.



## ƏZİZOV ADİL SABİT OĞLU



Şəki şəhərində 1937-ci ildə fəhlə ailəsində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbini bitirmişdir. 1958-ci ildə Bakı Sovet Ticarəti Texnikumuna daxil olmuşdur. 1959-cu ildə hərbi xidmətə qöndərilmiş, 1961-ci ildə hərbi xidmətdən gayıdarag təhsilini davam etdirmişdir. 1963-cü ildə həmin texnikumu bitirmiş və Şəki Ticarət Təşkilatına təyinat almışdır. Uzun müddət Şəkidə ticarət sistemində satıcı, anbar müdiri, mağaza müdiri, şöbə müdiri və s. vəzifələrdə çalışmışdır.

1967-ci ildə ailə həyatı gurmuşdur. Üç övladı, üç nəvəsi var.

1997-ci ildə təgaüdə çıxmış, 2010-cu ildə vəfat etmişdir.

## FEYZULLAYEV NƏSİB ZÜBEYİR OĞLU



*1938*-ci ildə Şəki rayonunun İnçə kəndində anadan olmuşdur. 1957-ci ildə 10-nömrəli şəhər orta məktəbini bitirmişdir. Məktəbdən sonra bir müddət Şəkidə Tikiş fabrikində işləmiş, 1965-ci ildə fabrik rəhbərliyinin göndərişi ilə Şəki Toxuculug Texnikumuna daxil olmuş, 1968-ci ildə "Texnik-texnolog" ixtisası üzrə texnikumu bitirmişdir. Müxtəlif medal və qiymətli hədiyyələrlə mükafatlandırılmışdır.

4 övladı, 5 nəvəsi var.

1990-cı ildə 52 yaşında vəfat etmişdir.



## ƏLİYEV NƏSİF YUSİF OĞLU



*22* aprel 1941-ci il tarixdə Şəki şəhərində anadan olmuşdur. 1947 –ci ildən Şəki şəhər 10 nömrəli məktəbdə təhsil almış, 1957-ci ildə həmin məktəbi bitirmişdir.

1958-ci ildə Azərbaycan Politexnik Institutunun Sənaye və mülki tikinti fakultəsinə daxil olmuş, 1963-cü ildə həmin institutu İnşaat mühəndisi ixtisası üzrə bitirərək 1 saylı Evtikmə Kombinatında əmək fəaliyyətinə başlamışdır. Həmin dövrdə tikinti kombinatında usta, sex rəisi, baş iş icraçısı, partiya təşkilatı katibi vəzifələrində çalışmışdır. Çernobıl AES-də baş vermiş faciənin nəticələrinin aradan qaldırılmasında fəal iştirak etmişdir.

1980-ci ildən başlayaraq " İnşaat və Tikinti Materialları sənayesi fəhlələri" həmkarlar ittifagının Azərbaycan Respublika Komitəsinin sədri vəzifəsinə dəfələrlə seçilmiş, bu vəzifədə ömrünün sonu-nadək fəaliyyət qöstərmişdir.

N. Əliyev bütün vəzifələrdə işgüzarlığı, təşkilatçılığı ilə fərqlənmiş, kollektivlərin dərin hörmətini qazanmışdır. Həmkarlar İttifagında işlədiyi müddətdə fəhlələrin rifahının yaxşılaşması yolunda böyük işlər görmüşdür. Odur ki, tikintidə çalışan bütün fəhlələr onu "fəhlələrin atası" adlandırırdılar.

Onun fədakar əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, O, "Şərəf nişanı"ordeni, "Əməkdə igidliyə görə"

medalı və bir sıra fəxri fərmanlarla təltif edilmişdir. "Azərbaycan Respublikasının Əməkdar inşaatçısı" adına layiq görülmüşdür. Gözəl ailə başçısı olmuşdur. İki oğlu, üç nəvəsi vardır.

Oğlanları - Yusif sərhəd qoşunlarında polkovnik rütbəsində, Rasim isə DİN-də polkovnik-leytenant rütbəsində qulluq edirlər.

Nəsif Əliyev 11 avgust 2004-cü ildə vəfat etmişdir.



## HACIYEV ƏHMƏDİYYƏ ƏYYUB OĞLU



**1938**-ci ildə Şəki şəhərində müəllim ailəsində anadan olmuşdur. 1947-1957-ci illərdə Şəki şəhəri Maksim Qorki adına 10 saylı orta məktəbdə təhsil almışdır. 1959-1962–ci illərdə ordu sıralarında xidmət etmişdir. 1965-ci ildə Bakı "Paris Kommunası adına Gəmi Təmiri Zavodu"nda əmək fəaliyyətinə başlamışdır. 1971-ci ildən xidmət etmişdir. 1965-ci ildə Bakı "Paris K ommunası adına Gəmi Təmiri Zavodu"nda əmək fəaliyyətinə başlamışdır. 1971-ci ildən Şəki İnternat məktəbində təsərrüfat müdiri vəzifəsində çalışmışdır. 1972-ci ildə ailə həyatı qurmuşdur. 3 övladı, dörd nəvəsi var.

2004-cü ilin mart ayında vəfat etmişdir.

## HACIYEV İBRAHİMXƏLİL ƏLİ OĞLU



14 mart 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-1957-ci illərdə 10 saylı Şəki şəhər orta məktəbində təhsil almışdır. 1957-ci ildə Azərbaycan Politexnik İnstitunun mexanika fakultəsinin " Avtomobil nəqliyyatının istismarı" şöbəsinə daxil olaraq, 1962-ci ildə oranı bitirmişdir. 1962-1967-ci illərdə Respublika Avtomobil Nəqliyyatı Nazirliyinin nəzdində olan 1 saylı Bakı taksimotor parkında qaraj rəisi, baş mühəndis vəzifələrində çalışmışdır. Nazirliyin sərəncamı ilə 1967-78-ci illərdə 2701 və 2708-ci yük avtomobili kolonlarında qaraj rəisi, istismar şöbəsinin müdiri, Bakı şəhər mərkəzi avtovağzalında, 1978-82-ci illərdə isə Bakı şəhəri 4 saylı taksimotor parkında müdir vəzifələrində işləmişdir. 1982-86-cı illərdə Nazirlər Sovetinin nəzdində olan Bakı şəhəri 2 saylı meyvə-tərəvəz avtobazasının müdiri, 1986-94-cü illərdə Sumqayıt Toxuculuq Fabrikində istehsalat müdiri, daha sonra Azərbaycan Təkrar Emal Zavodunda sex rəisi, 1994-cü ildən Bakı şəhəri Ticarət və Ictimai İaşə idarəsində təşkilat və istehsalt şöbəsinin rəisi vəzifələrində çalışmışdır. 2002-ci ildə təqaüdə çıxmışdır.

Ailəlidir. Beş övladı, səkkiz nəvəsi var.

## HACIYEV NEMƏT HƏMİD OĞLU



Hacıyev Nemət Həmid oğlu 1940-cı il yanvar ayının 17-də Şəki şəhərində anadan olmuşdur.

Orta təhsilini 1947-57-ci illərdə Şəki şəhər M.Qorki adına 10 saylı orta məktəbdə almışdır. 1958-60-cı illərdə Şəki Pedaqoji Texnikumunda oxumuş və oranı fərqlənmə diplomu ilə qurtarmışdır. 1964-cü ildə S.M.Kirov adına ADU-ya daxil olmuş və 1970-ci ildə bitirmişdir. Tarixçidir.

Onun əmək fəaliyyəti çoxsahəli və səmərəli olmuşdur.

N.Hacıyev 1957-58-ci illərdə V.İ.Lenin adına İpək Kombinatında fəhlə, 1960-cı ildə Şəki şəhər 12 saylı İnternat məktəbində pioner baş dəstə rəhbəri işləmiş, 1960-63-cü illərdə hərbi xidmətdə olmuşdur. 1963-64-cü illərdə internat məktəbində müəllim, sonra isə irəli çəkilərək 1964-72-ci illərdə Şəki şəhər Komsomol Komitəsində Məktəbli Gənclər şöbəsinin müdiri, 1972-81-ci illərdə 43 saylı Orta Təhsil verən Texniki Peşə Məktəbinin direktoru, 1981-91-ci illərdə Şəki Kino Birliyinin direktoru olmuşdur. 1997-ci ilin iyun ayından Şəki şəhər Dövlət Tarix-Memarlıq Qoruğunun direktoru vəzifəsində çalışır.

İşlədiyi bütün sahələrdə dövlətçiliyə sadiq olmuş və onun siyasətinin fəal təbliğatçısı kimi tanınmışdır.

Ömrünün ən məhsuldar dövrünü gənclərin təlim-tərbiyəsinə həsr etmişdir. N.Hacıyev tələbəlik illərində Pedaqoji Texnikumun komsomol təşkilatının katibi, hərbi xidmət dövründə hissə komsomol komitəsinin katib müavini, 10 ildən artıq Şəki şəhər Komsomol Komitəsinin büro üzvü olmuşdur. O, 1977-1979-cu illərdə Şəki şəhər Sovetinin deputatı seçilmişdir. 1971-ci ildə «Əməkdə fərqlənməyə görə» medalına, müxtəlif vaxtlarda «Sosializm yarışınm qalibi», ÜİLKGİ MK-nin «Komsomolda fəal işinə görə», «Pionerlərlə fəal işinə görə» döş nişanlarına, ÜİLKGİ MK-nin, Azərbaycan LKGİ MK-nin, Azərbaycan KP Şəki şəhər Komitəsinin, Azərbaycan Dövbt İdarələri və İctimai Xidmət İşçiləri Həmkarlar İttifaqı Respublika Komitəsinin, Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin fəxri fərmanlarına, diplom və digər mükafatlara layiq görülmüşdür.

N.Hacıyev Şəkinin tarixinə, memarlığına, incəsənətinə dair 30-dan çox elmi məqalənin, «Unudulmaz qəhrəmanlıq» və "Unudulmaz illər" kitablarının müəllifidir.

Nemət Hacıyevin dörd övladı, səkkiz nəvəsi var.



## HACIYEV RAMİZ VEYSƏL OĞLU



Şəki şəhərində 1937-ci ildə anadan olmuşdur. 1946-1957-ci illərdə Şəki şəhər 10 nömrəli orta məktəbdə təhsil almışdır. İki il işlədikdən sonra hərbi xidmətə çağırılmışdır. Hərbi xidməti qurtardıqdan sonra "Şəki Peşəkar Yanğından Mühafizə" hissəsində işə başlamışdır. Burada işlədiyi müddətdə Xarkov Yanğından Mühafizə Məktəbinin Bakı filialında qiyabi təhsil almış, işində sıravi döyüşçüdən komanda rəisi vəzifəsinədək yüksəlmişdir. Yanğınların söndürülməsində fəal iştirakına qörə "Yanğında şücaət" döş nişanı ilə təltif olunmuşdur.

2010-cu ildə vəfat etmişdir.

## HACIYEVA SİMUZƏR HÜSEYİN QIZI



Şəki şəhərində 1936-cı il mart ayının 9-da anadan olmuşdur. İlk təhsilini qızlar məktəbində alan Simuzər 1954-cü ildə şəhərin 10 nömrəli məktəbində oxumaqla oranın məzunu olmuşdur. O Şəkinin yşaq xəstəxanasında , Mənzil-istismar idarəsində və 3 nömrəli ipək əyirici-burucu fabrikində işləmiş və oradan təqaüdə çıxmışdır.

O xoşbəxt ailə qurmuşdur. Üç övladı, beş nəvəsi var.

S. Hacıyeva uzun sürən xəstəlikdən sonra 29 yanvar 2004-cü ildə dünyasını dəyişmişdir.



## HEYDƏROV SANİ İSLAM OĞLU



Şəkinin Bideyiz kəndində 1937-ci ildə anadan olmuşdur. İlk təhsilini kənd məktəbində aldıqdan sonra Şəki ş. 10 saylı orta məktəbə keçirilmiş və 1957-ci ildə bu məktəbi bitirmişdir. Həmin ildə Şəki pedağoji məktəbinə daxil olmuş və "İbtidai sinif müəllimi" şöbəsini bitirmişdir. 1959-cu ildən Oğuz rayonunun Dəymədərə kənd məktəbində ibtidai sinif müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1964-cü ildə Azərbaycan Dövlət Pedağoji İnstitutunun Azərbaycan dili və ədəbiyyatı fakultəsinə daxil olmuş, 1969-cu ildə oranı qiyabi olaraq bitirmişdir. Əvvəlcə Şəki r. Bideyiz kənd məktəbində Azərbaycan dili və ədəbiyyatı müəllimi, 1978-ci ildən isə həmin məktəbin direktoru vəzifəsində çalışmışdır.

Evlidir. 3 övladı və 3 nəvəsi var. Hazırda təqaüdçüdür. " Əmək veteranı " medalı ilə təltif edilmişdir.

## HƏMİDOV NADİR VAHİD OĞLU



1939-cu ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktədin 1-ci sinifinə qəbul olunmuş və 1957-ci ildə məktəbi bitirmişdir.

1957-ci ildən Şəki ipək kombinatında fəhlə vəzifəsində əmək fəaliyyətinə başlamışdır.

1958-ci ildə Azərbaycan Politexnik İnstitunun "Sənaye-tikinti fakultəsi"nə qəbul olunmuş və 1963-cü ildə həmin institutu bitirərək inşaat mühəndisi ixtisasına yiyələnmişdir.

İnstitutu qurtardıqdan sonra 1963-cü ildə Bakı Baş Tikinti İnşaat idarəsində mühəndis vəzifəsinə təyin olunmuşdur. 1964-1974-cı illərdə 3 nömrəli tikinti idarəsində, 1974- 75-ci illərdə 28 nömrəli tikinti idarəsində baş iş icraçısı vəzifələrində çalışmışdır.

1975-ci ildə Azərbaycan Respublika Tikinti Bankının Bakı şəhər şöbəsi müdirinin müavini vəzifəsinə təyin olunur və bundan sonra bank işçisi kimi əmək fəaliyyətini davam etdirir. 1979-cu ildə Respublika Tikinti Bankının əmri ilə Nərimanov rayon şöbəsinə müdir vəzifəsinə təyin edilir və 1988-ci ilə qədər həmin vəzifədə fəaliyyət göstərir.



1989-2002-ci illərdə kommersiya bankı "İnşaatbank"ın sədri vəzifəsində fəaliyyətini davam etdirir və 2002-ci ildə təqaüdə çıxır.

Gözəl ailə başçısı idi. Iki övladı və dörd nəvəsi vardır.

N.Həmidov 31 dekabr 2011-ci ildə vəfat etmişdir.

***

### NADİR HƏMİDOVU XATIRLAYARKƏN

İnsanın ömrü - yaşadığı illərlə yox, dostlarının, yaxınlarının xatirələrində necə yaşaması ilə ölçülür.

Hava olmasa İnsan yaşaya bilməz. Çatışmayanda yadımıza düşür və onun insan üçün nə qədər vacib olduğunu daha dərindən dərk edirik. Əsil dostluq da buna bənzəyir.

Çox təəssüflər olsun ki, orta məktəbi bitirməyimizin 55 illik yubleyini dostumuz Nadirsiz qeyd edirik. 45 illik yubleyimiz zamanı rəhmətlik hamıya 55 illik yubleydə sağ-salamat iştirak etməyi arzulamışdı...

Bizə həyatı bəxş edən allahdır, vaxtı çatanda verdiyi canı geri alır. Mərhum Nadir bu gün aramızda cismən yoxdur, ancaq o ruhən bizimlədir. Onun məclisdərimizdəki çıxışlarını, toylardakı rəqslərini, özünəməxsus şahmat, nərd oynamasını, şirin, incə yumorlu zarafatlarını daim xatırlayırıq. Onu xatırladıqca yoxluğunu, aramızda olmamasını havamızın çatışmaması kimi hiss edirik. Bizim dost məclislərimizin əvəzolunmaz tamadası idi. Onun şirin söhbətləri, yerində dediyi atalar sözləri, lətifələri məclisimizə hərarət gətirər,

sağlam təbəssüm, gülüş bəxş edərdi. Onun söhbətlərinə böyük həvəslə qulaq asar və ruhən dincələrdik.

O zarafatlarda dözümlü idi. İndi də dostların görüşündə onun olmaması məclisin şuxluğuna təsir edir.

Nadir dost kimi əməli saleh insan idi. Sülhsevər adam idi. Bütün məsələləri sülh yolu ilə həll etməyə üstünlük verərdi.

Çox haqlı deyiblər: Bir ayrılıq bir ölüm,
Heç biri olmayaydı...

Nadirə Allahdan rəhmət diləyir, ruhunun şad olmasını, qəbrinin nurla dolmasını arzulayırıq.

***DOSTLARI***



## HƏMİDOV VAQİF İSMAYIL OĞLU



11 iyul 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-57 ci illərdə Şəki şəhər 10 nömrəli orta məktəbdə təhsil almışdır. 1957-ci ildə Bakı Neft Texnikumuna daxil olmuş, 1962-ci ildə oranı müvəffəqiyyətlə bitirmişdir. 1962-ci ildə Azərbaycan Politexnik İnstitunun axşam şöbəsinə qəbul olunmuş, 1968-ci ildə həmin institutu bitirərək " İnşaat mühəndisi" ixtisası almışdır. İnstitutda oxuduğu dövrdə 1962-67-ci illərdə Rabitə Nazirliyində laborant, 1967-73-cü illərdə Sənaye Tikinti Nazirliyində nəzarətçi, 1973- 80-ci illərdə Azərittifaqda TQİ-də sahə rəisi , 1980-96-cı illərdə Bakı UDM-də briqadir vəzifələrində çalışmışdır. Əmək fəaliyyəti dövründə müxtəlif "Fəxri fərman"larla təltif edilmişdir.

Hazırda təqaüddədir. Ailəlidir. Iki övladı, dörd nəvəsi var.

## HÜSEYİNOV NƏSİR ŞAKİR OĞLU



Şəki şəhərində 1939-cu ildə anadan olmuşdur. 1947-1957-ci illərdə Şəki şəhər 10 nömrəli orta məktəbdə təhsil almışdır. 1957-ci ildə hərbi xidmətə çağırılmış, 1961-ci ildə xidməti bitirdikdən sonra Gəncə Kənd Təsərrüfatı İnstitutuna daxil olmuşdur. 1966-cı ildə həmin institutun üzümçülük, şərabçılıq və meyvə-tərəvəz şöbəsini bitirmişdir. İnstitutu qurtardıqdan sonra təyinatla Şəki üzümçülük sovxozunda aqronom vəzifəsinə təyin olunaraq əmək fəaliyyətinə başlamışdır. Bir müddətdən sonra Şəki meyvə tingliyi sovxozuna aqronom vəzifəsinə keçirilir, sonralar isə həmin sovxozun direktoru vəzifəsinə təyin olunur və bu vəzifədə 20 ilə qədər fəaliyyət göstərir.

İki oğlu və bir qızı, 5 nəvəsi var.

7 avqust 2003-cü ildə vəfat etmişdir.



## HÜSEYNOVA (RAMAZANOVA) LƏTAFƏT MAHMUD QIZI



1936-cı ildə Şəki şəhərində fəhlə ailəsində anadan olub. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir.

Uzun müddət Şəki şəhər 6 saylı tikiş fabrikində işləmişdir. Qüsursuz əməyi fabrik rəhbərliyi tərəfindən yüksək qiymətləndirilmişdir.

Ailəli idi. 4 övladı 10 nəvəsi və bir nəticəsi var.

19 dekabr 2006-cı ildə vəfat etmişdir.

## XASIYEVA İQLİMƏ HÜSEYİN QIZI



Şəki şəhərində 9 mart 1939-cu ildə anadan olmuşdur. 1946-cı ildə Şəki şəhər 7 saylı orta məktəbə daxil olmuş, Təhsilini 10 saylı orta məktəbdə davam etdirərək 1957-ci ildə oranı bitirmişdir.

Həmin ildə ailə qurduğu üçün təhsilini davam etdirə bilməmişdir.

4 övladı, 11 nəvəsi və 1 nəticəsi var.

Çox uşaglı ana kimi medalla təltif olunmuşdur.



## İBRAHİMXƏLİLOVA HUMAYƏ MƏMMƏD QIZI



Şəki şəhərində 1938-ci ildə anadan olmuşdur. 1957 –ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. Məktəbi qurtardıqdan sonra 1957-1965-ci illər Şəki Yerli Sənaye kombinatının toxucu-trikotaj fabrikində toxucu vəzifəsində işləmişdir.

1965-ci ildə Şəki Tibb Məktəbinə daxil olarag, 1967-ci ildə bitirmişdir. 1967-ci ildən indiyədək Şəki Mərkəzi rayon xəstəxanasının Burun-qulaq-boğaz şöbəsində tibb bacısı vəzifəsində çalışır.

Hümayə öz işində intizamlı, diqqətli və qayğıkeş olmasına, xəstələrə şəfqətlə yanaşmasına görə, kollektivdə böyük hörmət qazanmış, dəfələrlə rəhbərlik tərəfindən təşəkkür və mükafatlara layiq görülmüşdür.

## İLYASOV EMİN ADIŞİRİN OĞLU



4 oktyabr 1939-cu ildə Şəki şəhərində fəhlə ailəcində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 saylı orta məktəbi bitirmişdir. 1957-58-ci illərdə Şəki İpək Kombinatında əmək fəaliyyətinə başlamışdır. 1958-ci ildə hərbi xidmətə çağırılmış və 1962-ci ilədək orduda xidmət etmişdir. 1962-64-cü illərdə Şəki rayon rabitə qovşağında və taxılçılıq sovxozunda teleqrafçı və radist işləmişdir. 1964-1969-cu illərdə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda oxuyaraq mühəndis-mexanik ixtisası almışdır.

1969-1970-ci illərdə müxtəlif kolxozda mexanik, usta vəzifələrində çalışmışdır.

1970-1974-cü illərdə Azərbaycan KP –nın Şəki şəhər Komitəsində təlimatçı, 1974–1981–ci illər ərzində Şəki Şəhər Xalq Nəzarəti komitəsinin sədri vəzifələrində işləmişdir.

1981-1998-ci illərdə " Qırmızı oktyabr " sovxozunda baş mühəndis, İstilik Sistemləri İdarəsində direktor, "Azərnəqliyyattikinti" trestində sahə rəisi, Şəki Təcrübə-Sınaq Zavodunda baş mühəndis, Şəki rayon təsərrüfatlararası Yemçilik müəssisəsində baş iqtisadçı vəzifələrində çalışmışdır.

1998-ci ildən Şəki şəhər İHB- nin Daşüz kəndi üzrə icra nümayəndəsi vəzifəsində işləyir. 1974-81-ci illərdə



Azərbaycan KP Şəki şəhər Komitəsinin plenum və büro üzvü, rayon Xalq deputatları sovetinin deputatı və İcraiyyə komitəsinin üzvü olmuşdur.

Əmək fəaliyyəti dövründə "Şərəf nişanı " ordeni, "IX beşilliyin zərbəçisi", " Sosializm yarışının qalibi" döş nişanları ilə təltif olunmuşdur.

Ailəlidir. 3 övladı, 4 nəvəsi, bir nəticəsi var.

## İLYASOV NADİR QƏDİR OĞLU



1938-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1947–57–ci illərdə Şəki şəhər 10 N-li məktəbdə təhsil almışdır. Məktəbi qurtardıqdan sonra Şəki İpək Kombinatında işləmişdir. 1958-ci ildə Azərbaycan Politexniki İnstitunun memarlıq fakültəsinə daxil olmuş, 1964-cü ildə "Memar" ixtisası almışdır. Oxuduğu müddətdə institut üzrə Tələbə Şurasının sədri və "Politexnik" qəzetinin əməkdaşı olmuşdur. İnstitutun tərkibində fəaliyyət qöstərən "Tələbə Elmi Cəmiyyəti"nin üzvü olmuş, Şəki şəhərində qədim tarixi abidələrin öyrənilməsi sahəsindəki işləri təqdirəlayiq qiymətləndirilmiş və müxtəlif məqalələri institut qəzetində dərc olunmuşdur. 1964-cu ildə Qazaxıstanın Quryev şəhərində layihə institunda Baş memar vəzifəsinə təyin edilmişdir. Həmin ildə suda batan bir adamı xilas edərkən özü həlak olmuşdur.



## İSAYEV MÜLAHİM ABDULQƏNİ OĞLU



1937-ci ildə Dağıstan Muxtar Respublikasının Axtı rayonunun Xınov kəndində anadan olmuşdur. İlk təhsilini həmin kənddə aldıqdan sonra 1952-ci ildə ailəsi ilə birlikdə Şəki rayonunun Qoxmuq kəndinə köçmüşdür. Sonra təhsilini 10 saylı orta məktəbdə davam etdirən Mülahim 1957-ci ildə həmin məktəbi bitirmişdir.

1957-ci ildə ordu sıralarına çağırılmış və üç il yarım hərbi xidmətdə olmuşdur. Ordudan qayıtdıqdan sonra Qoxmuq kəndində mexanizator işləyən mülahim kolxozun göndərişi ilə Azərbaycan Kənd Təsərrüfatı institutunun kənd təsərrüfatının elektrikləşdirilməsi fakultəsinə daxil olur. Ailə qurduğu üçün təhsilini yarımçıq qoyaraq Qax rayonunun müxtəlif kolxoz və sovxozlarında işləmişdir.

1973-cü ildə vəfat etmişdir.

## İSMAYILOVA ÇİMNAZ İSMAYIL QIZI



**1939**-cu ildə Şəki şəhərində ,müəllim ailəsində anadan olmuşdur. 1946-cı ildə Şəki şəhər 7 nömrəli məktəbə qəbul olunmuş, 1953-cü ildə Şəki 10 nömrəli orta məktəbdə təhsilini davam etdirmiş və 1957-ci ildə həmin məktəbi bitirmişdir. 1958-ci ildə Şəki Tibb məktəbinə daxil olmuş, 1960-cı ildə həmin məktəbin Mamalıq şöbəsini bitirmişdir. 1961-1964-cü illər ərzində Şəki şəhər mərkəzi xəstəxanasının cərrahiyyə şöbəsində tibb bacısı vəzifəsində əmək fəaliyyətinə başlamışdır.

1986-cı ildən indiyədək Bakı şəhərində Uşaq evində tibb bacısı vəzifəsində çalışır. İşlədiyi müddətdə müxtəlif mekafat və fəxri fərmanlarla mükafatlandırılmışdır.

1965-ci ildə ailə qurmuşdur. İki qızı və bir nəvəsi var.



## İSMAYILOVA SARİYƏ DAVUD QIZI



**1935**-ci ildə anadan olmuşdur. İlk təhsilini Şəki şəhər 7 saylı orta məktəbdə almış, 1957-ci ildə 10 saylı məktəbi bitirmişdir.

Məktəb illərində idman yarışlarında fəal idi və müvəffəqiyyətlə çıxış edərdi.

Çətin ailə vəziyyəti ilə əlaqədar təhsilini davam etdirə bilməmişdir.

Ailəli idi. 6 övladı , 14 nəvəsi və 2 nəticəsi vardır.

2009-cu ildə vəfat etmişdir.

## İSRAFİLOVA SƏDAQƏT İSMAYIL QIZI



1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə Şəki 7 saylı orta məktəbə daxil olmuş və 1957-ci ildə 10 nömrəli orta məktəbi bitirmişdir. Məktəbi qurtardıqdan sonra Şəki İpək Kombinatında əmək fəaliyyətinə başlamışdır. Kombinatda hesablayıcı, fakturist işlədikdən sonra mühasib vəzifəsinə təyin olunmuş və 35 il həmin vəzifədə çalışmışdır. Əmək veteranıdır.

Hazırda təqaüdçüdür. Evlidir. 4 övladı , 6 nəvəsi vardır.



## KƏRİMOV AĞALAR AĞAMİ OĞLU



1937-ci mart ayında Bakı şəhərində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 2 saylı orta məktəbə daxil olmuş, ikinci sinifdən 10 nömrəli orta məktəbə keçirilmiş və 1957-ci ildə həmin məktəbi bitirmişdir. Həmin il Azərbaycan Politexnik İnstitutunun "İnşaat və memarlıg" şöbəsinə daxil olmuş, 1963-cü ildə həmin institutu müvəffəgiyyətlə bitirərək, memarlıg ixtisası almış və təyinatla Kənd Tikintilərinin Layihələşdirilməsi İnstitutunda əmək fəaliyyətinə başlamışdır. 1968-cı ildə Ət-Süd Sənaye Nazirliyinə göndərilmiş , orada Əsaslı Tikinti Şöbəsinin rəisi vəzifəsinə təyin olunmuş, sonralar isə həmin nazirliyin Tikinti-guraşdırma və Sazlama İdarəsinin rəisi, Tikilən müəssisələr direktorluğunun müdiri vəzifələrində çalışmışdır. Ət-Süd Sənayesi nazirliyi ləğv edildikdən sonra Korlar cəmiyyətinin nəzdində tikinti-istehsalat birliyinin baş mühəndisi vəzifəsində işləmişdir.

Ailəlidir. Üç övladı, 2 nəvəsi var.

Əmək fəaliyyəti dövründə müxtəlif mükafatlara və Fəxri-fərmanlara layiq görülmüşdür.

1996-cı ildən təqaüdçüdür.

## QARAYEV AKİF ƏHMƏDİYƏ OĞLU



*1940*-cı ildə Şəki rayonunun Oxud kəndində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 saylı orta məktəbə daxil olmuş, 1957-ci ildə həmin məktəbi bitirmişdir. 1959-cu ildə Bakı Politexnik Texnikumuna daxil olmuş və 1963-cü ildə oranı müvəffəqiyyətlə bitirmişdir, Ağsu və Şəki şəhərlərində qaz idarələrində rəis vəzifələrində çalışmışdır. 1963-cü ildə Azərbaycan Politexnik institituna daxil olmuş , 1969-cu ildə institutun axşam şöbəsini bitirmişdir. İnstitutda oxuduğu dövrdə Bakıda neft və qaz sənayesi müəssisələrində iş icraçısı, mühəndis, baş mühəndis, müəssisə müdiri vəzifələrində çalışmışdır. 1994- cü ildən təqaüdçüdür.

Ailəlidir. 4 övladı, 3 nəvəsi vardır.



## QƏDİROV YAŞAR ABDULLA OĞLU



*1939*-cu ildə Şəkinin Cəfərabad kəndində anadan olmuşdur. Atasını uşaqkən itirmiş, anasının himayəsi altında böyümüşdür.

1947-57 –ci illərdə Şəki ş. 10 N-li orta məktəbdə oxumuşdur. Məktəbi qurtardıqdan sonra müəyyən müddət kənddə kolxoz idarəsində işləmiş, 1964-cü ildə göndərişlə Kənd Təsərrüfatı Institutuna daxil olmuş, 1969-cu ildə "Mühəndis-mexanik"ixtisası üzrə həmin institutu bitirmişdir. Təyinatla Şəki Kənd Təsərrüfatı Texnikumuna işə göndərilmişdir. Uzun müddət texnikumda savadlı və qabaqcıl müəllim kimi tanınmış, kənd təsərrüfatı mütəxəssislərinin hazırlanmasında xidmətləri olmuşdur.

1969 cu ildə ailə həyatı qurmuş 4 övladı, nəvələri var .

1994-cü ildə uzun sürən xəstəlikdən sonra vəfat etmişdir.

## QƏDİROVA SUDƏ ƏHƏD QIZI



14 sentyabr 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1953-cü ildə Şəkinin 18-ci rayonundakı 7-illik məktəbi bitirərək Şəki şəhər 10 nömrəli məktəbin 8-ci sinfinə qəbul olunmuş və 1957-ci ildə orta məktəbi bitirmişdir. Həmin ildə Şəki ş. Pedaqoji Texnikumuna daxil olmuş, 1959-cu ildə oranı " İbtidai sinif müəllimi " ixtisası üzrə bitirmişdir.

30 il müddətində Bakı "Sənaye avtomatikası" müəssisəsində işləmiş, müxtəlif mükafatlara layiq görülmüşdür. Əmək veteranıdır. Hazırda təqaüddədir.

1959-cu ildə ailə həyatı qurmuşdur. 3 övladı, 6 nəvəsi, bir nəticəsi var.



## QAZIYEVA OPERA CAHANGİR QIZI



16 sentyabr 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur.

10 №-li orta məktəbi bitirdikdən sonra 1 saylı Bakı Mamalıq Texnikumuna qəbul olunmuş, oranı "əla" qiymətlərlə başa vuraraq Bakıdakı M.Əzizbəyov adına Doğum Evində əmək fəaliyyətinə başlamışdır.

1964-cü ildə Azərbaycan Tibb İnstitutuna daxil olmuşdur. Lakin 3-cü kursdan sonra ailə vəziyyətinə görə təhsilini davam etdirə bilməmişdir. 1974-cü ildən 1990-cı ilə qədər Bakının Əzizbəyov rayonundakı 4 №-li xəstəxanada Baş tibb bacısı vəzifəsində çalışmışdır. 1990-cı ildən həmin rayonun 26 №-li xəstəxanasında əmək fəaliyyətini davam etdirmiş və 1995-ci ildə təqaüdə çıxmışdır.

1965-ci ildə ailə həyatı qurmuşdur. İki oğul anasıdır.

## LƏTİFOVA LƏTAFƏT LƏTİF QIZI



5 avqust 1939-cu ildə anadan olmuşdur. 1957-ci ildə Şəki ş. 10 saylı orta məktəbi bitirmişdir.

Həmin ildə Bakı " Əczaçılıq Texnikumu"na daxil olmuş, 1959-cu ildə oranı əla qiymətlərlə bitirib Şəki şəhər 84 nömrəli aptekdə əczaçı vəzifəsində əmək fəaliyyətinə başlamışdır.

İşlədiyi müddətdə müdriyyətin və bütün işçilərin hörmətini qazanmışdır.

1963-cü ildə ailə həyatı qurmuşdur.

4 övladı, 10 nəvəsi var. Uşaqlarının hamısı ali təhsil almışlar.



## MABUDOVA ZİYAFƏT VAHİD QIZI



5 avgust 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. 1958-ci ildə Şəki Toxuculuq texnikumuna daxil olaraq 1961-ci ildə texnik-texnoloq ixtisası ilə həmin texnikumu bitirmişdir. 1962-ci ildə Azərbaycan Politexniki İnstitutuna daxil olmuş və buranı mühəndis--texnoloq ixtisası üzrə bitirmişdir.

Əmək fəaliyyəti müxtəlif müəssisələrdə olmuşdur: Şəki İpək kombinatı-nəzarətçi; Bakı Komvol Kombinatı- nəzarətçi; Sumqayıt Kimya Zavodu – baş mexanik şöbəsində mühəndis; Sumqayıt "Neft və Kimya Proseslərinin Avtomatlaşdırılması". Layihə İnstitutunda – mühəndis; Bakı " Neft və Kimya Avadanlıqları üzrə Maşınqayırma Layihə İnstitutu" – mühəndis; Yünqül Sənaye Nazirliyinin konstruktor bürosunda mühəndis; Sahə Həmkarlar İttifaqı Respublika Komitəsində - şöbə müdiri vəzifələrində çalışmışdır.

Əmək fəaliyyəti dövründə " Şərəf nişani" ordeni "Əmək veteranı" medali və müxtəlif fəxri fərmanlarla təltif edilmidir. Dəfələrlə Rayon Partiya Komitəsinin üzvü, Rayon Xalq deputatları sovetinin deputatı seçilmişdir. İki övladı , iki nəvəsi var.

## MEHDİYEVA (SEYFULİNA) BİLQEYİS QURBAN QIZI



**23** aprel 1935-ci il tarixdə Şəki şəhərində anadan olmuşdur. !957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. Sonralar Bakı Pedaqoji Texnikumunda təhsilini davam etdirmişdir.

Ailəli, evdar qadın olub . İki oğlu var.

2000-ci ildə vəfat edib.



## MEHDİYEVA NİGAR QURBAN QIZI



*1937*-ci ildə Şəki şəhərində anadan olub. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirib.1961-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya institunua daxil olmuş, 1968-ci ildə "Dağ mühəndisi-geoloq" ixtisası üzrə həmin institutu bitirmişdir.

Uzun müddət Neft və Kimya Institutunda " Neft və Qaz Yataqlarının Geoloqiyası və Kəşfiyyatı" kafedrasında aparıcı mühəndis vəzifəsində işləmişdir.

Ailəli olub. Bir gızı var.

1999-cu ildə vəfat etmişdir.

## MƏCİDZADƏ RƏNA İSMAYIL QIZ



*1939*-cu ildə Şəki şəhərində ziyalı ailəsində anadan olmuşdur.

1946-cı ildə bir müddət Şəkidə 7 saylı orta məktəbdə oxuduqdan sonra 10 nömrəli orta məktəbə keçirilmiş və 1957- ci ildə həmin məktəbi bitirmişdir. Məktəbi qurtardıqdan sonra tezliklə ailə həyatı qurduğu üçün təhsilini davam etdirə bilməmişdir.

Bir qızı, dörd oğlu, yeddi nəvəsi var. Övladlarının hamısı ali təhsil almış və ailəlidirlər.



## MƏMMƏDOV ADİL YUSİF OĞLU



*1938* -ci ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. Şəki ət kombinatında sürücü–ekspeditor vəzifəsində işləmişdir. Adil hamıya qarşı sadə,mehriban və təvazökar idi.

1966-cı ildə Şəki Kənd təsərrüfatı texnikumuna daxil olmuş, 1969-cu ildə oranı "Texnik-mexanik" ixtisası üzrə bitirmişdir. 1970-ci ildə ailə həyatı qurmuş, 3 övladı 3 nəvəsi var.

1988-ci ilin may ayında vaxtsız vəfat edib.

## MƏMMƏDOV ŞAHİD NADİR OĞLU



19 aprel 1939-cu ildə Şəkinin Qoxmuq kəndində anadan olmuşdur. 1947-54-cü illərdə Qoxmuq kənd ibtidai məktəbini bitirmiş və həmin ildən Şəki ş. 10 N-li məktəbində təhsilini davam etdirərək 1957-ci ildə oranı bitirmişdir. 1958-1959- cu illərdə Gəncə Hesabdarlıq-Mühasiblik Texnikumunda oxumuş və 1959-cu ildə Qoxmuq kəndi "1 May" kolxozunda hesabdar vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1961-1964-cü illər ərzində Şəki şəhər Tibb Məktəbində feldşer ixtisası üzrə oxumuşdur. 1964-cü ildən 1968-ci ilədək Qoxmuq kənd Tibb məntəqəsində feldşer, 1978-c- ilə qədər isə həmin məntəqənin müdiri vəzifəsində çalışmışdır. 1978-ci ildən ömrünün sonuna kimi Şəki Sanitar-Epidemioloji stansiyasında işləmişdir.

Ailəli idi. Dörd övladı, yeddi nəvəsi var.

1984-cü ildə vəfat etmişdir.



## MƏMMƏDOV ŞÜKÜR QURBANƏLİ OĞLU



1940-cı il Şəkinin Baqqal kəndində anadan olmuşdur. 1947-ci ildə Baqqal 7 illik kənd məktəbinə daxil olmuş, həmin məktəbi bitirdikdən sonra 1954-cü ildən Şəki ş. 10 N-li orta məktəbdə oxuyub və 1957-ci ildə oranı bitirmişdir. Məktəbi qurtardıqdan sonra 1962-ci ilə qədər Şəki şəhər rabitə idarəsində işləmişdir. 1963-cü ildə Azərbaycan Politexnik İnstitutunun Metallurgiya fakultəsinə daxil olmuş, 1968-ci ildə həmin institutu bitirmişdir. Bakı şəhərində Mərkəzi Elektrotökmə Zavoduna təyinat almışdır. Təqaüdə çıxanadək həmin zavodda müxtəlif vəzifələrdə çalışmışdır.

1995-ci ildə təqaüdə çıxmışdır. Ailəlidir. Dörd övladı və altı nəvəsi vardır.

## MƏMMƏDOVA (ƏZİZOVA ) ƏDALƏT ƏHMƏD QIZI



**1939** -cu ildə Şəkidə anadan olmuş və 1957-ci ildə 10 saylı orta məktəbi biturmişdir.

Orta məktəbi bitirdikdən sonra muhasib işləmişdir. Evlidir. İki gızı, bir oğlu, altı nəvəsi var.

Ədalət Məmmədova 1957-ci il məzunlarının yubiley görüşlərindən həmişə fərəhlə söhbət açır, öz uşaqlarına da belə görüşləri keçirməyi tövsiyyə edir. Nəticədə onun oğlu və qızı da oxuduqları siniflərdə vaxtaşırı yubiley görüşləri keçiriblər.



## MƏMMƏDOVA KUBRA SALEH QIZI



**3** oktyabr 1938-ci il tarixdə Şəki şəhərində sənətkar-dulusçu ailəsində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. Şəki pedaqoji texnikumuna daxil olmuş, lakin ailə vəziyyəti ilə əlaqədar təhsilini tam başa vura bilməmişdir.

1960 - cı ildə ailə həyatı qurmuş və yoldaşı ilə birlikdə Şəki halvası sexində işləməyə başlamış, bu milli şirniyyat növünün bişirilrməsi ilə məşğul olmuşdur.

Bir oğlu, iki qızı, yeddi nəvəsi vardır.

22 dekabr 1995-ci ildə vəfat etmişdir.

## MƏMMƏDOVA SARA BƏXTİYAR QIZI



**1937**-ci ildə Bakı şəhərində anadan olmuşdur.

1-və 2-ci sinifləri Bakıda oxumuş, ailəsi Şəkiyə köçdüyünə görə 1948-ci ildən təhsilini Şəki şəhərində 7 və 10 nömrəli məktəblərdə davam etdirmişdir.

1957-ci ildə 10 nömrəli məktəbi bitirmişdir.

1965-ci ildə ailə həyatı qurmuşdur. Bir oğlu, bir qızı, dörd nəvəsi vardır.



## MƏMMƏDOVA ŞƏFİQƏ İBRAHİM QIZI



**1937**-ci ildə Bakı şəhərində anadan olmuşdur. 1947-ci ildə Bakı şəhəri 172 saylı məktəbə qəbul olunmuş və 1952-ci ildə ailə vəziyyəni ilə əlaqədar Şəkiy' köçmüş və 10 nömrəli məktəbin 5-ci sinifinə daxil olmuşdur. 1957-ci ildə həmin məktəbi bitirmişdir.

1958-ci ildə Bakı şəhər 1 nömrəli Tibb Məktəbinə daxil olmuş və 1960-cı ildə həmin təhsil müəssisəsini bitirmişdir. 1961-ci ildə Qax rayon mərkəzi xəstəxanasında tibb bacısı vəzifəsində əmək fəaliyyətinə başlamışdır. 1968-ci ildən Qax rayonu Sanepidstansiyada laborant vəzifəsinə keçirilmiş və təqaüdə çıxanadək həmin müəssisədə işləmişdir. Hazırda təqaüddədir.

1961-ci ildə ailə həyatı qurmuşdur. İki övladı və dörd nəvəsi var.

## MƏMMƏDZADƏ (SƏMƏDOVA) ZÜLQƏDƏ MƏMMƏD QIZI



**1938** -ci ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhəri Maksim Qorki adına 10 saylı orta məktəbi bitirmişdir. 1961-ci ildə Şəki Pedaqoji məktəbinin "Məktəbə qədər tərbiyə" şöbəsinə daxil olmuş, 1963-cü ildə həmin məktəbi əla qiymətlə qurtarmışdır. 1964-cü ildə Şəki şəhəri 1 saylı uşaq baxçasında tərbiyəçi işləmişdir. 1967-ci ildə Sumqayıt şəhəri 26 saylı uşaq baxçasında işlədiyi vaxt Azərbaycan Dövlət Pedaqoji İnstitunun qiyabi şöbəsinə daxil olmuş, 1972 -ci ildə oranı müvəffəqiyyətlə bitirmişdir. Həmin ildən ömrünün sonunadək Sumqayıt şəhərinin müxtəlif uşaq baxçlarında tərbiyəçi, metodist, baxça müdiri vəzifələrində çalışmışdır.

İşlədiyi müddətdə Sumqayıt şəhəri Mədəni-Maarif şöbəsinin Fəxri Fərmanı və 1998-ci ildə Əmək veteranı medalı ilə təltif edilmişdir. Onun işlədiyi dövr ərzində hazırladığı əl işləri müxtəlif sərgilərdə nümayiş etdirilmiş və indi də onun təcrübəsindən geniş istifadə olunur.

İki övladı, iki nəvəsi, bir nəticəsi var.

2003 –cü ildə vəfat etmişdir.



## MURADOV FURMAN BƏKİR OĞLU



**1939**-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci- ildə Şəki şəhər 10 nömrəli orta məktəbə daxil olmuş, 1957-ci ildə bitirmişdir.

1958-ci ildə Az.DBTİ –na daxil olmuş, 1962-ci ildə institutu bitirərək təyinat üzrə Şəki şəhər 3 nömrəli orta məktəbdə idman müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1964-66-cı illərdə Şəki Pedaqoji Məktəbində Mülki-müdafiə fənnindən dərs aparmış və SSRİ-nin "Mülkü-müdafiə əlaçısı " döş nişanı ilə təltif olunmuşdur.

1966-83-cü illərdə Şəki 19 saylı orta məktəbdə işləmiş və həmin illər ərzində məktəbin idmançıları hər il məktəblilərin spartakiadasının qalibi olmuşlar. O 1983-cü ildən 8 saylı məktəbdə işləyir.

Əmək fəaliyyəti dövründə " Qabaqcıl maarif xadimi" döş nişanı ilə təltif olunmuş və maarif nazirinin əmri ilə baş müəllim adına layiq görülmüşdür. 1993-cü ildə Ali dərəcəli müəllim, 1996-cı ildə Azərbaycan Respublikasının "Fəxri Bədən tərbiyəsi və idman işçisi" adı almışdır.

1966-cı ildə ailə qurmuşdur.

Dörd övladı, beş nəvəsi var. Muradovlar ailəsi idmançı ailəsi kimi tanınır. Furman müəllimin atası Bəkir müəllim və anası Səyyarə xanım respublika səviyyəsində tanınmış idmançılar olmuşlar. Bəkir müəllim Şəki "Bədən tərbiyəci və İdman" komitəsinin ilk sədri vəzifəsində işləmiş, Şəkidə yüksək dərəcəli idmançıların yetişdirilməsində böyük xidmətləri olmuşdur.

# MUSAYEV NEYMƏT İSMAYIL OĞLU



28 may 1941-ci ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbin 1-ci sinifinə daxil olmuş, 1957-ci ildə həmin məktəbi bitirmişdir.



1957-ci ildə istehsalatda qablayıcı vəzifəsndə əmək fəaliyyətinə başlamışdır.

1958-ci ildə Bakı Politexnik texnikumuna qəbul olunmuş, 1961-ci ildə həmin texnikumu bitirmişdir. Elə həmin il Ç. İldırım adına Azərbaycan Politexnik İnstituna qəbul olunmuş və həmin institutu 1967-ci ildə müvəffəqiyyətlə bitirərək, "İinşaat mühəndisi" ixtisası almışdır.

1961-1968-ci il-lərdə Azərbaycan Dövlət Layihə Institunda müxtəlif vəzifələrdə çalışmış, dövlət səviyyəli layihələrin həyata keçirilməsində fəal iştirak etmişdir.

1961-1968-ci- illər ərzində Azərbaycan Politexnik Institunda " İnşaatın iqdisadiyyatı və təşkili " kafedrasında assistent vəzifəsində işləmişdir. 1971-ci ildə Kuybışev adına Moskva İnşaat Mühəndisləri İnstitunun İnşaatın Iqtisadiyyatı və Təşkili kafedrasında aspiranturaya qəbul olunmuşdur. 1974-cü ildə aspiranturanı müvəffəqiyyətlə başa vurmuş, dissertasiya müdafiə edərək "Texnika elmləri namizədi" alimlik dərəcəsi almışdır. 1972-73-cü illərdə həmin institutda kiçik elmi işçi vəzifəsində çalışmışdır.

1974-cü ildən Azərbaycan Politexnik İnstitunun "İnşaatın iqtisadiyyatı və təşkili" kafedrasında baş laborant , 1975-76-cı illərdə "İnşaatın texniki təşkili" trestində bas mühəndis və rəis vəzifəsində işləmişdir.

1976-cı ildə Azərbaycan SSR Nazirlər Soveti nəzdində "Kolxozlararası baş tikinti idarəsi"ndə bölmə rəisi, 1976-84-cü illərdə " İnşaatda Əmək üzrə Ümumittifaq Elmi Tədqiqat və Layihə İnstitunun Zaqafqaziya kompleks şöbəsi"nin " Əmək vəsaiti mənbələri" sektorunun müdiri vəzifəsinə təyin edilmiş, sonralar öz xahişinə əsasən elmi işçi vəzifəsinə keçirilmişdir. 1984-90-cı illərdə Azərbaycan İnşaat və Memarlıq Elmi-Tədqiqat İnstitutunda böyük elmi işçi, şöbə rəisi, direktor müavini vəzifələrində çalışmışdır.

SSRİ Sosioloqlar Assosiasinın üzvü, texnika elmləri namizədi Neymət Musayev bir çöx elmi əsərlərin müəllifidir.

İki oğlu vardır.

Neymət Musayev 8 iyul 1990-cı ildə faciəli şəkildə vəfat etmişdir.



O, öz alicənablığı ilə dostları arasında böyük hörmət, nüfuz və sevgi qazanmışdı. N. Musayevin işıqlı xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

## MUSTAFAYEV AKİF ABİD OĞLU



2 fevral 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə şəhər 10 nömrəli məktəbinə daxil olmuş ,1957-ci ildə oranı bitirmişdir.



1961-ci ildə texnoloq ixtisası ilə başa vurmuşdur.

1958-ci ildə Bakı Neft Energetika Texnikumuna daxil olmuşdur. 1962-ci ildə ordu sıralarına çağırılmış, 1963-cü ildə xəstəliyə görə tərxis olunmuşdur.

Mustafayev böyük arzularla yaşayır, ali təhsil almaq, ailə sahibi olmaq istəyirdi. Əfsus ki, vaxtsız əcəl 25 yaşında onun arzularını nakam qoydu.

## MUSTAFAYEV OKTAY YUSIF OĞLU



1940-cı ildə Şəki şəhərində anadan olmuşdur.

1947-ci ildə Şəki şəhər 10 saylı orta məktəbinə qəbul edilmiş, 1957-ci ildə həmin məktəbi bitirmişdir.

Əmək fəaliyyəti dövründə Lenin adına Şəki Ipək Kombinatının toxucu Istehsalatında baramaaçan, texnoloq, sex rəisi, Ordubad baramaaçma fabrikində sex rəisi, toxucu fabrikində sex rəisi, Şəki Ipək Kombinatının Toxuculuq Istehsalatının hazırlıq şöbəsinin rəisi, laboratoriya rəisi, burucu sexinin rəisi, kombinat müdirinin tədris kursları üzrə müavini və s. vəzifələrdə işləmişdir.

O. Mustafayev ipəkçilik sənayesini mükəmməl bilən , təşkilatçılıq bacarığı və qayğıkeşliyi ilə fərqlənən rəhbər işçi kimi xatirələrdə qalmışdır.

Ailəli idi. İki oğlu və iki qızı vardır.

O.Mustafayev 2005-ci ildə vəfat etmişdir.

## OSMANOVA BARAT RƏHIM QIZI



**1940**-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki ş. 10 N-li məktəbi bitirərək, həmin il Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakultəsinin turk filologiyası şöbəsinə daxil olmuşdur. 1962-ci ildə təhsilini başa vurub, Azərbaycan EA-nın Şərqşünaslıq İnstitutunda əmək fəaliyyətinə başlamışdır.

Türkiyə Cümhuriyyətində gedən reformalardan olan dilin sadələşdirilməsi prosesi üzərində araşdırmalar aparmış və bu mövzuda geniş məqalə yazmışdır. Sonralar Türk poeziyasının tədqiqi üzərində işləyərək, namizədlik dissertasiyasını həmin tədqiqatın bir bölümünə həsr etmişdir. 1979-cu ildə Türk şerinin yeniləşməsində böyük rolu olan "Qərib" qrupunun yaradıcılarından Məlih Cövdət Andayın həyat və yaradıcılığı mövzusunda dissertasiya müdafiə edərək, filologiya elmləri namizədi alimlik dərəcəsi almışdır. Türk poeziyasına böyük bir monoqrafiya həsr edən tədqiqatçı, bu mövzuda 25-dən çox məqalə yazıb çap etdirmişdir. O, Azərbaycan MEA Ziya Büyadov adına Şərqşünaslıq İnstitunun Türk Filologiyası şöbəsində çap olunan "Türk ədəbiyyatı antologiyası"nin əsas



müəlliflərindən biridir. XX əsrin 20-ci illərində "Maarif və Mədəniyyət" jurnalında türk filologiyasına həsr olunmuş məqalələri toplayaraq tədqiq etmişdir. B. Osmanova ümumiyyətlə türk ədəbiyyatının tədqiqinə dair 40-a qədər elmi əsərin müəllifidir. Müxtəlif elmi-nəzəri konfranslarda məruzələrlə çıxış etmişdir.

Hazırda Azərbaycan MEA Ziya Bünyadov adına Şərqşünaslıq İnstitunun filologiya şöbəsində aparıcı elmi işçi vəzifəsində çalışır və BDU-nin Şərqşünaslıq fakultəsində türk ədəbiyyatından dərs deyir. AMEA-nın Şərqşünaslıq İnstitunun müdafiə şurasının və Elmi Şuranın üzvüdür.

Ailəlidir. İki övladı və dörd nəvəsi var.

## RƏHİMOV ROBERT RƏHİM OĞLU



**1939**-cu il fevralın 21-də İsmayıllı rayonunun İsmayıllı kəndində anadan olmuşdur. Atası Rəhimov Rəhim hərbçi olduğu üçün müxtəlif şəhərlərdə, o cümlədən, Bakı, İsmayıllı, Balakən, Qax, Şəki şəhərlərində yaşamış, oxumuşdur. 1957-ci ildə Şəki şəhər 10 N-li məktəbi bitirmişdir. 1957-59-cu illərdə Bakıda Sabunçu qəsəbəsində 6 saylı rabitə ildə Leninqrad Hərbi Rabitə Akademiyasına daxil olmuş vməktəbində oxumuşdur. 1965-ci ə 1971-ci ildə həmin akademiyanı qurtararaq zabit rütbəsi almışdır. Sonralar Sovet İttifaqının bir çox şəhərlərində, ADR-da Sovet qoşunları tərkibində hərbi qulluqda olmuş, polkovnik rütbəsinədək yüksəlmişdir. 1989-cu ildə Rostov Dövlət Universitetnin hərbi kafedrasında işləmiş və hərbi qulluğunu orada başa vurmuşdur. Hazırda həmin universitetdə əmək fəaliyyətini davam etdirir.

Ailəli idi. Üç övladı və dörd nəvəsi var.

R.Rəhimov 2009-cu ildə vəfat etmişdir.



## RƏŞİDOVA RƏNA MƏMMƏD QIZI



**1939**-cu ildə müəllim ailəsində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 saylı məktəbi bitirmişdir. Bir müddət " Şəki fəhləsi" qəzeti redaksiyasında korrektor işləmiş, 1960-cı ildə N.Tusi adına Azərbaycan Dövlət Pedağoji İnstitunun kimya-biologiya fakultəsinə daxil olmuşdur. 1965-ci ildə həmin fakultəni bitirərək, Respublika Kənd Təsərrüfatı Nazirliyinin Torpaq Quruluşu üzrə Dövlət Layihə İnstitunda kimyaçı-mühəndis vəzifəsində işləmişdir. 1979-cu ildən orta məktəbdə pedaqoji fəaliyyətə başlamışdır. Hazırda Bakı şəhəri Səbail rayonunun M.Rahim adına 7 saylı orta məktəbində kimya fənnindən dərs deyir. Uzun müddətdir kimya fənni üzrə metodbirləşmə sədridir. Dəfələrlə Səbail rayon təhsil şöbəsi tərəfindən Fəxri fərman və diplomlarla təltif olunmuşdur.

Ailəlidir. İki oğlu, bir qızı, üç nəvəsi var.

## SALEHLİ EDİSON MİRZƏ OĞLU



**15** yanvar 1940-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildən 1957-ci ilədək Şəki şəhəri Maksim Qorki adına 10 saylı orta məktəbdə təhsil almışdır 1957-ci ildə M.Əzizbəyov adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Neft və Kimya institunun mühəndis-mexanik ixtisası fakultəsinə daxil olmuşdur. 1962-ci ildə institutu bitirərək, 1962-1969-cu illərdə Bakı şəhərində yerləşən Tibb Preparatları Zavodunda müxtəlif vəzifələrdə calışmışdır. Zavodda işlədiyi müddət ərzində istehsalatda tətbiq etdiyi yeniliyə görə, 1963-cü ildə rəhbərlik tərəfindən təşəkkür almış və mükafatlandırılmışdır.



1969-cu ildə SSRİ silahlı Qüvvələrinə həqiqi hərbi xidmətə çağırılaraq 1972-ci ilədək xidmətdə olmuşdur. 1970-ci ildə Frunze şəhərinə Ali Uçuş Akademiyasına göndərilmiş və həmin ildə SSRİ Kommunist partiyası sıralarına qəbul olunmuşdur. 1972-ci ildə kapitan rütbəsində ordudan tərxis olunmuşdur. 1972-1975-ci illərdə Sovet Ticarət Texnikumunda texniki fənnlər üzrə müəllim, 1975-ci ildən 2003-cü ilədək Bakı Baza Energetika Texnikumunda müəllim, eyni zamanda "Arzu" Elmi tədqiqat istehsalat kommersiya kompaniyasında elmi tədqiqatlar departamentinin rəisi, Elmlər Akademiyasının inovasiya mərkəzində böyük elmi işçi, Ekologiya və Təbii Sərvətlər Nazirliyində də işləmişdir.

V.Altunin adına Ekologiya və Təbiətdən istifadə Beynəlxalq Akademiyasının 16.02. 2006-cı il tarixli qərarına əsasən, Akademiyanın həqiqi üzvü seçilmişdir. Bununla yanaşı, xroniki xəstəliklərin qarşısını almaq istiqamətində tərəfindən ixtira olunmuş tibbi aparatların tətbiqində əldə etdiyi nailiyyətlərə görə, həmin Akademiyanın 22 mart 2006-cı il tarixli qərarı ilə xüsusi medalla təltif olunmuşdur.

Hazırda təqaüddədir. Bir qızı, iki oğlu var.

## SÜLEYMANOVA NURIYƏ ƏLƏŞRƏF QIZI



1937-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1957-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbi bitirmişdir. Həmin ildə Bakı Ticarət Texnikumuna qəbul olmuş, 1961-ci ildə oranı müvəffəqiyyətlə başa vurmuşdur.

Texnikumu qurtardıqdan sonra təyinatla Sumqayıt şəhərinin ticarət təşkilatına göndərilmiş və orada ilk əmək fəaliyyətinə başlamışdır. 1972-ci ilədək Sumqayıt şəhərinin müxtəlif ticarət obyektlərində işləmişdir.

1972-ci ildə vəfat etmişdir

Ailəli idi. İki övladı, 4 nəvəsi var.



## SULTANOV AKİF ƏNVƏR OĞLU



28 sentyabr 1938-ci il anadan olmuşdur. 1947-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbə daxil olmuş, 1957-ci ildə bitirmişdir. 1957-1959-cu illərdə hərbi xidmətdə qulluq etmişdir.

Hərbi xidmətdən qayıtdıqdan sonra Şəki İpək Kombinatının rəssamlıq şöbəsində rəssamlıq fəaliyyətinə başlamış, 1962-ci ildə Azərbaycan Dövlət Rəssamlıq Məktəbinə daxil olmuşdur. 1967-ci ildə həmin məktəbi bitirərək fərdi yaradıcılıqla məşğul olmağa başlamışdır, O, ipək parçaların tərtibatı ilə yanaşı, mənzərə və natürmort janrında yaradıcılığını davam etdirmişdir. Dəfələrlə respublika və keçmiş SSRİ –nin bir sıra şəhərlərində öz əsərləri ilə çıxış etmiş, SSRİ Elmi Yaradıcılıq İnstitunun I dərəcəli diplomuna layiq görülmüşdür. Azərbaycan Respublikası Rəssamlar İttifaqının və Bədii fondunun üzvüdür.

1967-ci ildən Şəki Pedaqoji Texnikumunda təsviri incəsənət müəllimi işləməklə rəngkarlıq, rəsm, kompozisiya bə metodikadan dərslər aparır. Məktəbdə işlədiyi müddətdə Respublika Təhsil Nazirliyinin, Şəki şəhər Partiya və İcraiyyə Komitələrinin, habelə məktəb pedaqoji şurasının fəxri fərmanları ilə mükafatlandırılmışdır.

Ailəli idi. 3 övladı, 5 nəvəsi vardır.

A.Sultanov 2009-cu ildə vəfat etmişdir.

## SULTANOV ARİF ƏNVƏR OĞLU



27 mart 1937-ci ildə Şəki şəhərində ziyalı ailəsində anadan olmuşdur. 1957-ci ildə 10 saylı Şəki şəhər orta məktəbini bitirmişdir. !962-ci ildə Azərbaycan Politexnik Institutnun mexanika fakultəsini bitirərək mühəndis-mexanik peşəsinə yiyələnmişdir.

Əmək fəaliyyəti dövründə, Şəki ipək kombinatında, kiçik mühəndis vəzifəsindən başlayaraq, baş mühəndisin müavini, baş enerqetik, baş mexanik, təchizat şöbəsinin rəisi, baş direktorun müavini, sex və istehsalat rəisi vəzifələrində çalışmışdır. Müxtəlif mükafatlara layiq görülmüşdür.

Şəki İpək kombinatı ASC nəzdindəki buxar-güc qurğuları təsərrüfatının rəisi vəzifəsində işləyib. 1997-ci ildə təqaüdə çıxıb.

Ailəlidir. 3 oğlu, 6 nəvəsi var.



## ŞƏRİFOV ABİD QOCA OĞLU



Abid Qoca oğlu Şərifov 1940-cı il yanvarın 6-da Şəki şəhərində anadan olmuşdur.

O, 1947-ci ildə Şəki şəhər 10 saylı orta məktəbin 1-ci sinifinə gedərək, orta təhsilini 1957-ci ildə həmin məktəbdə başa vurmuşdur. Həmin il Azərbaycan Dövlət Politexnik İnstitutunun "İnşaat" fakultəsinə daxil olmuş, 1962-ci ildə institutu "İnşaat mühəndisi" ixtisası üzrə bitirmişdir.

Gənc mütəxəssis kimi "Bakıbaştikinti" idarəsinə təyinat alan Abid Şərifov 2 saylı trestin 25 nömrəli tikinti idarəsində tikinti ustası vəzifəsində əmək fəaliyyətinə başlamış, 1971-ci ilə qədər həmin idarədə iş icraçısı, böyük iş icraçısı işləmişdir. 1971-ci ildən isə "Bakısosialmədəntikinti" trestinin 9 nömrəli tikinti idarəsində istehsalat şöbəsinin rəisi, sonra baş mühəndis kimi fəaliyyətini davam etdirmişdir. 1972-ci ildə "Bakıbaştikinti" idarəsinin 23 N-li tikinti idarəsinin müdiri vəzifəsinə təyin edilmişdir. 1978-ci ildə Ulyanovsk şəhərində N.Nərimanovun heykəlinin quraşdırılması ölkə rəhbərliyi tərəfindən həmin idarəyə tapşırılarkən, A.Şərifovun fəal iştirakı ilə bu iş vaxtında, yüksək keyfiyyətlə yerinə yetirilmişdir. Onun səmərəli fəaliyyəti o zamanlar Azərbaycan KP MK-nin Birinci

katibi işləyən ulu öndər Heydər Əliyev rərəfindən yüksək təqdir edilmiş və həmin ildən A.Şərifov öz fəaliyyətini Azərbaycan SSR Nazirlər Sovetinin əsaslı tikinti şöbəsində böyük referent kimi davam etdirməyə başlamışdır.

Məsul vəzifəni bacarıqla icra edən Abid Şərifov 1980-ci ildə SSRİ Nəqliyyat və tikinti nazirliyinin "Azərnəqliyyattikinti" trestinin rəisi vəzifəsinə təyin olunmuşdur. Burada işlədiyi müddət ərzində o bir çox iri layihələrin icrasında iştirak etmişdir. Ümummilli lider, görkəmli dövlət xadimi Heydər Əliyevin böyük uzaqgörənliklə xalqın mənafeyi naminə həyata keçirdiyi Yevlax-Balakən dəmir yolunun çəkilişinin, Azərbaycanda neft sənayesinin inkişafında əhəmiyyətli rolu olan Qaradağ Dərin Dəniz Özülləri zavodunun hidrotexniki qurğularının tikintisinin və zavodu magistral dəmiryolu stansiyası ilə birləşdirən dəmir yolunun çəkilişinin vaxtında, yüksək keyfiyyətlə tamamlanıb dövlətə təhvil verilməsində Abid Şərifovun da əməyi olmuşdur.



1980-1987-ci illərdə A.Şərifovun rəhbərlik etdiyi trestin kollektivi Azərbaycan KP MK-nın (indiki Prezident Aparatının), Milli Təhlükəsizlik Nazirliyinin yeni inzibati binalarının inşasında və ölkə iqtisadiyyatı üçün mühüm əhəmiyyəti olan bir sıra obyektlərin tikintisində də əzmlə çalışmışdır.

1988-ci ildə SSRİ Nəqliyyat Tikinti Nazirliyinin qərarı ilə 6-№-li Yol Tikinti trestinin Yollayihə institutu bir neçə başqa müəssisə ilə birləşdirilməklə "Azərnəqliyyattikinti" trestinin bazasında "Azərnəqliyyatyoltikinti" Layihə-Sənaye Tikinti Birliyinə çevrilmişdir və Abid Şərifov həmin Birliyin rəisi vəzifəsinə təyin edilmişdir.

Əmək fəaliyyəti dövründə təcrübəli mütəxəssis kimi ölkə rəhbərliyi tərəfindən bir sıra beynəlxalq layihələrin icrasına da cəlb edilən A.Şərifov 1990-cı ildə SSRİ Nəqliyyat Nazirliyi tərəfindən Türkiyə Cümhuriyyətinə ezam olunmuşdur. Burada o, Türkiyəni Avropa ölkələri ilə birləşdirən 225 km.-lik Çərkəsköl-Kapukulu dəmir yolunun elektrikləşdirilməsi üçün yaradılan tikinti quraşdırma idarəsində müdir müavini vəzifəsində çalışmışdır. Qardaş Türkiyə Cümhuriyyətində öhdəsinə düşən vəzifəni layiqincə yerinə yetirib 1992-ci ildə Azərbaycana qayıdan A.Şərifov "Azərnəqliyyattikinti" Layihə-Sənaye Birliyinin rəisi vəzifəsinə təyin olunmuş, 1993-1995-ci illərdə isə "Azərnəqliyyatyoltikinti" Dövlət Şirkətinin prezidenti kimi fəaliyyətini davam etdirmişdir.

1995-ci ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Fərmanı ilə respublikada tanınmış tikinti-inşaat mütəxəssisi olan Abid Qoca oğlu Şərifov Azərbaycan Respublikası Baş nazirinin müavini vəzifəsinə təyin olunmuşdur.



Bu şərəfli vəzifədə çox böyük məsuliyyət və gərginliklə çalışan A.Şərifov müstəqil Azərbaycan Respublikasında gedən nəhəng tikinti-quruculuq işlərində daha da yaxından iştirak etməyə başlamış, inşaat sənayesinə, nəqliyyat, rabitə, kommunal təsərrüfatı və regionların inkişafı sahələrinə rəhbərliyi yüksək peşəkarlıq və bacarıqla həyata keçirmişdir.

Ötən müddət ərzində ölkə rəhbərliyinin tapşırığı ilə Heydər Əliyev adına Bakı-Tbilisi-Ceyhan neft kəmərinin, Heydər Əliyev Beynəlxalq Hava Limanının, Yenikənd Su Elektrik Stansiyasının, «Şimal» DRES-də güjü 400 MVT olan buxar-qaz trubinli elektrik stansiyasının, yüzlərlə digər istehsalat və sosial təyinatlı obyektlərin, avtomobil yollarının tikilib istifadəyə verilməsində əzmlə çalışmış, qarşıya çıxan irili-xırdalı bir çox problemlərin həllində hökumətin səlahiyyətli nümayəndəsi kimi zəruri istiqamət vermiş, yol göstərmiş, əhalinin çoxsaylı müraciətlərinə hər zaman həssaslıqla yanaşaraq, əlindən gələn köməyi əsirgəməmişdir.



Həmişə Vətəni və xalqı naminə çalışan Abid Şərifov Azərbaycan iqtisadiyyatının, habelə sosial sferanın və infrastrukturun daha da inkişaf etdirilməsinə xüsusi önəm verən ölkə Prezidenti İlham Əliyevin rəhbərliyi altında bu gün də dövlət əhəmiyyətli böyük layihələrin icrasına nəzarət edir: Bakıdan Rusiya, İran və Gürcüstan sərhədlərinədək çəkilən avtomobil yolları kimi nəhəng tikintilərin icrası və respublika iqtisadiyyatı üçün xüsusi əhəmiyyət daşıyan bir çox digər layihələr məhz belələrindəndir.

Bacarıqlı mütəxəssis və dövlət xadimi olan Abid Şərifov Azərbaycan Respublikası Prezidentinin Fərman və Sərəncamları ilə bir neçə Dövlət Komissiyalarına başçılıq edir. Fövqəladə hallar üzrə (1995-2006-cı illərdə), Azərbaycan Respublikasının işğaldan azad olunmuş ərazilərinin bərpası və yenidən qurulması, Yol Hərəkətinin Təhlükəsizliyi, Azərbaycan Respublikası ilə Türkiyə, Yaponiya, Çin və Bolqarıstan dövlətləri arasında iqtisadi əməkdaşlıq üzrə, Nazirlər Kabineti yanında Radiotezliklər üzrə və Azərbaycan Respublikuasının Avropaya İnteqrasiyası üzrə Dövlət Komissiyalarının sədri, İxrac neft və qaz boru kəmərlərinin təhlükəsizliyinin təmin edilməsi üzrə Dövlət Komissiyasının sədr müavin olaraq Azərbaycanın iqtisadi inkişafı uğrunda səylə çalışır.

A.Şərifovun rəhbərlik etdiyi dövrdə Fövqəladə hallar üzrə Dövlət Komissiyasının xətti ilə 1995-2006-cı illər ərzində respublika ərazisində baş vermiş təbii və texnogen qəzaların nəticələrinin aradan qaldırılması və mümkün qəzaların qarşısının alınması üçün xeyli işlər görülmüşdür. 2000-ci ilin mart ayında Bayıl yamacında baş verən torpaq sürüşməsindən öncə görülən profilaktik tədbirlər yüzlərlə insanın həyatını xilas etmişdir. 2000-ci il 25 noyabr tarixində Bakıda baş vermiş zəlzələdən ziyan çəkən onlarla çoxmərtəbəli yaşayış binasının qəza vəziyyətindən çıxarılması, onların uçmaq təhlükəsinin aradan qaldırılması, 800-dən artıq yaşayış evinin və sosial obyektlərin bərpası bilavasitə A.Şərifovun rəhbərliyi ilə həyata keçirilmişdir.



Ermənistanın hərbi təcavüzü nəticəsində zərər çəkmiş ərazilərin bərpası və yenidən qurulması üzrə Dövlət Komissiyasının nəzdində 1996-cı ildə Bərpa Agentliyi yaradılmış və bu Agentlik vasitəsilə işğaldan azad edilmiş ərazilərdən, həmçinin cəbhəyanı zonalardan köçmüş əhalinin öz doğma torpaqlarına qayıtmaları üçün normal şərait yaradılmağa başlanmışdır. Nəticədə respublika

büdcəsi və beynəlxalq təşkilatların maliyyə dəstəyi ilə Füzuli, Ağdam, Tərtər, Ağjabədi, Goranboy, Xanlar, Gədəbəy, Qazax, Tovuz, Akstafa rayonlarında və Naxçıvan MR-da Bərpa Proqramı üzrə ümumi dəyəri 85 mln. ABŞ dolları həcmində (bunun 45 mln.$ - əvəzsiz maliyyə yardımı olan qrantlar təşkil edir) irimiqyaslı quruculuq işləri görülmüşdür. Bərpa Proqramı çərçivəsində münaqişədən zərər çəkmiş yaşayış məntəqələrində 4714 yaşayış evi, 36309 şagird yerlik 101 məktəb, 697 çarpayılıq 53 tibb müəssisəsi, 1038 km elektrik hava xətləri, 219 transformator yarımstansiyaları, 855 subartezian quyuları, 300 km-dən çox su və irriqasiya xətləri bərpa edilərək istifadəyə verilmişdir. 6500-dən çox ailəyə 4,5 milyon ABŞ dolları məbləğində mikrokreditlər və 2567 baş mal-qara paylanmışdır. Yaradılan texniki və sosial infrastruktur şəbəkəsindən bu ərazilərdə yaşayan 200 min nəfərdən çox əhali istifadə edir. Bərpa Proqramı sayəsində bu rayonlara ümumilikdə 35 min nəfərdən çox əhali qayıtmışdır.

Bundan başqa 1997-2005-ci illərdə Bərpa Agentliyinin xətti ilə Avropa Birliyinin Fövqəladə Yardım Proqramları çərçivəsində ayrılmış 30 mln. avro məbləğində vəsait hesabına Bakı şəhərində M.F.Axundov adına kitabxanada, 9 tibb müəssisəsində, kimsəsiz və əlil uşaqlar üçün 9 internat məktəbində yenidənqurma işləri aparılmış, "H.Aslanov" metro stansiyasının və "İzotop" radioaktiv tullantılar məntəqəsinin tikintisi başa çatdırılmışdır. Şəki, Qəbələ, Qax, Ağdaş, Göyçay, İsmayıllı, Şərur rayonlarında 3550 pm uzunluğunda beton və daş



bəndlərlə SAhilbərkitmə işləri aparılmış, digər tədbirlər həyata keçirilmişdir. Agentliyin sifarişi ilə Səudiyə İnkişaf Fondunun krediti hesabına Bakı şəhərində 6028 şagird yerlik 5 müasir tipli məktəbin tikintisi, respublika büdjəsi hesabına isə Tarix Muzeyində və Hökumət Evində bərpa-yenidənqurma işləri aparılmışdır.

1998-ci ildə A.Şərifovun rəhbərlik etdiyi Dövlət Komissiyasının nəzdində yaradılan Ərazilərin Minalardan Təmizlənməsi üzrə Milli Agentlik döyüş zonalarında və keçmiş Sovet ordusuna məxsus sursat anbarının partladılması nətijəsində Ağstafa rayonunun Saloğlu kəndinə və Ceyrançöl ərazilərinə səpələnmiş mina və hərbi sursatların təmizlənməsi, zərərsizləşdirilməsi işlərini icra etmişdir. Bu işlərin yerinə yetirilməsinə 20,9 mln.$ məbləğində vəsait xərclənmişdir ki, bunun da 17,2 mln.$ müxtəlif donorların ayırdığı əvəzsiz maliyyə yardımları (qrantlar) təşkil edir. Füzuli rayonunun Horadiz qəsəbəsində və Xanlar rayonu ərazsində regional bazaların, Ağstafa rayonunun Saloğlu kəndində müvəqqəti bazanın tikintisi təmin edilmiş, 100-ə yaxın avtomaşın, o cümlədən 4 ədəd mexaniki minatəmizləyən maşın, minaaxtaranlar üçün xüsusi geyimlər və qurğular, kommunikasiya vasitələri alınaraq əməliyyatçıların istifadəsinə verilmişdir. Agentliyin gücü ilə 98127 ədəd hərbi təyinatlı sursat zərərsizləşdirilmiş, 42 milyon kv.m sahə təmizlənib müvafiq rayon icra hakimiyyətlərinə təhvil verilmişdir. Bütün bu işlərə bilavasitə nəzarət edən A. Şərifovun rəhbərliyi altında regional bazaların genişləndirilməsi, mütəxəssis hazırlığı, avadanlıqların alınması işləri davam etdirilir. Məlumdur

ki, bu gün 320 nəfər Avropa standartları səviyyəsində yüksək hazırlıqlı sapyor və mütəxəssislərin çalışdığı Ərazilərin Minalardan Təmizlənməsi Agentliyinin fəaliyyəti torpaqlarımız düşməndən azad edildikdən sonra daha böyük vüsətlə gedəcəkdir.

Belə zəngin ömür yolunu şərəflə keçmiş Abid Qoca oğlu Şərifovun zəhməti həmişə dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. O "Şərəf nişanı" və "Oktyabr inqilabı" ordenləri ilə təltif edilmiş, SSSR-nin "Fəxri nəqliyyat işçisi", Azərbaycanın "Əməkdar inşaatçısı" fəxri adlarına layiq görülmüşdür. Dəfələrlə müxtəlif medal və fəxri fərmanlar almışdır.

Dövlətçilik təfəkkürü ilə yaşayaraq bütün şüurlu həyatını doğma Vətəninə, xalqına və respublikanın inkişafına həsr edən Azərbaycan Respublikası Baş nazirinin müavini Abid Şərifov eyni zamanda bir ailə başçısı kimi də qayğıkeş həyat yoldaşı, həssas ata və mehriban baba olaraq üzərinə düşən vəzifəni layiqincə yerinə yetirir. O, sədaqətli ömür-gün yoldaşı Sədayə xanımla birgə iki gözəl övlad böyütmüş, ömrü boyu xidmət göstərdiyi doğma Vətəninə vicdanlı vətəndaşlar yetirmişdir. Hazırda oğlu Elçin bank mütəxəssisi, qızı Təranə isə həkim kimi öz peşələrində atalarının adına layiq çalışırlar.

Abid müəllim həm də dörd gül balanın sevimli və mehriban babasıdır.



## TEYMUROV AĞALAR ƏBDÜRRƏHİM OĞLU



1940-cı il dekabrın 21-də Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildə 10 nömrəli məktəbə qəbul olunmuş, 1957-ci ildə oranı bitirmişdir.

1958-ci ildə Azərbaycan Politexnik İnstitutuna daxil olub. Sadə, mehriban, təvazökar bir insan kimi tələbələr arasında böyük hörmət qazanır. Hələ uşaqlıqdan idmanı və musiqini sevən Ağalar gözəl futbol oynayar və tar çalardı. Məharətli tar çalmağına görə institutun musiqi ansamblına dəvət edilir. Ansamblın ən fəal iştirakçılarından biri olur.

1964-cü ildə Ağalar memarlıq sənəti üzrə institutu bitirir və təyinatla Azərbaycan Dövlət Layihə institutunda memar kimi fəaliyyətə başlayır. Təyinat müddəti bitdikdən sonra 1 saylı inşaat idarəsinə dəvət olunur . O, yeni iş yerində də özünü yüksək bilikli və bacarıqlı mütəxəssis kimi göstərir.

Çalışdığı hər bir sahədə tələbkar, çox dəqiq və işgüzar olan Ağalar Teymurov Azərnəqliyyat trestinə dəvət olunur və 446 saylı tikinti idarəsinə böyük mühəndis, bir müddət sonra isə rəis təyin edilir.

O, gözəl ailə başçısı idi. Üç övladı, dörd nəvəsi vardır.

A.Teymurov 2000-ci ildə vəfat etmişdir.

## YUSİFOVA SƏYYARƏ SEYFULLAH QIZI



27 avqust 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur. 1947-ci ildən 10 saylı orta məktəbdə oxumuş, 1957-ci ildə buranın məzunu olmuşdur.

1959-cu ildə Bakı Dövlət Universitetininiqtisadiyyat fakultəsinə daxil olmuş, 1964-cü ildə təhsilini fərqlənmə diplomu ilə başa vurmuşdur.

Bütün fəaliyyətini Azərbaycan Neft Maşınqayırma İnstitutuna həsr edən S.Yusifova burada iqtisadiyyat söbəsinin rəisi vəzifəsinədək yüksəlmiş və 2001-ci ildə təqaüdə çıxmışdır.

Ailəlidir. Bir oğlu, iki nəvəsi var.



# XATİRƏLƏR

## 1957-ci il məzunları

...Onların uşaqlıq illəri ağır müharibə dövrünə təsadüf etmişdi. Alman faşizminin təkcə keçmiş Sovet İttifaqına deyil, bütün yer üzünə vurduğu yaraları tezliklə sağaltmaq mümkün deyildi.

1957-ci il məzunları 1-ci sinifə gedəndə Dünya müharibəsinin qurtarmasından cəmi iki il keçmişdi. Müharibə uşaqlardan kiminin atasını, qardaşını, kiminin əmisini, dayısını, ya bir əzizini, doğmasını aparmışdı. Onların məsum uşaqlıq həyatı qəm, kədər, nisgil əhvalına bürünmüşdü. Heç birinin gözü gülmür, eyni açılımırdı...

Uşaqlardan çoxu məktəbə yamaqlı paltarda, köhnə ayaqqabıda gələr, dərs çantası əvəzinə kitab-dəftərini yaylığa büküb qoltuğuna vurardı. Və bu heç kimi təəccübləndirməyən adi hal idi. Dərsliklər, tədris ləvazimatları, dəftər-qələm, mürəkkəb çatışmazdı. Kitabları növbə ilə gecələr lampa işığında oxuyar, bir qarnı ac-bir qarnı tox səhərədək dərsə hazırlaşardılar. Ancaq bütün çətinliklərə baxmayaraq onların əsas məqsədi - dərsləri yaxşı oxumaq, yaxşı qiymətlər almaq, müəllimlərin inamını doğruldub imtahanlardan üzüağ çıxmaq idi. Çünki bu ba-

laca, ağıllı uşaqlar üçün dünyanın ən böyük dərdi – müəllimin inamını itirmək olardı!

Və bu ona görə belə idi ki, bu uşaqların həyatda ən böyük dayağı – ömrünü şam kimi əridərək körpə balalara elm, bilik, zəka nuru paylayan, onları təmiz vicdanla, saf əqidə ilə, əsil vətəndaş fədakarlığı ilə işıqlı sabaha doğru aparan həmin sevimli müəllimlər idi. Şagirdlər sinifdən-sinfə keçdikcə və müəllimlər bir-birini əvəz etdikcə, onların sevgisi, məhəbbəti, qayğıkeşliyi də sanki uşaqlarla bir yerdə artır, çoxalırdı.



## 1977-ci il / 20 il – İlk yubiley





# MƏKTƏB İLLƏRİ...

Əvvəllər qızlarla oğlanlar ayrı-ayrı məktəblərdə oxuyurdular. Şəkidə ən çox kontingenti olan, ən qabaqcıl müəllimləri və gözəl ənənələri ilə seçilən 10 N-li məktəb oğlanlar məktəbi idi.

1954-cü ilin yayında xəbər yayıldı ki, qızlar gəlir. Daha qızlarla oğlanlar eyni məktəbdə oxuyacaqlar. Sentyabrın 1-də ilk dərs günü səhər tezdən məktəbin həyatində həqiqətən oğlan uşaqlarının adət etmədiyi bir mənzərə göründü. Elə bil məktəbin bağçası çiçək açmışdı, hər yan gözəlləşmişdi - həyət qızlarla dolu idi...

Rəsmi təbrikdən sonra zəng çalındı. Hamı siniflərə doluşdu. Sinifdə müəllim jurnaldan davamiyyəti yoxladıqca oğlanlarla bərabər qızların da adlarını oxuyurdu: Barat... Sariyə... Ədalət... Nəzakət... Opera... Zülqədə... Səyyarə... Bilqeyis... Lətafət... Rəna... Validə... Şəfiqə... Sara... Simuzər...

Bununla sanki oğlanların sifətinə bir ciddilik çökdü, məsuliyyətləri artdı. Oğlanlar artıq danışıqlarına, davranışlarına, hərəkətlərinə xüsusi fikir verməyə başladılar. Elə bil onlar birdən-birə bir-neçə yaş böyüyüb, ağayanalaşıb, kişiləşmişdilər...

Tezliklə hamı bir-birinə isinişdi, qaynayıb-qarışdı, doğmalaşdı. Qızların gəlişi ilə sinifdə yaranan təmizlik,



səliqə-sahman könül oxşayırdı. Qızlar özləri ilə sinifə xoş ovqat, təravət gətirmişdilər. Onlar necə də gözəl-göyçək, həyalı, ismətli, ləyaqətli xanımlar idi! Kişiləşən oğlanlar da bu xanımların hər şıltaqlığına dözür, nazlarını çəkir, hətta başqa sinfin oğlanlarına qısqanmağa başlayırdılar. Bacılarını qorumağı qardaşlıq borcu bilirdilər...

Beləcə zaman keçdikcə ilk vaxtlar qızlarla bir yerdə oxuyacaqlarını eşidib əndişələnən, özlərini itirib həyəcan keçirən oğlanlar sonradan qızlarla mehriban dost, qardaş, bacı oldular, məktəb illərini bir yerdə əl-ələ, çiyin-çiyinə addımladılar. Bir-birlərinə kömək edə-edə, arxa-dayaq ola-ola təhsili başa vurdular. Ömür boyu unudulmayacaq şirin xatirələrlə zənginləşərək o işıqlı təhsil müəssisəsindən, gənclərin beyninə, qəlbinə, ruhuna nur saçan o müqəddəs ocaqdan ayrıldılar...

Sonralar oğlanların bacı bildiyi bu gözəl-göyçək, nazlı qızların hərəsi bir yuvaya pərvazlandı, ev-eşik qurdu, övlad sahibi oldu, oğul evləndirib qız köçürdürlər. Və bu gün artıq o nazlı, gözəl-göyçək, şıltaq qızlara neçə-neçə körpə şıltaq balalar «nənə» deyir...







# MARAQLI ANLAR

10 saylı məktəbin uşaqları da hamı kimi boş vaxtlarında kinoya gedir, teatrda tamaşalara baxır, mütaliə edir, özfəaliyyətlə, idmanla məşğul olurdular. Məktəbin çox zəngin kitabxanası var idi. Amma bununla kifayətlənməyənlər Şəkidəki «Nakam» adına mərkəzi kitabxanaya, yaxud M.Ə.Sabir adına uşaq kitabxanasına üzv yazılırdı. Məktəbdə tez-tez kitab müzakirələri, disputlar, ədəbi-bədii konfranslar keçirilir, diskussiyalar təşkil olunurdu.

Hamı mütləq mətbuata abunə yazılırdı. Abunə yazılışına nəzarət riyaziyyatçı Qurban müəllimə həvalə olunmuşdu. O da öz işinə böyük məsuliyyətlə yanaşır, qəzet-jurnalların şagirdlərə vaxtında çatdırılmasına çalışırdı.

Məktəbdən yığışıb tez-tez ekskursiyalara gedərdilər. Ən sevimli yer ulularin yadigarı, Azərbaycan xalqının istedadının, parlaq zəkasının, gərgin zəhmətinin bəhrəsi və Şərq memarlıq sənətinin incisi olan Xan Sarayı idi. "Gələrsən-Görərsən" qalasını, karvansarayları, dahi filosof, dramaturgiyamızın banisi M.F.Axundzadənin, məşhur maarifçi-pedaqoq R.B.Əfəndiyevin ev muzeylərini də ziyarət edərdilər.

Qabaqcıl əmək adamları, ikinci dünya müharibəsi veteranları, tanınmış şəxsiyyətlərlə, yaradıcı ziyalılarla müntəzəm görüşlər keçirilərdi. Belə tədbirlərin əsas

təşkilatçısı şagirdlərin yaxın dostu, məktəbin pioner baş dəstə rəhbəri Rəfiqə xanım idi.

Məktəbin özfəaliyyət dram dərnəyinə Azərbaycanın əməkdar artistləri M.K.Hacıoğlu və Bilqeyis Ələsgərova rəhbərlik edirdilər. «Hacı Qara», «Qaçaq Nəbi», «Xırs quldurbasan», «Ölülər», «Müsibəti-Fəxrəddin» və b. əsərlərdən səhnəciklər tamaşaya qoyulur, şagirdlər o tamaşalarda həvəslə çıxış edirdilər. Özfəaliyyət dərnəyinin üzvləri tez-tez valideynlər, şagirdlər, qonşu məktəblərin kollektivləri, şəhər zəhmətkeşləri qarşısında çıxış edirdilər.



İdmana da həvəs böyük idi. Hər kəs arzusuna uyğun futbol, voleybol, basketbol, yüngül atletika, boks, güləşlə məşğul olurdu. Xalq oyunları da yaddan çıxmırdı... İdmana çox həvəs göstərənlər Uşaq Gənclər İdman Məktəbinə gedərdilər. Digər məktəblərlə yarışlarda fərqlənən şagirdlərdən Furman, Rauf, Ağalar, Oktay, Azad, Raqub, Nemət, Adil, İbrahimxəlil, Arif və Akif qardaşları və b. adları 10 saylı məktəbin idman şərəfini qoruyanların sırasında fəxrlə çəkilirdi. İdmanla məşğuliyyət sağlam həyat tərzi ilə yanaşı, uşaqlarda dözüm, cəsarət, mərdlik, dostluq kimi müsbət keyfiyyətlər də formalaşdırırdı.

## 1987-ci il / 30 il





# FƏRQLİ XARAKTERLƏR

...Hamı məktəbdə eyni müəllimlərdən eynin dərsi keçib eyni bilikləri alsa da və hamı eyni bir təhsil ocağının qanun-qaydaları üzrə ümumi ab-havada yaşayıb-oxusa da, təbii ki, şagirdlərin hərəsi bir cürdür, hərənin özünəməxsus xasiyyəti, fərqli xarakteri var. 10 saylı məktəbdə də eynilə...



**Nadir Əhmədov** – kollektivdə xüsusi hörməti vardı, dərsə ciddi münasibət bəsləyər, özünü əsil ziyalı kimi aparardı;

**Ağalar Teymurov** – gözəl tar çalar, futbola böyük həvəs göstərərdi, hətta şəhərdə futbol meydançasının tikilməsi tələbi ilə bir dəstə uşağı başına yığıb şəhər Partiya və İcrayiyyə Komitələrinə getmişdi;

**Ağalar Kərimov** – sinifkom idi, ədəbiyyata böyük maraq göstərər, şeir yazardı, həmişə məntiqli danışardı, yay tətili zamanı xam torpaqlarda məhsul yığımında iştirak etmişdi;

**Furman Muradov** – qalın səslə ucadan danışardı, dəcəl oğlan idi, idmanın bütün növləri ilə məşğul olurdu, sevinəndə qəribə tərzdə «amanyum» deyib atılıb-düşərdi;

**Raqub Bəşirov** – istedadlı, iti zehnli, gülər üz, sadə, təşkilatçı kimi çox fəal idi, amma... tez-tez turnikdən yıxılıb qolunu sındırardı;

**Nemət Musayev** – çalışqan, mübariz, mərd, cəsarətli adam idi, hamıya xüsusi yanaşma qabiliyyəti vardı;

**Oktay Mustafayev** – dəcəl, cəld oğlan idi, ən çox da samovardan tökülən çayı qaynar-qaynar içməsi ilə hamını heyrətləndirərdi;

**Emin İlyasov** – diqqətcil idi, yazı lövhəsində riyazi tapşırıqları çox sürətlə səhvsiz həll edərdi, amma di gəl ki sinifdə məsələ-misal həlli zamanı başqalarının görməməsi üçün əli ilə dəftərinin üstünü örtərdi.

**Rauf Mirzəyev** – şirin danışığı vardı, duzlu-məzəli zarafatları ilə, danışdığı lətifələrilə ən qaraqabaq adamı belə güldürərdi;

**Ədalət Məmmədova** – ləyaqətli, təmkinli qız idi, amma bir dəfə səhvən tənəffüsdə fizikadan dərs deyən balaca boylu Əhəd müəllimi aşağı sinif şagirdi bildiyi üçün sinifdən qovmasını hər xatırlayıb güləndə o başın aşağı salıb utanırdı;



**Edison Salehli** – çox qabiliyyətli, həssas, çox da ərköyün uşaq idi, ən adi bir sözdən yanaqları qıpqırmızı qızarırdı, şaqraq gülüşü vardı, həzzlə əlini-əlinə vurub uğunardı;

**Adil Əzizov** – lap kiçik yaşlarından siqaret çəkərdi, özfəaliyyət dram dərnəyinin fəal üzvü idi, oynadığı bir rola görə ona «Xosu» ləqəbi yapışdırmışdılar;

**Akif Sultanov** – xüsusi rəssamlıq istedadı vardı, məktəbdə şüarların, divar qəzetlərinin ən bacarıqlı tərtibatçısı o idi;

**İbrahimxəlil Hacıyev** – dəcəllikdə mahir idi, bəzi müəllimlərə gün-verib işıq verməzdi, hətta bir dəfə rus dili dərsi deyən Əlihüseyn müəllimi qartopu atəşinə tutmuşdu...



**2002-ci il / 45 il**









# ROMANTİKA DOLU YUBİLEY TƏDBİRİ

...1977-ci il idi. 10 N-li məktəbi 1957-ci ildə bitirmiş məzunlardan bir qrupu – 10-c sinfinin şagirdləri təşəbbüs qaldırdılar ki, məktəbi qurtarmalarının 20-ci ildönümünü qeyd etsinlər. Razılaşmalardan sonra bu tədbiri keçirmək üçün Bakıda və Şəkidə təşkilati işlər üçün heyət yaradıldı. Hər iki tərəf bir-biri ilə müntəzəm əlaqə saxlayaraq işə başladı. Təşəbbüs qrupunun hazırladığı tədbirlər planı əsasında yoldaşlar arasında iş bölgüsü aparıldı. Hər kəs tapşırılan işə məsuliyyətlə yanaşır, gördüyü işlər barədə mütəmadi keçirilən yığıncaqda hesabat verirdi.

Məzunların öz imkanları hesabına oxuduqları sinif otağı təmir edildi, məktəbə bəzi avadanlıqlar alındı, hədiyyələr hazırlandı. Təşəbbüskarların köməyi ilə şüarlar, plakatlar yazıldı, müxtəlif stendlər düzəldildi. Ölkənin müxtəlif yerlərində məskunlaşmış, bir-birindən ayrı düşmüş məzunların hamısının iş yerləri, ünvanları dəqiqləşdirildi. Tez bir zamanda hazırlıq işləri başa çatdırıldı və...

...Və budur, səbirsizliklə gözlənilən gün gəlib çatdı – 1977-ci ilin 9 Mayı! Məktəb bayramsayağı bəzədilmişdi. Qələbə günündə bayram bayrama qarışmışdı. Məktəbin həyəti adamla dolu idi: müəllimlər, son sinif şagirdləri, 1-

ci sinfə gedəcək uşaqlar, valideynlər, dəvət olunmuş qonaqlar... Hamının üzündə bir sevinc, təbəssüm vardı.

Səhər saat 9 tamamda 20 il bundan əvvəl məktəbdən ayrılmış 1957-ci il məzunları həyətə daxil oldular. Sürəkli alqışlar qopdu. Vaxtilə bu həyətdə dəcəl, şıltaq uşaqlar kimi atılıb-düşən, indisə artıq yaşa dolub həyatın hər isti-soyuğunu görmüş, təcrubə qazanıb püxtələşmiş, mənən zənginləşmiş məzunları hamı sevinc dolu göz yaşları ilə qarşıladı. Ötən illər ərzində hərəsi bir ixtisas sahibi olmuş, ictimaiyyət üçün yararlı kadr kimi yetişib müxtəlif peşələrə yiyələnmiş, ailə qurub ev-eşik sahibi olmuş, valideyn adını qazanmış sabiq məzunlar həsrətlə bir-birini qucaqlayır, öpüşür, hal-əhval tuturdular. Bu kövrək mərasimdə az adam tapılardı ki, sevincdən axan göz yaşlarını saxlaya bilsin...



Mərasimin rəsmi hissəsində hərarətli çıxışlar, xoş arzulu təbriklər, maraqlı xatirələr bir-birini əvəz etdi. Hamı öz sevincini, fərəhini paylaşmağa çalışırdı. Üzlərində təbəssüm, qəlblərində fərəh dolu hisslər aşıb-daşan 20 ilin məzunları, həmçinin onların qocaman müəllimləri, şagirdlər, qonaqlar deyib-gülür, şənlənir, rəqs edir, mahnı oxuyurdular. Məzunlar özləri ilə gətirdikləri hədiyyələri doğma məktəbə, sevimli müəllimlərə, balaca şagirdlərə verdilər...

Nəhayət, zəng çalındı! Bu - 20 ilin o üzündən gələn və məzunların çoxdan bəri yadırğadığı məktəbin zəngi idi.

Onlar 20 il əvvəl olduğu kimi, yenə dəstə ilə üçüncü mərtəbədəki sinif otağına qalxıb öz yerlərini tutdular. Riyaziyyat müəllimi Zəkiyyə Mehdiyeva sinfə daxil olub jurnal üzrə adları oxumağa başladı, o oxuduqca məzunlar ayağa qalxıb cavab verirdilər. Ancaq bu cavablar şagirdlik dövründəki cavablardan fərqli idi; indi onlar məktəbi qurtarandan sonrakı vaxt ərzində keçdikləri həyat yolu barədə, təhsilləri, ixtisasları, peşələri, hazırkı mövqeləri, şəxsi həyatları barədə məlumat verirdilər.

Sevinclə kədər qoşadır, deyərlər. Bəzi məzunların adları çəkilsə də, ayağa qalxmır, müəllimin çağırışına cavab vermir, özləri haqqında heç nə danışmırdılar... Çünki onlar sinifdə deyildilər... Onlar həyatda da deyildilər... Belə hallarda məzunlar həyatdan köçmüş yoldaşlarının adları çəkildikcə ayağa qalxıb bir dəqiqəlik sükutla onların xatirəsini yad edirdilər...

...Sonra məzunlar ikinci Dünya Müharibəsində həlak olanların şərəfinə ucaldılmış Xatirə ansamblını ziyarət etdilər, vəfat etmiş müəllimlərinin, sinif yoldaşlarının məzarlarına baş çəkib üstünə gül-çiçək dəstələri qoydular, ruhlarına dua oxudular.



Tədbir «Soyuqbulaq» istirahət zonasında keçirilən ziyafətlə yekunlaşdı. Burada bir daha məktəb xatirələri çözələndi. Hamının ürəyi dolu idi. Müəllimlər də, məzunlar da bir-bir çıxış etdi, acılı-şirinli xatirələrini danışdılar...

Bu arada maraqlı bir nüans oldu. Məzun Şahin söz alıb Rza müəllimə müraciətlə dedi:

- Rza müəllim! Siz həmişə mənə deyərdiniz ki, yaxşı oxumasan sənin alacağın «Kamal attestatı» yararsız bir konfet kağızı olacaq. İndi mən Gəncədəki Qənnadı fabrikinin baş mühəndisiyəm. Düzəltdiyimiz konfetlərdən öz müəllimlərimə də hədiyyə edib onlara minnətdarlığımı bildirmək istəyirəm. Buyurun, nuş olsun, əzizlərim! Mənim "Kamal attestatımın" dadına baxın! – Bunu deyib, Şahin bir qalaq konfet qutusunu stolun üstünə qoydu.



Onun bu hərəkəti məclisi daha da şənləndirdi, hamı xeyli gülüşdü.

Məclis gecə yarısına qədər davam etdi. Sinif yoldaşları bir-birindən ayrılmağa çətinlik çəkirdi. Axı onlar yenidən tapışıb, doğmalaşıb, isinişib bir sinif olmuşdular...

Səhəri gün dostlar ayrılanda qərara aldılar ki, belə tədbirlər hər beş ildən bir keçirilsin.

***

Beləliklə, 1992-ci ildə respublikada yaranmış ictimai-siyasi situasiya ilə əlaqədar 35 illik yubiley istisna olmaqla, hər beş ildən bir 1957-ci il məzunları bir-birindən maraqlı, yadda qalan yubiley tədbirlərinə toplaşdılar.

45 illik yubileyə hazırlıq ərəfəsində 70 il öncə tikilmiş 10 saylı məktəbin dam örtüyü təzələndi, divarlar, sinif otaqları əsaslı təmir edildi, pəncərələr dəyişdirildi. Bir sözlə, binaya yeni həyat verildi.

Tədbir günü - 2002-ci il mayın 9-da isə yenə bütün məzunlar məktəbə toplaşdılar. Sevincli, nisgilli, duyğulu anlar yaşandı... Bir vaxtlar bu həyətdə atılıb-düşən, ora-bura qaçışan, deyib-gülən uşaqların saçları ağarmış, gənclik təravəti getmiş, şux əhval-ruhiyyəli uşaqları qayğılı, kövrək yaşlı insanlar əvəz etmişdi.

Hamı nəzərlərilə bir-birini axtarır, hamı öz dostunu arayırdı. Amma... Sıraların seyrəkləşməsini hüznlü əhvalla, kədərsiz qarşılamaq mümkün deyildi. Hanı Azad... hanı Nemət... hanı Ağalar... Oktay... Şahid... Nəsib... Nadir... Yaşar... Adil... Hanı bu dostlar? Bəs müəllimlər hanı? Coğrafiya dərsi deyən Rəmziyyə müəllimədən və rəsmxətti tədris edən Nuru müəllimdən başqa qalanları gözə dəymirdi... Deməк, dostlar da, müəllimlər də əbədiyyətə qovuşmuşdu... Onlar daha bir də bu məktəbə gəlməyəcək, bir də bu tədbirlərə qatılmayacaq, bir də zarafatlaşıb deyib-gülməyəcəkdilər...

Həyat nə qədər gözəl və nə qədər amansızmış, İlahi!

Ancaq nə etməli? Allahdan onlara rəhmət diləməkdən və qəbirləri nurla dolsun demək başqa çarəmi var?!



İnsan nə qədər kədərli anlar yaşasa da, həyat öz axarında davam edir.

***

...Beləcə, səhər saat 10-da məzunların 45 illik yubiley tədbirləri başlandı. Yenə çıxışlar, xatirələr, təbriklər, xoş sözlər, hədiyyələr... Tədbir həmişəki ssenari üzrə öz axarında davam etdi.

Və arzu olundu ki, növbəti yubiley tədbirləri daha şən, məzmunlu, səmərəli və unudulmaz keçsin.

***

Qarşıdan gələn 50 illik qızıl yubileyin əvvəlkilərdən fərqli, daha maraqlı, daha yadda qalan, rəngarəng olması hamını düşündürürdü. Həmişə olduğu kimi belə bir təklif özünün dəyərli, məntiqli ideyaları ilə fərqlənən Abid Şərifovdan gəldi. O, məzunlara, onların həyat və fəaliyyətlərinə, dərs deyən müəllimlərə həsr edilmiş kitab yazmağı təklif edirdi. Eyni zamanda kitabı yazmağı məktəbə, orada baş verən hadisələrə, tədbirlərə, müəllimlərə, sinif yoldaşlarına yaxından bələd olan, əvvəlki yubiley tədbirlərinin keçirilməsində fəal iştirak edən təşkilat komitəsinin üzvlərindən Neymət Hacıyev və Raqub Bəşirov tərəfindən ərsəyə gətirilməsini məsləhət bilindi. Belə bir kitabın yazılması respublika tarixində ilk təcrübə olduğundan məsuliyyətli olduğu qədər, həm də çətin idi.

Məzunların doğulub, boya-başa çatdıqları Şəkinin tarixi, onun gəzməli-görməli yerləri, Şəki maarifinin və eyni zamanda 10 saylı orta məktəbin inkişaf yolları haqqında məlumatlar toplamaq üçün arxiv sənədləri araşdırılmalı, qalaq-qalaq kitablar vərəqlənməli idi. Dərs deyən müəllimlərin dünyasını dəyişməsi onlar haqqında məlumatların toplanmasını çətinləşdirir, böyük zəhmət tələb edirdi.

Hərəsi bir diyarda məskunlaşmış məzunlarla əlaqə saxlayıb sənədlərini, tərcümeyi-hallarını, şəkillərini, məktəb



illəri haqqında xatirələrini toplamaq üçün xeyli vaxt lazım olurdu.

Yubiley tədbirlərində iştirak etmiş müəllimlərin, şagirdlərin, valideynlərin də xatirələrini əldə etmək heç də asan başa gəlmirdi. Nəhayət, gecəli-gündüzlü zəhmətin nəticəsi olaraq yubiley gününə kimi 200 səhifəlik "Unudulmaz illər" kitabı nəfis şəkildə nəşr edilərək işıq üzü gördü.

## 55 İLLİK YUBİLEYƏ HAZIRLIQ

Budur, artıq 2012-ci ildir və məzunlar özlərinin 55 illik yubileylərini qarşılayırlar. Həmişə olduğu kimi, yenə də təşkilati işlər sürətlə aparılır. Yenə onlar doğma məktəbə toplaşacaq, bir-birləri ilə görüşüb hal-əhval tutacaq, xoş xatirələr qoynunda deyib-güləcək, əziz müəllimlərinin, dostlarının məzarlarını ziyarət edəcək, doğma təhsil ocağının qayğıları ilə maraqlanacaq, yardımlar göstərəcək, yeni gələn gənc nəsilə öyüd-nəsihət, tövsiyyə verəcək, onları vətənə, torpağa, dostluğa və məktəbə sədaqətli olmağa çağıracaqlar...

Bu mövzu artıq başqa bir kitabın mövzusudur və inşallah, o kitab da 5 ildən sonra oxucularla görüşə gələcək.

Bu ilki yubiley mərasiminə qatılanlarla yanaşı, bir daha məktəbə gəlməyəcək, dostları ilə görüşməyəcək məzunlar da var. Onlar - haqq dünyasına qovuşub bu dünyadan köç edənlərdir. Bir daha onlara uca Tanrıdan rəhmət diləyir, qəbirləri nurla dolsun, deyirik!

Amin!



## BİTİB-TÜKƏNMƏYƏN XATİRƏLƏR

### *DANIŞIR MƏZUNLAR*

**Raqub Bəşirov:**

“Əlihüseyin müəllim mənim ən sevimli müəllimlərimdən biri olub. O vaxtlar Şəki şəhər kitabxanasında rus dilində çox gözəl və maraqlı kitablar vardı. Mən onları oxumaq üçün rus dilini öyrənir və istər istəməz oxuyurdum. Bunun nəticəsində də rus dilində az-çox danışırdım. Əlihüseyin müəllim mənim rus dilində danışmağıma çox sevinirdi və hətta mənə 7-ci sinifdə N.Qoqolun “ Revizor” kitabını bağışlamışdı. O həmişə mənə deyərdi: “Bəşir kişinin nəticəsi! Я желаю чтобы ты учился в Москве”. Sonralar həyat elə gətirdi ki, həqiqətən mənə Moskvada institutu oxumaq qismət oldu və Əlihüseyin müəllimin arzusu yerinə yetdi.



Школа № 10 города Нухи. Экзамен по ботанике в шестом классе. Фото С. Кулиева

...8-ci sinifdə rus dili müəllimimiz İvanovo şəhərindən institutu təzəcə qurtarıb qəlmiş Nelli İvanovna adlı cavan bir qadın idi. Rus dilini mən o zaman yaxşı bilirdim və sərbəst danışırdım. Müəllimə bir gün sinifdə , imtahana hazırlıq məqsədilə, yoxlama işi – inşa yazdırırdı. Sakitcə hamı inşanı yazıb verdik. Səhəri gün Nelli İvanovna mənə yaxınlaşıb pıçıltı ilə dedi: " -Рауф, я проверяла контрольные работы, многие получили оценку пять. Но я знаю что все они переписали с твоей работы. Поэтому не хочу ставить тебе четыре, потому что у тебя в беловике много ошибок, хотя в черновике этих ошибок нет..." Mən də dedim ki: "-Ну и что, возмите и исправьте ошибки." Yazıq elə qorxdu ki: "-Да ты что, ты что?! Я не могу. Моим почерком нельзя." Soruşdum ki, bəs nə edək? Dedi: "-Тебе самому надо приходить ко мне домой и исправлять все ошибки." Dərsdən sonra getdim onun evinə. Əri də evdə idi. Yazı işini mənə verdi, qaralamanı da gördüm. Ağartmada həqiqətən bir neçə yerdə vergül, nöqtə qoyulmayıb və bir yerdə söz yarımçıq yazılıb. Səhvləri düzəltdim. Nelli İvanovna qələmi qırmızı mürəkkəbə batırıb: "-Vot teper druqoe delo," – dedi və "5" yazdı."

***



**Nemət Hacıyev:**

"...Bizim uşaqlıq illərimiz müharibənin ağır günləri dövründə keçirdi. Müharibənin xalqa vurduğu yaraları tezliklə sağaltmaq, unutmaq mümkün deyildi.

Biz birinci sinfə gedəndə müharibənin qurtarmasından cəmi iki il keçmişdi. Məktəbə ilk gündən nimdaş, yamaqlı paltarda, ayaqqabıda gələnlərin də sayı az deyildi. Uşaqlıq həyatımızı kədər, qəm, küdurət bürümüşdü. Xoş rəftara, təskinliyə, sığala böyük ehtiyacımız vardı.

Müəllim ömrünü yanan şama bənzədirlər. Şam yanaraq dövrəsini necə şölələndirirsə, müəllim də öz elmi, zəkası, geniş dünyagörüşü və pedaqoji ustalığı ilə bizləri işıqlı sabaha hazırlayır. Belə bir vaxtda bizim də ən böyük dayağımız müəllimlər idi.

Bizim təhsil ləvazımatları ilə təchiz olunmağımız da dövrün çətinliklərindən kənarda qalmamışdı. Belə ki, dərs çantamız olmadığından kitab-dəftərlərimizi dəsmala büküb qoltuğumuza alardıq. Dərsliklər, tədris ləvazımatları azlıq edirdi. Sinifdə dörd-beş şagirdə bir dərslik düşürdü. Dərslərimizə neft lampasının işığında hazırlaşardıq. Yazımızın hüsnxətt qaydalarına uyğun olması üçün 86 nömrəli perodan istifadə edərdik. Bütün sinifə bir neçə mürəkkəb qabı olardı. Onu hər an qırılıb dağılmaqdan qoruyardıq. Kitab-dəftərlərimizin səliqəli qalmasından ötrü dəridən-qabıqdan çıxardıq.

Bütün bunlara baxmayaraq dərslərimizi yaxşı oxumağa, müvəffəq qiymətlər almağa, imtahanlardan üzüağ çıxmağa səylə çalışardıq. Dərsdən əlavə müxtəlif

fənlər üzrə məşğələlər keçirilərdi. Bu məşğələlərdə müəllimlərimiz yalnız zəif oxuyan uşaqlara deyil, həm də yaxşı oxuyan şagirdlərin təsadüfən aşağı qiymət almasından narahat olar, səbəbini öyrənər, onlara məsləhətlər verər, əlavə məşğul olardılar.

Dördüncü sinifdən başlayaraq hər il əksər fənlərdən imtahanlar verərdik. Dörd-beş nəfərdən ibarət qruplara bölünərək paylanmış biletlər üzrə imtahanlara hazırlaşardıq. Hər qrupa ən yaxşı oxuyan şagird təhkim olunardı. Bütün biletlərin suallarına tam cavab hazırlamayınca kitab-dəftərdən ayrılmazdıq.



İmtahanlara hazırlıq dövründə çəmənliklərdən dörd yarpaq yonca axtarardıq. Bu yoncanı özümüzə talisman hesab edərdik. Uşaq təxəyyülümüzə görə yoncanı tapan şagird mütləq imtahanlardan müvəffəqiyyətlə çıxacaqdır. İmtahanlara ciddi hazırlaşmağımızın nəticəsi olaraq bizdən təkrar sinifdə qalan olmazdı.

...Bizə kimya fənnini tədris edən Qədir Əhmədov çox təmkinli, mülayim təbiətli, hövsələli, uşaqlara fərdi yanaşmaqda mahir pedaqoq idi. Mövzunu peşəkarlıqla müxtəlif aspektlərdən təhlil edər, təcrübə materialları ilə tutuşdurar, məntiqi nəticələr çıxarardı.

Qədir müəllim şagirdlərə xatırladardı ki, kimya tez yadda qalan, eyni zamanda tez də unudulan fəndir. Buna görə də mövzuları tez-tez təkrarlamağı məsləhət bilərdi.

Hüseyin Salehov riyaziyyat müəllimləri arasında xüsusi yer tuturdu. O, dərin və hərtərəfli biliyə, praktik hazırlığa, məsuliyyət hissinə, prinsipiallığına, mütərəqqi pedaqoji ustalığına görə ad çıxarmışdı. Şagirdlərə qarşı ədalətli və obyektiv idi. O, öz ixtisasını gözəl bilməklə şagirdlərə fənni tədris etməyin ən optimal variantlarından istifadə edərək yüksək nəticələr əldə etməyə nail olurdu.

Riyaziyyat fənnindən qəbul imtahanı verən Şəkili uşaqlardan, onun Hüseyn müəllimin şagirdi olduğunu eşidən müəllimin, həmin uşağa çox böyük rəğbətlə yanaşdığı, "Hüseyin müəllimin şagirdi riyaziyyatı zəif bilə bilməz "-deyərək daha da dərindən suallar verdiyi və əksər hallarda, uşağın dərin biliyinə əmin olub, yüksək qiymət yazdığı hallar çox olmuşdur. Hüseyn müəllimin dərs dediyi şagirdlərin çoxunun seçdiyi ixtisas dəqiq elmlərlə bağlıdır.

...Məktəbimizin direktoru, eyni zamanda Azərbaycan dili və ədəbiyyatından dərs deyən Hüseyn Rəsulov öz fənnini çox şövq ilə tədris edərdi. Mövzuları bir-biri ilə əlaqələndirməkdə xüsusi məharət sahibi idi. Hansı şagirdin cavabından narazı qalardısa, mütləq növbəti dərsdə həmin şagirddən keçmiş mövzunu bir daha soruşardı. Tapşırılan şeirləri bütün sinfə əzbərlədərdi.

Hüseyn müəllim eyni zamanda hekayə, povestlər də yazardı. Yazıları «Şəki fəhləsi» qəzetində daha çox çap olunardı.



İxtisasca həkim olan Lütfəli Həsənov Hüseyn müəllimin ən yaxın ürək və qələm dostu idi. Bu məslək dostları hətta bir neçə əsəri müştərək yazmışdılar. Onların «Bağışla məni, əzizim» adlı dram əsəri dəfələrlə Şəki teatrının səhnəsində tamaşaya qoyulmuşdur.



Məktəbin bir qrup müəllimi 1960-cı il



Hüseyn müəllim «Şəki fəhləsi» qəzetinin nəzdində yaradılmış «Səbuhi» ədəbi məclisinin ən fəal və aparıcı üzvlərindən idi. Əsərləri tez-tez mətbuatda dərc olunan Lütfəli Həsənov, Nurpaşa Hümmətov, Rövzət, Yaqub Mahir, Ələşrəf Şayan, Nizami Nəbiyev, Şərif İdrisov və başqaları yeni yazdıqları əsərlərini bu məclisdə oxuyaraq müzakirə edərdilər.

Xalq şairi Bəxtiyar Vahabzadə tez-tez «Səbuhi»nin qonağı olar, müzakirələrdə iştirak edər, yeni yazarlara məsləhət və tövsiyyələrini verərdi.

Hüseyin müəllimin təklifi ilə mən də həmin ədəbi məclisə üzv oldum. Onun tövsiyyəsi sayəsində «Buz» adlı hekayəm «Şəki fəhləsi» qəzetində dərc olundu.

Rus dili və ədəbiyyatından dərs deyən Əlihüseyn Əfəndiyev dəcəllik edənləri otaqdan çıxarmamış sinfə daxil olmazdı.

Onu da qeyd edim ki, Əlihüseyn müəllimin çox zəngin şəxsi kitabxanası vardı. Əlihüseyn müəllimin mənə hədiyyə etdiyi bir neçə kitabı indi də əzizləyə-əzizləyə saxlayıram. Keçən əsrin əvvəllərində çox az tirajla, nəfis şəkildə buraxılmış Ş.Rustavelinin «Pələng dərisi geyinmiş pəhləvan» əsərinin üz qabığının iç üzündə Əlihüseyn müəllimin kiçik ölçülü fotoşəkili yapışdırılmış və kitabın ona məxsus olduğu qeyd edilərək imzalanmışdır. Bu indi də mənim kitabxanamın bəzəyidir.

Tarix dərsini tədris edən Rza Cəlilov evə verilən mövzunun şagirdlər tərəfindən xronoloji ardıcıllıqla icmallaşdırılmasını tələb edərdi. Köhnə mövzunu söylətdirdikdən sonra mütləq ondan beynəlxalq aləmdə baş verən hadisələr haqqında oxuduqlarını soruşardı. Belə halda o, qiyməti bir bal artırardı. Buna görə də biz yaxınlıqdakı «Nakam» adına kitabxanaya gedib qəzetlərin son saylarını vərəqləyərdik.



Biz aşağı sinifdə oxuyarkən hər həftə kollektiv şəkildə «Yeni yol» kinoteatrında filmlərə baxmağa gedərdik. Filmlər adətən rus dilində olardı. Rus dili müəllimimiz Məmməd Allahyarov tərcümə edərdi. Seansdan sonra filmin məzmununu geniş şəkildə müzakirə edərdik.

Məmməd müəllim dərs zamanı şagirdlərin fəallığını artırmaq üçün bəzi söz və cümlələri rus dilinə və ya əksinə tərcümə etdiərdi.

Mustafa Cabbarzadə (Şəkidə «Kürən Mustafa» kimi tanınır) bizə fizika və astranomiyadan dərs deyərdi. Öz peşəsini çox sevər, yeri gəldikcə mövzuya uyğun olaraq əyani və texniki vasitələrdən istifadə edərdi..."

***

**Xalidə xanım Abdullayeva:**

"Mənim ən ülvi xatirələrim məşhur mah-nı-da deyildiyi kimi"Məktəb illəri, ömrümün ən şirin, qayğısız illəri" məktəblə bağlı-dır.Yaxşı yadımdadır - ən çox sevdiyim fənnlər rus və ingilis dilləri idi . Bu dərsləri, xüsusən də öz gözəl,mədəni davranışı və intellekti ilə seçilən Məmməd Rəşidovun tədris etdiyi rus dili dərsini mən səbrsizliklə gözləyərdim.

Mən musiqiyə çox meyilli idim.Ona qörə də mək-təbin özfəalliyyət dərnəyində iştirak edirdim.Hətta bir dəfə məktəbin radiosu ilə Andrey Babayevin "Ana" mahnısını da ifa etmişdim.

İnsanın həyat yolunun təməli məktəb yaş-larında qoyulur və bundan asılı olaraq o, hə-yatda formalaşır. Bu yolda məni düzqün isti-qamətləndirən,özünə və başqalarına tələbkar olmağı öyrədən, atam Hacıməmməd Abdulayev olmuşdur.Onun ruhu indi də məni izləyir və mən həmişə olduğu kimi, yenə də onunla fəxr edirəm."

***



**Nəzakət xanım Cabbarova:**

"Çox savadlı, bilikli, uşaqlara qarşı qayğıkeş müəllimlərimiz vardı. Məktəbimizin direktoru,eyni zamanda azərbaycan dili və ədəbiyyatı müəllimimiz olan Hüseyin Rəsulovun xatirəsi mənim üçün həmişə əzizdir. Şagirdlər sinifdə nadinclik edəndə Hüseyin müəllim deyərdi: Uşaglar nəzakətli olun, elə bilməyin ki, sinifi-mizdə olan Nəzakət bəsimizdir."

Övladlarıma və nəvələrimə həmişə yaxşı oxumağı və müəllimlərə garşı diggətli olmağı tövsiyə edirəm."

***

**Ələfsər Əkbərov:**

"Bir gün rus dili muəllimimiz rəhmətlik Əlihüseyin müəllim dərsdə ifadə yazdırırdı. Mövzu Suvorov haggında idi. Şagirdlərdən biri vərəgdə ualnız " Suvorov bil Suvorov" sözlərini yazıb təhvil vermişdi. Əlihüseyin müəllim yazını yoxlayarkən bərk hiddətlənmiş və " bir" giymət yazmışdı. Səhəri gün həmin şagirdi ayağa galdırıb dedi:

" Ədə bir dənə cümlə yazmısan onu da səhv. Sənə yedinitsa yazmışam ki, bir də belə hərəkət etməyəsən. Otur!"

***

**Adil Sabit oğlu:**

"Məktəb illərində məktəbin özfəaliyyət dərnəklərin-də fəal iştirak edən Adil belə bir əhvalat söylədi:

...Məktəbin özfəaliyyət dərnəyininbir gün şəhərin istirahət parkında konserti olur. Burada Adil "Bəyənmir

məni" mahnısını oxumalı idi. Mahnı başlayarkən tar çalan Məhərrəm tarı bir az zildən çalir. Buna səs çatdıra bilməyən Adil boğulur və zaldakılar qülüşürlər. Xəcalətindən utanaraq tərləyir, cibindən dəsmalını çıxarıb tərini silib səhnədən çıxır.

Təsadüfən Adilin sinif rəhbər, rus dili myəllimi, Məmməd Allahyarov da bu konsertə baxırmış və bütün bunların şahidi olur. Səhəri gün Məmməd müəllim Adili dərs danışmağa çağırır. Onsuz da rus dilini zəif bilən Adil dərsini bilmir. Bu halda müəllim ona "Bəyənmir məni" mahnısını oxumağı təklif edir. Sinifdə uşaqlar gülüşür. Pərt olan Adil səsinin pozulduğunu bəhanə edir və mahnını oxumaqdan imtina edir. Belə vəziyyətdə Məmməd müəllim cibindən xırda pul çıxarıb Adilə verir və deyir: "Get çayxanada otur çay iç səsin açılsın." Bu dəfə uşaqlarla birlikdə o özü də gülür.



Tarix müəllimi, rəhmətlik Rza müəllimlə, Adil qonşuluqda yaşayırdılar. Bir qün Rza müəllim Adilin əkdiyi ləklərin alaqsız, tər-təmiz olduğunu qörüb soruşur: "Adil! Məktəbdə oxuyanda sənin başında tarix elmindən heç nə olmazdı, indi də baxıram sənin ləklərində heç alaq otları yoxdur. Hansı dərmandan istifadə edirsən ki, alaq otları tam məhv olur?"

Adil özünü itirmir və o dərmanı yalnız səhər tezdən qöstərə biləcəyini deyir... Səhər saat 6.00-da Rza müəllim ona yaxınlaşır və dərmanı verməyi xahiş edir. Adil cavabında ləkdəki bir alaq otunun kökündən yapışıb, "Bu alaq otlarının yeganə dərmanı budur!" - deyə dartıb çıxarır. Rza müəllim gülür və deyir: "Ay rəhmətliyin oğlu, bunu dünən deyə bilməzdin ki, məni səhər tezdən narahat etmisən?!"

Adil isə cavabında: "Ay Rza müəllim, əvvəla tezdən durub təmiz hava almısınız, ikinci, səhər tezdən torpaq şehli və yumşaq olduğuna görə alağı rahat təmizləmək olur, üçüncü də mən sizə dərman verəcəyimi vəd etməmişdim, sadəcə göstərəcəyimə söz vermişdim..." Rza müəllim gülərək deyir: "Adil, tarix fənnini pis bilsən də, demə ağıllı oğlansanmış."

...Ağır xəstəliyə tutulmuşdum. Müalicə olunmağa maddi imkanım yox idi. Əlimi həyatdan üzmüşdüm. Bunu eşidən sinif yoldaşlarım yığışaraq təcili yanıma gəldilər. Onlar hər gün həkimlərlə sıx əlaqə saxlayır, lazım olan dərmanları tapır, mənə mənəvi və maddi yardım göstərirdilər. Bu səxavətli qardaşlığın köməyi nəticəsində tezliklə xəstəliyə qalib gələrək ayağa qalxdım. Hazırda özümü gümrah hiss edirəm, işləyirəm. Mən və ailəm sinif yoldaşlarımın mənə olan qayğısını, diqqətlərini heç vaxt unutmayacağıq."

***

**İbrahimxəlil Hacıyev:**



"Məktəbdə dəcəl uşaqlardan sayılırdım. Rəhmətlik rus dili müəllimimiz Əlihüseyin müəllim sinifin qapısını açıb içəri girən kimi elə qapıdaca duraraq əlini irəli uzadıb deyərdi:

"Зангараб оглу Халил, - ты, Алиханов Рафиг - ты, а ну ка быстро выходите из класса..."

***

**Ramiz Hacıyev:**

" Rus dili müəllimimiz Əlihüseyin müəllim bir qün dərsdə çox danışdığımız üçün 4 nəfəri dərsdən çölə çıxardı. İmtahan zamanı həmin uşagları imtahanın sonunadək çöldə saxladı, yalnız hamı imtahanı gurtardıgdan sonra bizi imtahana buraxdı. Amma kəsmədi.

**Digər bir xatirə:** Qızım aşağı siniflərdə oxuyurdu.Bir dəfə məktəbdən qayıdanda coğrafiyadan dərs deyən Rəmziyyə müəllimənin ona " tələbəmin qızı" deyə müraciət etməsini söylədi. Sonralar öyrəndim ki, müəllimə sinifə daxil olan zaman ona zillənən gözlər içərisində çox illər öncə gördüyü baxışları seçmişdi. Bir daha necə qayğıkeş, həssas müəllimlərdən dərs aldığımın şahidi oldum."



***

**Emin İlyasov:**

"Həyatda məqsədə çatmaq tam mümkün deyil, amma bir çox məqsədimə, arzularıma övladlarımın həyatda özlərinə yaxşı yol seçmə tərzinə nail olmuşam.

Ailə qurmuşam, övlad və nəvələrim var, ali təhsil almışam, müxtəlif rəhbər vəzifələrdə çalışmışam. Keçdiyim dəhşətli, əziyyətli günlərin müqabilində bütün çətinliklərə sinə gərib, bu günə gəlib çatmağım, çalışqan olmağım, orta və ali təhsildə yüksək qiymətlərlə oxumağım, ən yaxşı insanlarla dostluq və yoldaşlıq etməyim, mənə həyatda öz qüvvəmin nəticəsində müəyyən nailiyyətlər qazanmağımın başlıca amili olmuşdur. Bütün bunları mən övlad və nəvələrimə də tövsiyə edirəm.

Mən özüm həyatımda hansı nailiyyətlərə müvəffəq olmuşamsa hamısı üçün allahıma, valideyinlərimə, müəllimlərimə və dostlarıma borcluyam. Valideyinlərim məni halallıqla, zəhmətlə böyüdərək boya-başa çatdırıblarsa, müəllimlərim elm öyrənməyi, mübariz, cəsarətli və dəyanətli olmağı, dostlarım isə dar günlərimdə həyatı sevməyi öyrədiblər. Müəllimlərimin , valideyinlərimin , dostlarımın mənə çəkdikləri zəhməti ömrüm boyu unutmaram.

Rəhmətlik Əlihüseyin müəllim çayı mürəbbə ilə içməyi çox sevərdi. Həmişə cibində balaca qabda mürəbbə gəzdirərdi. Bir gün mürəbbəni yadından çıxarıb evdə qoyur. Körpələrin Ramizi çağırıb evlərinə göndərir və arvadının ona verəcəyi mürəbbəni gətirib çayçı Osman kişiyə verməyi tapşırır. Ramiz yoldaşları ilə birlikdə mürəbbəni yedikdən sonra boş mürəbbə qabını yenidən kağıza bükür və gətirib Osman kişiyə verir. Fasilə vaxtı Əlihüseyin müəllim çay sifariş verir və Osman kişidən mürəbbəni gətirməyi xahiş edir. O mürəbbə qabını boş görüb əsəbi halda: - Körpələrin əlindən yalnız belə işlər gələr,-deyir.

Orta məktəb dövründə oğlanlara saç saxlamağa icazə verilmirdi. Vinetkaya şəkil çəkdirəcəyimiz üçün onuncu sinifin üçüncü rübündən hamımız saç saxlamağa başladıq.



Bir gün özü saç saxlamayan və bundan xoşu gəlməyən Rza müəllim tarix fənninə ən çox həvəs bə maraq göstərən Nemət Hacıyevi tapşırılan mövzunu danışmaq üçün lövhəyə çağırdı. Nemət dərsi danışdıqdan sonra müəllim ona "dörd" qiymət elan etdi. Nemət ayağa qalxaraq niyə ona "dörd" yazdığını soruşduqda: -Ədə kəkil buraxdığın bəs döyü, hələ "beş" də istəyirsən? Saçuvu qırxdırarsan, yenə beş alarsan,- deyə Rza müəllim cavab verdi. Bundan təsirlənən Nemət hönkürüb ağlamağa başladı.

Yoldaşlarımız onu sakitləşdirib təsəlli verməyə çalışanda Nemət:

-İndən belə jurnalist olmaq niyyətindən əl çəkdim. Tarixçi olacağam, - dedi...

Dedi də, oldu da."

***

**Sariyə xanım İsmayılova**:

"Həyatda məqsədimə nail olmuşam. Nəvə-lərimə yaxşı oxumağı, layiqli vətəndaş olmağı həmişə tövsiyə edirəm.



Xatirimdədir: 10-cu sinifdə ədəbiyyatdan yazılı imtahan idi. İnşa yazmışdıq. Müəllim mənim yazdığıma ara bir baxırdı. Axırda mənə dedi ki, İsmayılova, mən sənə "APİ Axundova" qetməyi məsləhət bilirəm. Təəssüflər olsun ki, evdəkilər məni oxumağa göndərmək əvəzinə tez ərə verdilər, oldum ailəli."

***

**Sədaqət İsrafilova:**

"Gözəl ailəm var. Tərbiyəli övladlar böyütmüşəm, hamısı evlidir. Nəvələrimə yaxşı nəsihətlər verirəm. Onlara daima yaxşı oxumağı, böyüklərə hörmət etməyi tövsiyə edirəm.

**Məktəb həyatından bir xatirə: ...**7 nömrəli məktəbin 5-ci sinifində oxuduğum zaman idman müəllimimizdən xoşum gəlmədiyinə görə idman dərsinə fikir vermirdim. Bir gün sinif rəhbəri mənə dedi ki, sən nə üçün idman dərsindən aşağı qiymət alırsan? İnanmıram ki, sən idmanı bacarmayasan. Dərsə yoxlama göndərəcəm.

Həqiqətən idman dərsinə yoxlama gəldi. Müəllim uşaqları sıraya düzdü və "Dəstə, sağa dön! "- komandası verdi. Hamı sağa döndü, mən isə bilərəkdən sola döndüm. Müəllim əsəbiləşdi: - Görürsünüz, bu öküz sağ ilə solu hələ də tanımır.

Bir gün Tarix dərsi idi. Rza müəllim sinifə girdi. Tam sakitlik idi. Amma sinifdə radio səsi eşidilirdi. Sinif yoldaşımız Rauf Əlixanov məktəbin tribunasındakı radionu naqillə telefon trubkasına qoşub trubkanı da ikiqat pəncərənin arasına qoymuşdu. Birdən Rza müəllim telefon trubkasını gördü və soruşdu ki, bunu kim düzəldib? Hamı susdu. Müəllim dedi: - Görünür gələn il bundan bətərinə rast gələcəyəm."

***

**Ağalar Kərimov:**

"9-cu sinifi bitirib yay tətilinə yenicə çıxmışdıq. Küçə ilə gedərkən Şəki şəhər Komsomol Komitəsinin birinci katibi Kamal müəllimə rast gəldim. Salamlaşdıqdan sonra Kamal müəllim Xam torpaqlara taxıl yığımına gedəcəklərini bildirdi.Mən ondan, məni də özləri ilə Kazaxıstana aparmasını xahiş etdim. O isə cavabında: - sən məktəblisən, biz işçiləri aparırıq, birdə ki, səni evinizdən də buraxmazlar, dedi. Mən isə cavabında:- Sən razılıq ver, qalanı isə mənim işimdir- dedim. Mən Kamal müəllimdən və evdən razılıq aldıqdan sonra 40 nəfərlik bir dəstə ilə Kazaxıstanın Xam torpaqlarına yola düşdük.

O zaman Xam torpaqlara Azərbaycandan 6580 nəfər Bakıdan yola salındı. Xam torpaqlarda üç aya qədər qalıb müxtəlifköməkliklər göstərdik və sağ-salamat evə qayıtdıq. Qayıtdıqdan sonra ilk dəfə səhər-səhər dərsə gələndə məktəbin müdiri Hüseyin müəllim başda olmaqla bütün şagirdlər məni alqışlarla qarşıladılar. Mən səfərim haqqında qısa məlumat verdikdən sonra siniflərə dağıldıq. Mən o zaman Xam torpaqlarda yaxşı işlədiyimə görə "Xam torpaqların fəthinə görə" medalına və fəxri fərmana layiq görülmüşdüm. Mən onları gəncliyimdən bir xatirə kimi saxlayıram."



***

**Rəna Məcidzadə:**

" Hər bir insanın həyatı bir neçə mərhələdən ibarət olur. Bu mərhələlərdən biri də məktəb illəridir. Bu illər çox müqəddəsdir. Tale elə gətirib ki, məktəb illərimiz müharibədən sonrakı illərə təsadüf edir. Yarı ac, yarı tox böyük həvəslə məktəbə gedərdik, oxuyardıq və müəllimlərimizin dediklərinə riayət edərdik. İnsan nə qədər yaşa dolsa da orta məktəb xatirələri heç vaxt yaddan çıxmır. Məktəb həyatından bir hadisə yadımdan çıxmır:

Çox uzun saçlarım vardı. Partada oturanda pəfiqələrim saçlarımı arxadan hörərdülər. Bir gün qızlardan biri saç hörüyümü partanın söykənəcəyinə bağlayır. Mənim bundan xəbərim yox idi. Tərs kimi müəllim məni yazı taxtasına çağırdı. Ayağa qalxanda gördüm partaya bağlanmışam. Uşaqlar qəhqəhə ilə gülüşdülər və dərs müəyyən müddət pozuldu.

Müəllimlərimiz çox alicənab və bilikli idilər. Allah onlara rəhmət eləsin.

Ən böyük arzusu nəvə toyu görməkdir. Allah qismət eləsin."

***

**Ədalət Məmmədova:**

"Mən müəllimlərimi həmişə məhəbbətlə yad edirəm. Hüseyin Rəsulov, Məmməd Rəşidov, Zəkiyə Mehdiyeva, Rza Cəlilov , Məmməd Allahyarov , Gədir Əhmədov, Seyfi müəllim və s. və s. Onları yadıma saldıqca elə bil ürəyim o illərə uçur. Allah onlara qəni-qəni rəhmət eləsin.

2000-ci ildə xəstəliyimlə əlaqədar Bakıya getmişdim. Təsadüfən yıxılıb başımı və dizlərimi yaralamışdım. Birdən Salehli Edison yadıma düşdü. Zəng çaldıq. O təcili gəlib məni və yoldaşımı iş otağına apardı, öz aparatı ilə müayinə və müalicə etdi. Müalicədən sonra bədənimdə olan ağrılar yox oldu. Buna görə mən Edisona minnətdaram.

1957-ci il məzunlarının yubiley görüşlərinin təşkilatçılarına öz dərin minnətdarlığını ifadə edir, onlara həyatda ən xoş günlər arzulayır."



***

**Sara Məmmədova:**

"Müəllimlərimizə ömrüm boyu borcluyam. Ona görə ki, onlar mənə Kamal attestatı almağımda hərtərəfli kömək ediblər.

Bir dəfə bütün siniflə birlikdə dərsdən qaçmışdım. Evdə bu əhvalatdan xəbər tutan kimi məni ciddi cəzalandırmışdılar."

***

**Furman Muradov:**

Qız nəvələrimə müəllim olmağı, millətin savadlanması üçün çalışmağı tövsiyə edirəm. Oğlan nəvələrimə isə Qarabağ torpaqlarının azad olunması uğrunda mübarizə aparmağı, nəslin ənənələrini davam etdirməyi arzulayıram. Mənim bir idman müəllimi kimi yetişməyimdə böyük zəhmətləri olan rəhmətlik atam Bəkir müəllimə və bədən tərbiyəsi müəllimim, rəhmətlik Şakir müəllimə minnətdaram. Onlar daim mənim xatirimdə yaşayır və mən də daim onlara oxşamağa çalışıram.

***

**Rəna xanım Rəşidova:**

Atamla, anamla bağlı xatirələrim əvəzsizdir. İbtidai təhsilimi anamdan almışam. Anam məktəbdə müəlliməm olub. Atamın universitet auditoriyasında söylədiyi məruzələr həyatımın ən mənalı dəqiqələri, ən ülvi xatirələrimdir. Onun ədəbi-estetik məruzələri, səlis, obrazlı nitqi həzin bir musiqi kimi yaddaşımda həkk olunmuşdur.

***



**Akif Sultanov:**

1. Bir gün Seyfi müəllim kimyadan yoxlama işi verdi və elan etdi ki, heç kəs "şparqalkadan" istifadə etməsin. Mütləq tutacağını və "2" yazıb sinifdən çıxaracağını dedi. Qardaşımla bir sinifdə oxuyurduq. Qardaşım texniki fənnləri yaxşı bilirdi. O mənə düşən biletin həllini yazıb astaca Seyfi müəllimin yan cibinə qoydu. Müəllim mənim yanımdan keçəndə ehmalca vərəqi onun cibindən götürüb tez köçürdüm. Yoxlama işini təhvil verəndən sonra müəllimə çox sağ olun dedim. Təəcüblə üzümə baxıb səbəbini soruşdu. Dedim:

- Müəllim, əgər Siz "şparqalkanı" mənə çatdırmasaydınız mən bu yoxlama işini yaza bilməzdim.

Müəllim bir qədər fikrə dalıb dedi:

-Sizdə ki bu fərasət var, sənin qiymətini kəsməyəcəm və sənə "4" yazıram.

2. Bir dəfə rəhmətlik dəhnəli Füzuli ilə dərsdən qaçıb Osman dayının çayxanasında gizlənmişdik. İdman müəllimi Şakir müəllim Osman dayıya yaxınlaşıb: "3 piti saxla" - dedi. Osman dayı "baş üstə" - deyib 3 piti dopusunu arxa otaqdakı şkafa qoydu. Füzuli ilə çox fikirləşmədən pəncərədən keçib 2 pitini götürüb aradan çıxdıq. Pitiləri yedikdən sonra boş dopuları gətirib yerinə qoyduq, sonra işin nəticəsini gözlədik. Şakir müəllim gəlib pitiləri istəyəndə şkafda 1-cə piti tapdı. Səbəbini Osman dayıdan soruşanda o dedi ki, vallah şkafa 3 piti qoymuşam. Şakir müəllim hirslənib pitini Osman dayının üstünə atdı. Qalmaqal qalxdı. Biz tez aradan çıxdıq və qorxumuzdan bir həftə bufetə ayaq basmadıq. Amma məktəbi qurtarandan çox keçmiş əhvalatı Şakir müəllimə danışdıq.

3. Riyaziyyatdan dərs deyən Hüseyin müəllim çox tələbkar və gözəl müəllim idi. Heç vaxt dərsə gecikməzdi. Mən riyaziyyatı qardaşıma nisbətən zəif bildiyim üçün onda belə bir fikir yaranmışdı ki, mən bütün misalları qardaşımdan köçürürəm. Bir dəfə ev tapşırığını çox əziyyətdən sonra şəxsən özüm heç bir kömək olmadan həll etdim və sinifdə Hüseyin müəllimə dedim ki, vallah-billah hamısını özüm tək həll etmişəm. O inanmadı və yenə mənə "3" yazdı. Mən çox pərt oldum...



Qış idi. Bərk qar yağmışdı. Mən heyfimi çıxmaq üçün gecə küçədəki qarı kürəkləyib yığdım Hüseyin müəllimin qapısının ağzına ki, qapı səhər açılmasın. Elə də oldu. Huseyin müəllim səhər qapını aça bilməyib - nərdivanla qapının üstündən aşmalı olmuşdu və dərsə gecikmişdi... Çox sonralar Hüseyin müəllimlə Bakıda görüşəndə əhvalatı ona söylədim. Məni qucaqlayıb dedi: - Əhsən, haqsızlığa qarşı etiraz etmisən!



***

**Ağalar Teymurovun həyat yoldaşı:**

Həyatını inşaata həsr edən Ağalar, şəhərdə tikilən böyük obyektlərə baxdıqca zövq alar , fərəhlənərdi. O, dostluqda çox etibarlı idi. Elə buna görə də həyatını dəyişəndən sonra da dostları onu unutmur, məzarını tez-tez yad edirlər. 1977-ci ildən başlayaraq Şəki 10 nöm-rəli orta məktəbin 1957-ci il məzunları hər 5 ildən bir məktəbi qurtarmağın yubiliyini qeyd edirlər. Məktəb dostları hər dəfə yubileylərə məni də dəvət edirlər . 2012-ci ildə – məktəblə vidalaşmağın 55 illik yubileyi qeyd ediləcək. Mən də həmin yubileyə dəvət olunduğuma çox sevinir və Ağaların əsl etibarlı dostlarına minnətdarlığımı bildirirəm.

***

**Səyyarə Yusifova:**

Sinifimizdə oxuyan uşaqların əksəriyyəti mənim kimi kasıb ailədən idi. Məktəbə həvəslə getmiş, yaxşı oxumuş, heç vaxt dərsdən qalmamışam. Riyaziyyat fənnini çox sevirdim. Bu fənndən düzəltdiyim cib dəftərçəsini indi də əziz bir xatirə kimi saxlayıram. Orada bütün riyazi düstur və qaydaları yazmışam. Yaddaş dəftərçəsini hazırlayıb özümüzlə gəzdirməyi bizə müəllimimiz Hüseyin Salehli tövsiyə etmişdi. Buna görə də Hüseyin müəllimin xatirəsini indi də hörmət və minnətdarlıqla yad edirəm. Məhz riyaziyyata olan bu sevgi məni dəqiq elmlər sahəsini seçməyə şövq etmişdi.

Oxuduğum " S " sinifində oğlanlar çoxluq təşkil etməsinə baxmayaraq onlar biz qızlara çox hörmətlə yanaşırdılar.

Məktəbdə ən yaxşı rəfiqəm bir sinifdə oxuyan Nəzakət idi.

***

**Opera Qazıyeva:**

Mən bibim oğlu ilə eyni sinifdə oxuyurdum. Şəkidə evləri olmadığı üçün, o bizdə qalırdı. Mən riyaziyyat fənnini çox zəif bilirdim. O isə riyaziyyatdan "kəllə" idi. Ev tapşırıqlarını hər gün ondan xəbərsiz onun dəftərindən köçürüb "5" alırdım. Bunu başa düşən bibim oğlu yatanda dəftərini yastığının altında gizlədirdi. Mən isə lap səhərə qədər olsa da, onun yuxuya keçməsini gözləyib dəftəri astaca başının altından götürər və tapşırığı köçürdərdim. Dəftəri götürə bilmədiyim günlərdə "2" alırdım...



***

**Lətafət Lətifova:**

"Həyatda həmişə xöşbəxt olmağı və gözəl ailə qurmağı arzulamış və buna nail olmuşam. Nəvələrimə daim ağıllı olmağı, yaxşı oxumağı, müəllimlərin, ata-anaların və bütün böyüklərin hörmətini qazanmağı, vətəni sevməyi, onun layiqli övladı olmalarını tövsiyə edirəm."

***

**Rəna Məcidzadə:**

"...Həyatda övladlarını və nəvələrini özü üçün ən böyük mükafat kimi qəbul edir, onları boya-başa çatdırıb vətənə layiqli bir övlad kimi böyümlərini ən vacib məsələ sayır.

***

**Ədalət Məmmədova (Əzizova ):**

Şəki 10 saylı orta məktəbin 1957-ci il məzunlarının yubiley görüşlərindən fərəhlə söhbət açır. Öz uşaqlarına da belə yubiley görüşlərini təşkil etməyi məsləhət görür. Nəticədə oğlu və qızı oxuduqları siniflərdə müvafiq olaraq 15 və 30 illik yubiley görüşləri keçiriblər.

***

**Lətafət Hüseynova (Ramazanova):**

Xatirə və arzuları: "... Həyatda arzum, məqsədim ailəmi xoşbəxt görmək, övladlarımı düzgün tərbiyə edib vətənə, xalqa layiq böyütmək olub. Mən çox xoşbəxtəm ki, bu arzularıma çatmışam. Orta məktəb müəllimlərinin şagirdlər üzərində çəkdiyi zəhmət danılmazdır. O illər yada düşəndə adam həm sevinir, həm də kədərlənir. O illər əlçatmaz və geri qayıtmazdır."

***



**İbrahim Mustafayev:**

"...Məktəbə getməyimiz ikinci Dünya müharibəsindən sonrakı yarı ac, yarı çılpaq illərə təsadüf edir. Yadımdadır, 6-7 yaşından hamı səhər yuxudan duran kimi çalışmağa başlayardı – ailənin böyük üzvləri iş dalınca gedər, balaca uşaqlar üçün də iş tapılardı, meşəyə, dağa çırpı yığmağa, ot və sünbül toplamağa gedərdilər. 8-9 yaşında bazarda, küçədə və ya müəssisələrin qarşısında evdə bişirlimiş təndir çörəyi

satar, özü üçün dərs ləvazimatına, paltar, ayaqqabı almağa pul toplayardı. İpəkçi ailələri ənənəvi olaraq uşaqlarını ipək məhsulu istehsal edən müəssisələrə aparıb öz sənətini övladına öyrədərdi.

Məlum olduğu kimi, Şəki qədim ipəkçilik diyarıdır, məşhur "İpək yolu" məhz Şəkidən keçib. Burada sənətə və təhsilə böyük maraq göstərilməsinin tarixi kökləri sənayenin inkişafı ilə üst-üstə düşür. İpək sənayesi xalq sənəti yaradıcılığının inkişafına, infrastrukturun yaranmasına təkan vermiş, təhsil və mədəniyyət ocaqları yaranmışdır. Tarixi mənbələrə görə, Rusiya imperiyasında birinci ipək manufakturası Şəkidə qurulmuşdur. Şəki ipəyi 19-cu əsrin axırları, 20-ci əsrin əvvəllərində London və San-Fransisko ümumdünya sərgilərində mükafatlara layiq görülmüşdür. 1930-cu ildə Zaqafqaziyada ən böyük ipək sənayesi müəssisəsi olan Şəki İpək Kombinatı tikilib istifadəyə verilmişdir.



Şəhərin ən böyük məktəbi olan 10 №-li məktəb respublikamız üçün çoxlu sayda pedaqoq, sənaye mühəndisi, tibb xadimləri, kənd təsərrüfatı mütəxəssisləri, akademiklər, professorlar, elmlər doktorları, nazirlər, nazir müavinləri, dövlət qulluqçuları və s. yetirmişdir. Onun keçmiş müdavinmlərindən sayılan – 55 il bundan öncə həmin məktəbi bitirmiş uşaqlar da Şəkinin və respublikamızın inkişafına öz töhfələrini vermişlər. Onlar öz bilik və peşəkarləqları ilə fərqlənmişlər. 1957-ci ildə orta məktəbi bitirmiş uşaqlar – tarixi ictimai formasiyaların şahidi və iştirakçısı olmuşalr. Onlar respublikamızın müstəqil və azad olmasında fəal iştirak etmişlər. Övladları, nəvələri isə müstəqil Azərbaycanın daha da inkişaf edərək qabaqcıl ölkələr sırasına çıxması yolunda çalışırlar.

Bütün bunlara zəmin yaradan amil həmin məktəbin müdavimlərinin hələ kiçik yaşlarından çətinlikləri bacarıqla dəf etməsi, oxumağa böyük səy göstərməsi səbəb olmuşdur. 55 il bindan qabaq olduğu kimi, yenə də onlar indi və əvvəllər tutduqları vəzifələrindən asılı olmayaraq bir sinif yoldaşları kimi bir-birini axtarır, görüşür, məktəbli səmimiyyətini saxlamaqda davam edirlər. Hər 5 ildən bir Şəkidə məktəbin özündə toplaşıb yubileylərini qeyd etmələri də bu səmimiyyətin, dostluğun nəticəsidir."

## YUBİLEYLƏ BAĞLI ÜRƏK SÖZLƏRİ

"...1957-ci ilin məzunları öz yubileylərini qeyd etmək üçün hər 5 ildən bir doğma məktəbə dönürlər. Artıq hər birinin cəmiyyətdə müəyyən yeri, mövqeyi olsa da, onları bir arzu-dilək birləşdirir – təhsil aldıqları məktəbə gedib kollektivlə görüşmək! Bu görüşlər zamanı onlar sanki məktəbə, müəllimlərə öz həyat yolları, uğurları barədə hesabat verir, şagirdlərə məktəbi sevməyi, yaxşı oxumağı məsləhət görürlər. Həmin yubiley günləri məktəblilər üçün gözəl bir həyat dərsi, qədirşünaslıq nümunəsi olur."

**Sevinc Əliyeva,**
**10 №-li məktəbin müəllimi**



***

"...1977-ci ildən bu məktəbdə işləyirəm. 1957-ci il məzunlarının bütün yubileylərinin iştirakçısı olmağımdan fərəh duyuram. Məzunların hamılıqla iştirak etdikləri tədbirlər maraqlı, rəngarəng və yaddaqalan olur. Müxtəlif yerlərdə yaşamalarına, ayrı-ayrı sahələrdə çalışmalarına, kamillik dövründə olmalarına baxmayaraq, doğma məktəbi daim yad edirlər. Onlar hər dəfə məktəbə gələndə yaddaşlarda dərin iz qoyub gedirlər... Ötən dövr ərzində onlara dərs deyən müəllimlərin hamısı, yoldaşlarının isə bir qismi dünyasını dəyişsə də, məzunlar öz ənənələrinə sadiq qalaraq hər beş ildən bir doğma məktəbə yığışırlar. Axı, həyat davam edir... Tədbir günü onlar parta arxasına kecir, elə bil yenidən uşağa dönür, məktəb illərini təkrar yaşayır, hətta sinifdə zarafatlaşır, dəcəllik edirlər...

Əziz məzunlarımızı növbəti yubileyləri münasibətilə təbrik edir, can sağlığı, uzun ömür arzulayıram. Kollektivimiz sizinlə fəxr edir və hər zaman yolunuzu gözləyir."

**Sevil İbrahimova,**
**10 №-li məktəbin müəllimi**

***

"...Budur, növbəti yubiley ili də gəldi. Hələ bu vaxta kimi heç yanda bu cür tədbirin keçirilməsində orta məktəb məzunları bu rekordu təzələyə bilməyib. Uzun onilliklər ərzində hər beş ildən bir doğma məktəbə yığışıb bir-birləri ilə görüşmək, müəllimləri və məktəb illərini yad edmək hər məzuna nəsib olmur.

1957-ci il məzunlarının ilk yubiley toplantısını yaxşı xatırlaylram. Onda mən 4-cü sinifdə oxuyurdum. Gözəl bir may günü idi. 1977-ci ildə məzunlar məktəbi bitirmələrinin 20 illik yubileyinə toplaşmışdılar. Məktəbdə bayram abhavası var idi. Hamı üçün maraqlı idi. Çünki hələ heç bir buraxılış belə təntənəli tədbir keçirməmişdi. Mənim sevincimsə ikiqat idi. Çünki məzunlardan biri - mənim atam idi.

O günün gözəl bir xatirəsi həm də o oldu ki, yaxşı oxuyan şagirdlərə hədiyyə verdilər, mənə də hədiyyə düşdü: "Şah İsmayıl Xətainin şerləri" kitabını indiyədək gözəl bir xatirə kimi saxlayıram. Sonra 1982-ci ildə 25 illik yubileydə

iştirak etdik. Həmin gün bizim sinfin şagirdləri də söz verdi ki, gələcəkdə belə yubileylər keçirək, belə gözəl ənənəni yaşadaq.

Həqiqətən sonralar belə yubileylər keçirənlər oldu, amma 1957-ci ilin məzunları kimi davamlı keçirə bilmədilər. Elə bizim 1983-cü ilin buraxılışı da. Biz ilk yubileyi keçirdik, amma sonrakı yubileyləri lazımı səviyyədə keçirə bilmədik. Neçə deyərlər atalarımızın başmağını geyindik, amma yerişini yeriyə bilmədik. Həqiqətən onlar ta 1977-ci ildən başlayaraq necə yüksək təşkilatçılıqla davamlı olaraq hər beş ildən bir məktəbə toplaşır, bu təhsil ocağını bitirmələrinin 25, 30 illiyini, daha sonra 40, 45, 50 illik yübileylərini keçirdiblər. İndi isə budur, 2012-ci ildə 55 illik yubileyin keçirilməsi bu nəcib insanlara nəsib oldu. 65 ilin dostları yenə öz doğma məktəblərinə gələcəklər, bir-birlərini bağırlarına basacaq, uzaq 1947-ci ildə olduğ kimi sinif otağına doluşacaqlar.

Əlbəttə, onlar bu yubileydə öz sevimli müəllimlərini tapa bilməyəcəklər, ancaq onları yada salıb ruhlarını şad edəcəklər... Nə etmək olar. Bu, həyatın reallığıdır... Dünyasını dəyişmiş müəllim və məzunlara Allahdan rəhmət diləyir, ruhlarının şad olmasını arzu edirəm. Mən də hamı kimi, yubiley iştirakçılarını növbəti 60 illik yubileydə görmək arzusu ilə dönə-dönə səmimi təbrik edirəm. Onları 55 illik yubiley münasibətilə ürəkdən təbrik edir, onlara can sağlığı, uzun ömür, səadət arzulayıram."

**İlham Emin oğlu İlyasov,**
**10 №-li məktəbin**
**1983-cü il məzunu**



"Yaxşı yadımdadır, 1977-ci il idi. Mən onda səkkizinci sinifdə oxuyurdum. Mayın 9-da səliqəli geyinib gül-çiçəklə məktəbə gəlməyimizi tapşırmışdılar.

Səhər məktəbin həyəti müəllimlər, şagirdlər və tanımadığımız qonaqlarla dolu idi. Hamının üzündə bir təbəssüm, sevinc, fərəh və maraq hiss olunurdu. Nəhayət məktəbin direktoru, mənim anam Zəkiyyə Mehdiyeva qürurla mikrofona yaxınlaşaraq dedi:

- Əziz müəllimlər, şagirdlər, valideynlər! Bu gün bizim kollektivimiz üçün qeyri-adi bir gündür. 1957-ci ildə məktəbimizi qurtaran məzunlar özlərinin 20 illik yubileylərini qeyd etmək üçün bizə qonaq gəlmişlər. Gəlin onları salamlayaq, xoş gəlmisiniz və qədəmləriniz uğurlu olsun deyək.

Sonra o, məzunların məktəb illərindən, təhsildəki müvəffəqiyyət-lərindən, həyatda indiki mövqelərindən söhbət açdı. Qonaqlara gül-çiçək dəstələri təqdim olundu.

Ürəkləri sözlə dolu olan məzunlar öz xatirələrini danışır, həyat vəsiqəsi verən müəllimlərinə minnətdarlıq edir, onları heç vaxt unutmayacaqlarını dönə-dönə bəyan edirdilər.

Öz sevinclərini bölüşmək üçün müəllimlər, şagirdlər bir-bir mikrofona yaxınlaşırdılar. Onların arasında məzunlara rəsmxətdən dərs deyən atam Şahid Cabbarzadə də var idi.

Həmin gün əsası qoyulan və hər beş ildən bir təkrar olunan bu həyəcanlı anlar heç də məktəbdəki mərasimlə başa çatmır. Onlar doğma məktəblə, qayğıkeş müəllimlərlə görüşdən sonra vəfat etmiş müəllimlərinin, sinif yoldaşlarının məzarlarını, Böyük Vətən Müharibəsində həlak olmuş həmyerlilərimizin xatirə kompleksini

və Qarabağ şəhidlərinin dəfn olunduğu Fəxri xiyabanı da ziyarət edir, qəbirləri üstünə gül-çiçək qoymaqla ruhlarını şad edirlər.

Hər gəlişləri zamanı məktəbə, onun kollektivinə göstərdikləri maddi və mənəvi dəstəklə bərabər, həm də dünyasını dəyişmiş sinif yoldaşlarının, müəllimlərin, məktəbimizdən Qarabağ döyüşlərində şəhid olanların ailələrinə yardımlar edir, onlara dayaq olmağa çalışırlar.

Onların hər zaman dostları ilə əlaqə saxlaması, xeyirdə, şərdə bir-birinə arxa-dayaq olması ictimaiyyət üçün bir nümunədir.



Hələ ilk görüşdən məzunların doğma elm ocağına ürəkdən bağlılıqları, qayğıkeş müəllimlərə olan məhəbbətləri mənim də ürəyimdəki arzuları alovlandırdı. Bu məktəbdə dərs deyən ata və anamın sənətini davam etdirmək qərarına gəldim. Müəllim oldum. Qızım Xəyalə də bu sənəti seçdi. İndi hər ikimiz 10 saylı məktəbdə riyaziyyat fənnini tədris edirik.

Xalq üçün yararlı, savadlı, yüksək əqidəli, geniş dünyagörüşlü gələcəyin kadrlarını yetişdirmək, təlim, tərbiyə və təhsilimizi günün tələbləri səviyyəsində qurmaq, Sizin müəllimlərinizin yolunu davam etdirməklə yaddaşlarda yaşamağa çalışacağıq".

***Yeganə Cabbarzadə,***
***10 №-li məktəbin təlim-tərbiyə işləri üzrə direktor müavini***

***

"...9 may 1997-ci il. O gün məktəbimizdə xüsusi bir canlanma vardı. Üzlərdə xoş təbəssüm, dodaqlarda gülüş hiss olunurdu. Hər tərəf məzunlara həsr edilmiş şüarlar, plakatlar, şarjlarla bəzədilmişdi.

Məktəbin şagirdləri, müəllimləri məzunları xoş sözlə, şeirlə, nəğmə ilə təbrik edir, onlara gül-çiçək dəstələri bağışlayırdılar.

Söz qonaqlara veriləndə hamının diqqəti onların üzərində cəmləşdi. Bu insanların çoxunun saçı belə ağarmışdı. Amma özlərini həmin gün bir şagird kimi hiss edirdilər.

Baxışları ilə xəyalən əvvəlki illərə qayıdır, oxuduqları doğma məktəblə, müəllimlərlə bağlı xatirələrini söyləyirdilər. Dünyasını dəyişənlərə rəhmət oxuyur, sağ olanlarla deyib gülür,ötən illəri yada salırdılar. Bu xatirələrdə bir ülvilik, doğmalıq, müəllimə hörmət, sinif yoldaşlarına, təhsil ocağına məhəbbət, elə-obaya sevgi və istək duyulurdu.

Onlar yaşa dolmalarına baxmayaraq doğma məktəblərinə bir ziyarətgah kimi baxırdılar. Hər gəlişləriylə bir xeyriyyəçi kimi hərəkət edir, doğma Şəkiləri, məktəbləri üçün nə isə bir xeyirxah iş görmək, yaxşı bir nişanə qoymağa çalışırlar.



«Ataların yolu oğulların yoludur» demiş dahilərimiz. Bax, məzunluğunu qeyd edən bu insanların həyat yolu da belədir. Onların qədirbilənliyi, bir-birilərinə qarşı mehribanlığı, dostluqda səmimiyyəti, təhsil ocağını unutmamaları bu günkü müəllimlər, məzunlar və şagirdlərimiz üçün bir örnəkdir, vətənpərvərlik dərsidir".

***Möhübbət İbrahimova,***
***10 №-li məktəbin müəllimi***

# DOST SÖZÜ



*Qəm yemə, qəm əhlinin imdadına canan yetər,*
*Dosta yardım bərk ayaqda mehriban dostdan yetər.*
**Nizami Gəncəvi**

Hər bir xalqın tarixində onun qəhrəmanlıq ruhunu, milli-mənəvi dəyərlərini, istək və arzularını, sevinc və kədərini əks etdirən bir çox tədbirlər və mərasimlər mövcuddur. Belə tədbirlərdən biri də yubileylərin qeyd edilməsidir. Belə tədbirlərdə insanlar öz istək və arzularını ifadə edir, ötən dövrdə baş vermiş hadisələrlə əlaqədar müəyyən sevinc və bəzən də kədər hissi keçirir. Bu cür tədbirlər milli mənəvi dəyərlərimizin qorunmasında mühüm rol oynayır.

1977-ci ildən başlayaraq Şəki şəhərindəki 10 saylı məktəbin 1957-ci il məzunlarının hər 5 ildən bir qeyd etdikləri yubiley mərasimləri də belə nümunəvi tədbirlərdəndir. Məzunlar bu tədbirləri o dərəcədə məharətlə təşkil edib keçirirlər ki, ümumi şəhər miqyasında bir hadisəyə çevrilir, uzun müddət yaddaşlardan silinmir.

Mən ilk dəfə 1987-ci ildə uzun illər ailəvi dostluq etdiyim Abid Şərifovun dəvəti ilə məzunların 30 illik yubiley tədbirlərinə bir qonaq kimi qatılmışam və bundan sonrakı bütün tədbirlərdə iştirak etmişəm. Qeyd edim ki, yubiley tədbirləri bir-birindən maraqlı və ibrətamiz mərhələlərdən ibarət olur.



...Tədbirin ilkin mərhələsində məzunlar özləri üçün müqəddəs məbədgah saydıqları məktəbə gəlir, məktəbin həyatında şagird və müəllim kollektivi ilə geniş tərkibdə görüş keçirilir. Görüşdə məzunlarla yanaşı müəllimlər, əlaçı şagirdlər, valideynlər çıxış edir, xatirələrini danışırlar. Məzunlar 1-ci sinif şagirdlərinə dərsliklərlə, məktəb ləvazimatı ilə dolu məktəbli çantası hədiyyə edirlər. Buradaca 11-ci sinif şagirdləri məktəb zəngi ilə estafeti birincilərə verirlər. İdmançı uşaqlar nümunəvi çıxışlar edir, özfəaliyyət üzvləri mahnı oxuyur, şer söyləyirlər.

Bu kövrək anlardan sonra məzunlar bir vaxt dərs keçdikləri 22 saylı sinif otağında bir "dərs saatı" keçirirlər. Onlara dərs demiş müəllimlərdən biri məzunların adları yazılmış sinif jurnalında qeydiyyat aparır. İştirak edən məzunlar bir-bir qalxıb özü, ailəsi və iş yeri haqqında qısa məlumat verir. Dünyasını dəyişmiş məzunlar isə bir dəqiqəlik sükutla yad edilir. Məzunlara həm sevinc, həm də müəyyən kədər hissi gətirən bu anlarda onlar sanki keçmiş günlərə qayıdırlar.

Onu da deyim ki, tədbirdən qabaq məzunların öz vəsaitləri hesabına məktəbin damını, sinif otaqlarını, laboratoriyaları təmir etdirmələri, ehtiyacı olan müəllimlərə, şəhid ailələrinə maddi yardım etmələri xeyirxahlığın və humanistliyin yüksək nümunəsidir. Milli mənəvi dəyərlərimizə, adət-ənənələrimizə böyük hörmət edən, onların qorunub saxlanmasına səy göstərən məzunlar şagird və müəllimlərlə görüşdən sonra dünyasını dəyişmiş müəllimlərinin, yoldaşlarının, eləcə də valideynlərinin məzarlarını ziyarət edir, ruhlarına dua oxudururlar.

Oradan şəhidlər xiyabanına gedib Qarabağ uğrunda şəhid olan həmyerlilərini yad edir, onların da məzarına gül dəstələri qoyurlar. Həmçinin 1941-1945-ci illərdə həlak olmuş həmyerlilərinin xatirəsinə ucaldılmış abidəni ziyarət edirlər.

Rəsmi proqramda nəzərdə tutulan bütün mərhələlər başa çatdıqdan sonra tədbir Şəkinin ləziz təamları ilə bəzədilmiş ziyafət süfrəsi arxasında davam etdirilir. Bu ziyafətə məzunlarla yanaşı, məktəbin rəhbərliyi, məzunların həyatda olan müəllimləri və şəhid ailələri də dəvət edilir...

İlk dəfə iştirak etdiyim 30 illik yubiley tədbirinin yüksək səviyyəli təşkili, proqramın zənginliyi və görüləcək işlərin layiqli şəkildə yerinə yetirilməsi məni valeh etmişdi. Məzunların məktəbə, müəllimlərə, gənc nəsilə, doğma Şəkiyə səmimi münasibət, həssas qayğı məndə bu dostlara qarşı böyük hörmət və məhəbbət oyatdı. 30 illik yubiley zamanı səfalı "Soyuqbulaq"da təşkil olunmuş ziyafət unudulmaz bir tədbir idi. Ziyafəti idarə edən məktəbin o zamankı direktoru Hüseyin müəllim çıxış üçün bir neçə məzuna söz verdikdən sonra, qonaqlardan da ilk sözü mənə verdi.



Məni bu gözəl tədbirə dəvət etdiklərinə görə məzunlara təşəkkürümü bildirib, tədbirin gedişi, mahiyyəti, əhəmiyyəti barədə öz fikirlərimi söylədim. Arzu etdim ki, biri-birinə bacı-qardaş kimi mehriban, səmimi və əziz olan bu insanlar gün gəlsin, öz 55 illik yubileylərini də sağ-salamat, dəstələrindən itki vermədən qeyd etsinlər. Elə o münasibətlə də yığışıb –

Məslici edək arəstə,<br>
Açaq Soyuqbulaq üstə.<br>
Təsnif, muğam, şur, şikəstə<br>
Bəzəsin buranı gəlsin...

Beləcə çıxışımı poetik ifadələrlə davam etdirib arzumu bildirdim, dedim kaş o yubiley məclisinə Habilin kamanı gəlsin, "Kəsmə şikəstə" deməyə Fatma xanım gəlsin, Qarabağın gözəl səsli Qədirini, Arifini də unutmayaq, Şövkət xanımın səsi orda eşidilsin.



O məclisə Təbriz deyib sızlayan ürəyimizi Rübabə xanımın səsi ovutsun, xanəndə Zeynəb "Şur" ilə ötsün və kaş Yaqub da ora doğma Şuşamızdan durub gəlsin... Gözəl Şuşadan, bizim Şuşadan gəlsinlər, çal-çağır, nəğmə-nəğməyə qarışsın, sevinc-sevincə qarışsın, desinlər hörmətli, əziz və mehriban məzunlar, yubileyiniz mübarək, 100 yaşayın, tanrı sizi qorusun! Amin!



...Mən bu məzmunda nitqimi bitirib əyləşəndən sonra ədəbiyyatçı, şeir-sənət vurğunu, söz xiridarı olan Hüseyin müəllim mehribancasına üzünü mənə tutub dedi: "Haralısan, a bala?" Mən isə zarafatyana, məclisin ahənginə uyğun şəkildə dedim, - "Ay müəllim, adam haralı olar?! Əlbəttə Şəkiliyəm"! Gurultulu alqış qopdu. Şaqraq bir gülüşlə qarşılanan bu zarafatdan sonra məclis yekdilliklə məni "fəxri Şəkililiyə" qəbul edib mənə "Şəkili

Nüsrət" adı verdilər. Bu günə kimi də çox böyük hörmət və məhəbbətlə bu adı daşıyır, bu adla fəxr edir və hər bir hərəkətimlə bu adı doğrultmağa çalışıram.

...50 illik yubiley də mənim üçün çox əziz və unudulmaz oldu. Əvvəla, yubiley tədbiri digərlərindən özəlliyi, iştirakçıların sayı və həyata keçirdikləri xeyriyyə tədbirləri ilə xeyli fərqlənirdi. Məzunlar öz həyat yoldaşları və bəziləri nəvələri ilə iştirak edirdilər. Digər tərəfdən mənim 30 illik yubiley tədbiri zamanı arzuladığım gün gəlmişdi və sevindirici hal idi ki, mən şeirlə ziyafət məclisinin cənnət məkan olan "Soyuqbulaq"da açılmasını arzu etmişdim, məclis də indi orada qurulmuşdu...



Dostların fəaliyyəti təkcə hər 5 ildən bir qeyd etdikləri belə yubiley tədbirləri ilə bitmir. Onlar övladlarının toyunda, öz ad günlərində də bir yerdə olurlar. Maraqlıdır ki, 1939-cu ildə dünyaya gələn Nadir Həmidov "Unudulmaz illər" kitabında doğulduğu günü göstərmədiyi üçün dostlar zarafata salıb bir ildə 3 dəfə ona 50 illik yubiley qeyd etdirdilər. 1990-cı ilin yanvar ayının 6-da Abid Şərifov 50 illik yubileyini qeyd edəndə o qədər qar yağmışdı ki, yollar buz bağlamış, gediş-gəliş çətinləşmişdi. Buna baxmayaraq dostlar bir nəfər kimi ailəlikcə məclisə gəlib, iştirak etdilər. Məclis bitəndə isə Bakının ucqar yerlərində yaşayanlar (mən də o cümlədən), hərbi "BTR" maşını ilə evə yola salındılar...

1940-cı ilin 15-i iyununda bu gözəl dünyamıza təşrif gətirmiş Nadir Əhmədovun yubileylərində sevinc-sevincə qarışır. Dostlar həm Nadir müəllimin ad gününü, həm də xalqımızın son illər bayram etdiyi sevimli Qurtuluş gününü qeyd edirlər.

Övladların toy şənliklərində onlar o qədər sevinc və fərəhlə iştirak edirlər, bu ahıl yaşlarında elə Şəki yallısı gedirlər ki, adam valeh olur.

Məzunların istər Şəkidə yaşayanları, istərsə də Bakıda yaşayanların əksəriyyəti Şəki şəhəri miqyasında görülən tədbirlərdən və həyata keçirilən layihələrdən heç vaxt kənarda qalmırlar. Şəkinin abadlaşdırılmasında, su təchizatı sisteminin çəkilişində və rekonstruksiyasında, böyük şairimiz Bəxtiyar Vahabzadənin büstünün açılışında, onun anım mərasiminin təşkilində, M.F.Axundzadənin ev muzeyinin bərpasında, selin uçurtduğu körpülərin bərpasında, eləcə də yeni körpülərin salınmasında hər biri iştirak edir, öz xidmətini göstərir. Xüsusən, Abid Şərifovun bu sahədəki fəaliyyəti böyük minnətdarlığa və alqışa layiqdir. Məzunlar istər ayrılıqda, istərsə də ümumilikdə hansı tədbirə qatılırlarsa, o tədbir təşkilati cəhətdən çox yüksək səviyyədə və layiqli şəkildə həyata keçirilir.

Hərdən öz-özümə sual verirəm, görəsən bunun səbəbi nədir. Səmimiyyət, sədaqət və məhəbbətdən başqa cavab tapa bilmirəm. Doğurdan da dostlar gördükləri bütün işləri ən səmimi şəkildə, çox böyük istək və təmiz məhəbbətlə icra edirlər. Məhz buna görə də keçirdikləri bütün tədbirlər həm möhtəşəm, həm də yaddaqalan olur.

Məzunların keçirdiyi bütün tədbirlər və görüşlər istər müasir insanların, istərsə də gələcək nəsilin nümayəndələrinin tərbiyəsinə ciddi təsir göstərir, elmə-təhsilə, məktəbə, doğma yurda olan münasibətin inkişafına təkan verir. İnanıram ki, məzunların gözəl ənənəsi heç vaxt unudulmayacaq, bir örnək kimi nəsildən-nəsilə keçərək daim yaşayacaqdır.

Eşq olsun bu misilsiz məzunlara!

Yaşasın bu ənənəni yaşadanlar!



***Nüsrət Əliyev,***<br>
***Memarlıq və İnşaat Universitetinin***<br>
***dosenti, fəlsəfə doktoru***





Əziz oxucular, beləliklə biz sizə gözəl Şəkidən, Şəkinin gözəl insanlarından və bu insanların dünyaya gətirdiyi gözəlliklərdən, yaradıb-yaşatdığı dəyərli adət-ənənələrdən danışdıq. Ancaq razılaşaq ki, Şəki və şəkililərdən söz düşəndə bu diyarın duzlu-məzəli ruhunu, Lütvəli Abdullayev, İsmayıl Osmanlı, Sabit Rəhman kimi məşhur gülüş ustalarını və bir də, əlbəttə ki, bənzərsiz Şəki lətifələrini xatırlamadan keçinmək olmaz. Odur ki...

## BİR NEÇƏ ŞƏKİ LƏTİFƏSİ

Dostu Hacı dayının yanına gəlib məsləhət istəyir:

-Ay canoo yiyim, Hacı, maa yol göstər. İdarədə bir qol saatı, bir də üç yüz manat pul verib təqaüdə göndərmək istiyillər. Habı şeyləri götürüb irazılaşım, yoxsa razılaşmayım. Bilmirəm...

Hacı dayı onu bir altdan yuxarı süzüb deyir:

-İrazılaşma!

-Niyə, a başaa dönüm, holarıı əldən çıxardm?

-Səən canoo yeyim, ağloo başaa yığ, get onnardan bi motosklet, üstündə də 5-6 min manat pul istə! Ə, elə zülüm-sən ki, səni başdarnna eləməkdən ötrü mütləq vericəhlər, başqa əlacları yoxdu...

***

Bir gün üzmək bacarmayan biri xamlıq edib dənizin ortasınacan gedir. Orda başlayr batmağa. Bunu görüb qorxusundan qışqırır:

- Kömək edin! Spasayte! SOS!

Beləcə bildiyi bütün dillərdə qışqırb köməyə çağırır.

Sahildən bunu görən bir şəkili ucadan deyinir:

- Ə, bala, nə həşir salmısan, dörd-beş dil öyrənincə, bircə dənə üzmək öyrənəydin da!

Hər gün hava haqqında məlumat verən Şəki radio qovşağı bir gün belə bir "dəqiq" proqnoz yayır:

"Diqqət, diqqət! Ha bu gün axşamüstü bəlkə yağış yağdı, ay camaat, hazır olun."

***



Bir şəkili cavan oğlan əsgərliyini çəkib qurtarır. Evə getmək ərəfəsində anasına məktub yazır, deyir gözləyin, bəs gəlirəm, özüm də bir "nemka" almışam...

Anası cavab yazıb deyir ki, səən şümal boyua qurban, evə əliboş gəlmə, o aldığunnan yarayanı olsa ha birini də dədaaa al gətir.

***

Bir gün Şəkiyə xaricdən həkimlər gəlir. Xaricilər deyir:

- Qəribədir, xəstəni mədədən müalicə edirik, böyrəkdən ölür. Böyrəkdən müalicə edirik, ürəkdən gedir...

Şəkili həkim onlara deyir:

- Ə, siz dalda qalmusuz. Biz xəstəni nədən müalicə ediriksə, elə onnan da ölür.

***

Bir şəkilidən oğlu soruşur:

-Ata, dilimizə niyə ana dili deyirlər?

-Ay bala, bə nə desinlər? - Ata cavab verir. – Görmürsən evdə ən çox danışan kimdir ?

***

Hacı dayı pul qazanmaq üçün çox peşəni sınaqdan keçirir. Nəhayət, bərbər olmaq fikrinə düşür və qonşu rayonlardan birində "fəaliyyətə" başlayır. İlk müştərinin üzünü sabunlaya-sabunlaya bir-iki məzəli Şəki lətifəsi danışıb, ülgücü müştərinin üzünə elə çəkir ki, elə bil oraqla arpa biçirdi. Qəflətən qulağının dibində bərk ağrı hiss edən müştəri dik atılaraq deyir:

-Usta, bir az yavaş, sonra qulağımı kəsərsən!

Hacı dayı özünü itirmədən əlindəki təzəcə kəsdiyi qulağı müştəriyə göstərib laqeyd-laqeyd soruşur:

-Ha bunu deyirsən?!

***

Cibində bir manat pulu olan Abdulcabbar çox fikirləşəndən sonra avtobusa minib Suçmaya yola düşür. Suçmada restoran işçiləri Abdulcabbarı sevinclə qarşılayıb stol arxasına dəvət edirlər.

-Xoş gəlmisən, ay Abdulcabbar. Ürəyin nə istəyir?

-Əvvəlcə bir piti gətirin...



Abdulcabbar pitini yeyib bığlarını siləndən sonra iki şiş kabab sifariş verir. Yeyə-yeyə restoran işçilərini məzəli zarafatları ilə xeyli güldürür. Nəhayət, bir-iki stəkan da çay içəndən sonra qalxıb yola düzəlir.

Ofisiant onun dalınca:

-Ay Abdulcabbar, yeyib-içdiklərinin pulunu verməmiş hara gedirsən? – soruşur.

Abdulcabbar halını pozmadan deyir

-Ay pir olmuş, pulum olseydi Şəkidən bura niyə gəlirdim ki? Elə oradaca yiyif-içərdim da!

***

Kök bir qadın arıqlamaq üçün kurorta getməyə hazırlaşır. Qohumlarından biri məsləhət görür ki, əvvəlcə oğlunu evləndir, gəlin gətir, sonra kurorta get.

Kök qadın qohumunun bu məsləhətinə qulaq asır, oğlunu evləndirir...

Aradan bir neçə ay keçəndən sonra qohumu kök qadından soruşur:

-Kurorta getdinmi, yaman arıqlamısan?

Kök qadın dərindən köksünü ötürərək cavab verir:

-Yox, kurorta gedə bilmədim, kurort bizə gəldi.



***

Qonşu rayonlardan birisi Şəki bazarına xiyar gətirir. Zarafatcıl şəkili satıcıya yaxınlaşıb soruşur:

-Ə, qardaşoğlu, habı yerpənəy neçiyədi?

-Mini min manat.

Şəkili ucadan deyir:

-Paho, min manata xiyar olar? Mini min manata çox baha deyirsən, sən gəl birini bir manatdan ver, hamısını götürüm.

***

Bərbərin ülgücü çox küt olduğundan Cumay kişiyə yaman əziyyət verir. Özü də bunu bildiyindən arada müştərinin könlünü almaq üçün onu söhbətə tutur:

-Qardaşın var?

-Bəli, var! – Cumay kişi ağrıdan gözləri yaşara-yaşara cavab verir.

-Neçə qardaşsınız?

-Sənin əlindən salamat qurtarsam, inşallah, iki qardaş oluruq.

***

Bir gün Abdulcabbar sərxoş olub yolun ortasında uzanır. Bunu görən sahə müvəkkili yaxınlaşıb onu qaldırır və əmr edir:

-Vətəndaş, asayişi pozduğunuza görə cərimələnəcəksiniz, gedək idarədə danışarıq. Arxamca, düz "otdeleniyaya"!

Abdulcabbar kəkələyə-kəkələyə deyir:

-Qəribə adamsan e, gedə bilsəm elə öz evimə gedərəm də, sizin idarədə nə işim var?






## SON SÖZ YERİNƏ

*Şəki ş. 10 saylı məktəbin 1957-ci il məzunu*
*Nadir Əhmədovun gənclərə müraciəti*

Əziz dostlar!
Dost nədir?
Dost yoldaşlıqdan sonra gələn mərhələdir, insanların arasında olan ən yaxşı münasibətdir, yaxınlıqdır, arxadaşlıqdır.



Dost necə olmalıdır?:

Düz danışan, insanpərvər, xeyirxah, təvəzökar, dostunun fikrini dinləyən, mehriban, səmimi, sədaqətli, müttəfiq və s. Sözsüz ki bu münasibət qarşılıqlı olmalıdır.

Mübahisəsiz demək olar ki, "dost", "dostluq" dünyada insanlarla eyni vaxtda yaranmışdır.

Dost sözündəki hərflərə baxaq:

D-dəmir

O-od

S-su

T-torpaq

Məncə bunlar nəsə deyir! Dəmir, od, su, torpaq kainatın əsasını təşkil edir, həm də onlarsız həyat, yaşayış olmaz. Başqa sözlə zülal həyatın əsası olduğu kimi , dost yaşamağın əsas amillərindən biridir.

Dostluq yeni bir səmərəli, münbit mühüt yaradır, o da öz növbəsində dostlar arasında arxadaşlığı, yaxınlığı, əlbirliyi, müttəfiqliyi gücləndirir, beləliklə cəmiyyətə aparıcı təsirə malik bir qüvvə yaranır, bu da ətrafındakılara xeyirxahlıq gətirir, yeni nəsilə nümunə göstərir.

1082-83 illərdə yazılmış Qabusnamə kitabının 28-ci fəslinin 122-ci səhifəsində dostluq haqqında oxuyuruq:

"- İnsan nə qədər sağdır, onun dosta ehtiyacı var.

- yaxşı dost böyük xəzinədir.

- dostu çox olanın eyibləri örtülər, ləyaqətləri meydana çıxar..."

Əmir Teymur vəsiyyətlərindən birində deyir: "Şücaətli adamlarla dostluq edin, çünki Allah-Təalanın özü də bu cür adamları dost seçibdir."



Atalar Sözü: "Hər şeyin təzəsi, dostun köhnəsi",

"Örtülü bazar, dostluğu pozar".

Dostlarımızda öz təsdiqini tapmış, həyat normasına çevrilmiş ağsaqqala, ağbirçəyə və ailəyə olan sevgi, istək gənclər üçün örnək, nümunə ola bilər.

Biz bu dünyaya öz şəxsi arzumuzla gəlib-getmirik. Amma dostu özümüz seçirik. Biz həyata Allah-Təalanın

köməyi və valideynlərimizin sonsuz sevgisi nəticəsində gəlmişik.

Deməli sağlam düşüncəyə görə, övlad (öz səbəbinə) hörmət etməli və onların borcunu qaytararaq yaşamalıdır. Övlad heç vaxt ata və ana haqqını unutmaz. Belə bir kəlam var: - Öz övladının sənə qarşı necə olmasını arzulayırsansa, sən öz ata və anana qarşı elə ol.

Şərq dünyasında Ana müqəddəs olub və bu ənənə həmişə davam edəcəkdir. Məhəmməd Peyğəmbərin buyurduğu kimi: "Cənnət anaların ayaqları altındadır."



İnsan öz ailəsini sevməlidir. Ailə də dostluğun təməli üstündə qurulur. Hamı ağsaqqal və ağbirçəklərlə hörmət və mərifətlə rəftar etməlidir ki, bu da Allahın əmridir.

Biz həyatda həmişə çalışmışıq ki, rəhmətlik ata və analarımızın ünvanına Allahdan rəhmət dilənsin və onların ruhu qarşısında üzü ağ olaq...

Bəzən mən özüm-özümə nadir suallardan birini verirəm: - Biz kimik (nəyik)? Öz-özümə də cavab verirəm ki, biz heç kəsdən fərqlənən adam deyilik. Amma qəribə burasıdır ki, özgələri bizim aramızdakı münasibətlərə nə isə təəccüblə baxırlar. Söz yox ki, bununla hesablaşmaq, razılaşmaq olar, bunu bəlkə də bizim birliyimizin, dostluğumuzun, səmimiliyimizin nəticəsi kimi qəbul etmək olar.

Bizim həyatda həmişə dostluğa, mehribançılığa, ədalətə, dövlətçiliyimizə, qarşılıqlı etimada və s. sevgi, istəyimiz olmuş və bu yolda nəyəsə nail ola bilmişik.

Amma özünü tənqid naminə demək istəyirəm ki, biz daha çox səmərəli, xoş olan işlər görə bilərdik, ancaq onu da deməliyəm ki, etdiklərimizə görə kiminsə yanında dilimiz gödək, gözlərimiz kölgəli deyil. Xüsusi qeyd edim ki, bunların hamısını çətin və gərgin əməyin nəticəsində əldə etmişik.

Gənclərimizə nə arzu edirəm: hamıya sağlamlıq, xəstəliksiz qocalmaq, ənənəvi adət normalarını gözləmək, yaxşı həyat tərzi sürmək. Allah qoy gündüzlərimizi xeyirli etsin, qoy pis işlər bizdən uzaq olsun, dünyada sülh olsun, Qarabağımızı tezliklə azad edək, azadlıq olsun, nəvələr xoşbəxt yaşasın, xalqımızın rifah halı gün-gündən yaxşılaşsın. Heç kimə pislik etməyin.



Gənc dost bu kitabı diqqətlə oxu! Bəlkə, gələcək həyatın üçün, özünün şəxsiyyət kimi yetişməyin üçün buradan nələrsə götürə bilərsən və burada oxuduqlarının gələcək taleyinə müsbət təsiri olar. Mən buna əminəm.

***Nadir Əhmədov***

**Kitabın hazırlanmasında Şəki ş. 10 N-li orta məktəbin 1957-ci il məzunlarının canlı xatirə, məsləhət və tövsiyələrindən, həmçinin R.Bəşirov və N. Hacıyevin "Unudulmaz illər", N.Əhmədovun "Nəvələrə nəsihət" və Ə.Metenin "O torpağın övladları" kitablarından istifadə olunmuşdur. (Tərtibçidən)**



## MÜNDƏRİCAT

